# ALLAHA DOĞRU

## (ƏXLAQ DƏRSLƏRİ)

MÜƏLLİF:
USTAD MİSBAH YƏZDİ



TƏRCÜMƏ EDƏN:
MƏHƏMMƏD AZƏRİ

# Mündəricat

Ey arxayın olan kəs! Dön Rəbbinə! Sən Ondan, O da səndən razı olan halda. Daxil ol“ (bəndələrimin zümrəsinə! Daxil ol Behiştimə!”(١)

Varlıq aləmində ən qəribə və ən maraqlı dastan «İnsan dastanı»dır. Allah-taala insana elə bir iste’dad əta edib ki, bunun vasitəsi ilə insan Allahın xəlifəsi və mələklərin məscudu olmaq məqamına yüksələ bilər. Allahın insanı «ən gözəl surətdə»(٢) yaratması və onun başına «kəramət tacı»(٣) qoyması Yaradan tərəfindən insana əta olunan ən .böyük şərafətdir

Təkamül yolunda insan Allah-təlaya yaxın məqama ucala bilir və Allah ona “ey arxayın olan kəs” deyə xitab edərək cənnət qapılarını onun üzünə açır. Amma həmin bu ali xilqət bə`zən süqut edərək ən alçaq varlığa çevrilir. O, bə`zən heyvan, hətta heyvandan da alçaq məqama enərək elə bir fəlakətə düçar olur ki, onun haqqında buyurulur: “Allah yanında yer üzündəki canlıların ən pisi düşünməyən karlar və (lallardır.”(۴

Bəs həmin yüksəliş və süqutun sirri nədir? Necə olur ki vahid bir mövcud bir-birinə zidd olan iki yol ayrıcında dayanır? İnsanlıq pöhrəsini çiçəkləndirən, eyni zamanda yandırıb külə döndərən nədir? Əlinizdəki kitabda yuxarıdakı suallara cavab verməyə sə`y göstərilmişdir. Bu kitab fəzilət sahibi, fəqih tanınmış filosof həzrət Ayətullah Məhəmməd Təqi Misbah Yəzdinin əxlaq dərslərinin məcmusudur. Belə bir kitabın tərtibində bizə yardım göstərdiyi üçün Allaha şükr edirik. Bu işdə Məhəmməd Mehdi Nadirinin xüsusi fəaliyyəti olub. Bu kitabı çap etməklə kiçik də olsa İslama xidmət .göstərib savab qazanacağımıza ümid edirik

.Naşir



---

١- [١] “Fəcr” surəsi, ayə: ٢٧-٣٠.

٢- [٢] «Biz insanı ən gözəl surətdə yaratdıq». «Tin» surəsi, ayə: ۶.

٣- [٣] «Biz Adəm övladını kəramətli etdik». «İsra» surəsi, ayə: ٧٠.

۴- [۴] “Ənfal” surəsi, ayə: ٢٢

## BİRİNCİ DƏRS

## Təzkiyə (Paklanma) ANLAYIŞI VƏ ONUN ƏHƏMİYYƏTİ

### PEYĞƏMBƏRLƏRİN İKİ ƏSAS HƏDƏFİ

Qur`ani-kərimdə peyğəmbərlərin göndəril-məsində əsas məqsədin insanların tə`lim və təzkiyəsi olduğu bildirilir. Bə`zi ayələrdə təzkiyə, bə`zilərində isə tə`lim birinci qeyd olunur.(١) Bu iki söz, yə`ni "tə`lim və təzkiyə" dilimizə "tə`lim və tərbiyə" kimi də tərcümə oluna bilər. Başqa sözlə, "təzkiyə" dedikdə "tərbiyə" nəzərdə tutulur. İnsan bu tə`lim və tərbiyəyə dini maarifə yiyələnmədən və ya peyğəmbərlərin köməyi olmadan nail ola bilməz. Elə elmlər var ki onlar insanın xoşbəxtliyində birbaşa rol oynamır. .Amma dini elmlərdən xəbərsizlik insanı əbədi axirət səadətindən məhrum edir

:Peyğəmbərlərin göndərilməsinin iki əsas məqsədi var

.Dini maarifin tə`limi .١

.İnsanların tərbiyəsi .٢

Bu iki iş əvvəl peyğəmbərlərin, sonra isə onla-rın vəsilərinin (canişinlərinin) öhdəsindədir. İslam peyğəmbərinin vəsiləri olan mə`sum imamlardan sonra bu vəzifə .Əhli-beyt alimlə-rinin çiyninə düşür

Tərbiyə o qədər geniş sahəni əhatə edir ki, hətta bədən tərbiyəsi də bu sahəyə aid olunur. Amma peyğəmbərlərin əsl vəzifəsi insanların mə`nəvi tərbiyəsi, yə`ni təkamül .yolunda olnları Allaha yaxın məqama çatdırmaqdan ibarətdir

### ALİMLƏRİN ROLU

Qədim dövrlərdə insan fikri və əməli çaşqınlıqdan qurtarmaq üçün qısa bir müddət dini maariflə tanış olmaqla, məqsədinə çata bilərdi. Amma bu günkü qatışıq dünyada kamilləşmək üçün müxtəsər dini bilik



---

Ali-İmran", ۱۶۴; "Bəqərə", ۱۲۹" [۵]-۱

kifayət etmir. Elə bir əsrdə yaşayırıq ki, bütün ömrümüzü dini məsələlərin tə`liminə sərf etsək də xoşbəxtliyimizi tə`min edəcək dərəcədə maarif-lənməyimiz müşkül .məsələdir

Bu gün dünyəvi elmlər inkişaf etdiyi kimi, dini elmlər də tərəqqi etmişdir. Bir neçə yüz il əvvəl insan üç il, beş il dərs oxumaqla bütün elmləri öyrənə bilərdi. Farabi, İbn Sina kimi dünya şöhrətli alimlər öz dövrlərinin bütün elmlərini qısa bir müddətdə əxz etmişlər. Amma bu gün bir elm sahəsinə yiyələnmək üçün on illərlə dərs oxuyan insan .yenə də həmin sahəni əhatə edə bilmir

Dini elmlər də olduqca genişlənib. Bu gün dini maarifdə elə sahələr yaranıb ki, həmin sahələrdə mütəxəssis olmaq üçün on illərlə oxumaq kifayət etmir. Məsələn, fiqh və üsul elmlərində ictihad dərəcəsinə çatıb nəzər sahibi olmaq üçün bir neçə on il oxumaq .lazım gəlir

Yaşadığımız dövrdə bəşəriyyət elmdən daha çox tərbiyəyə ehtiyaclıdır. İstər şərq, istərsə də qərb alimləri bu fikirdədirlər ki, insanlar mə`nəviyyat böhranından daha çox .əziyyət çəkirlər

Cümə” surəsinin ikinci ayəsində buyurulur: “Odur ki, savadsızlara onların öz arasından“ peyğəmbər seçdi ki, Allahın ayələrini onlara oxusun, onları paklığa çıxartsın və kitab və hikməti onlara öyrətsin.” Peyğəmbərlər və onların vəsiləri bu vəzifələri həyata keçirmək üçün misilsiz əziyyətlərə dözmüşlər. Bu silsilənin sonuncu nümayəndələri .İslam Peyğəmbəri və mə`sum İmamlardır

Lakin bu gün peyğəmbər və imamların olmaması insanların tə`lim və tərbiyəsinin başsız qalması demək deyil. Rəvayətlərdən mə`lum olur ki, bu məs`uliyyət din alimlərinin üzərinə düşür. İslam Peyğəmbəri (s) buyurur: “Allahın rəhməti olsun mənim canişinlərim olan o kəslərə ki, mənim sünnətimi (qayda-qanunlarımı) diri saxlayıb onu ”.Allahın bəndələrinə öyrədirlər

Tərbiyə dini tə`limə əsaslanmalı olduğundan bu iş də din alimlərinin üzərinə düşür. Bundan əlavə peyğəmbər sünnəti təkcə tə`limdən yox, eyni zamanda tərbiyədən də .ibarətdir

Peyğəmbərin tə`lim və tərbiyə arasında sərhəd qoymaması bir daha təsdiq edir ki, .tə`lim və tərbiyəni bir-birindən ayırmaq olmaz

## TƏHSİL MƏRKƏZLƏRİNDƏ TƏRBİYƏNİN ROLU

Elmi mərkəzlərdə tə`lim və tərbiyəyə paralel diqqət göstərilməlidir. Təəssüf ki, bə`zən müəyyən islam elminə üstünlük verildiyi halda başqa bir islam elmi kölgədə qalır. Lazımi diqqət göstərilməyən ən mühüm sahə əxlaq və mə`nəviyyat sahəsidir. Dini elm mərkəzlərində (hövzələrdə) tərbiyə, təzkiyə məsələsi ən ağrılı məsələdir. Hələ .də bu problem öz həllini tapmamışdır

Bu problemi doğuran səbəblərdən biri ilahi əxlaqa yiyələnmiş arif alimlərin həddi aşan təvazökarlığıdır. Dini mərkəzlərdə bu insan-ların nəfəsinə ehtiyac olduğu halda onlar başqalarına əxlaq dərsi keçməyə özlərini layiq bilmirlər. Bu böyük şəxsiyyətlər onlardan nəsihət istəyənlərə “bizim özümüzün nəsihətə ehtiyacımız var” deyirlər. Onların bu hərəkəti böyük mə`nəviyyat əlaməti olsa da təvazökarlıq vəzifənin qarşısını almamalıdır. Əgər bütün əxlaqsevərlər yalnız öz tərbiyəsi ilə məşğul olsa cəmiyyətdə insanlıqdan əsər qalmaz. Məgər peyğəmbərlərin bir zaman icra etdiyi tə`lim və tərbiyə vəzifəsi bu gün alimlərin öhdəsində deyilmi?! Başqalarına nisbətən .daha əxlaqlı olanlar cəmiyyəti islah etməyə borcludurlar

Bir sözlə, tərbiyə də tə`lim kimi vacib əmrdir. Nə tə`lim, nə də tərbiyə sahəsində layiqli insanlar üçün təvazökarlıq maneə ola bilməz. Əgər həqiqi alim

danışsam deyərlər ki, özünü göstərir” düşünərək susarsa bəşəriyyət cəhalətə düçar“ .olar

Tarixdə hətta ən yaxın adamlarından öz elm və fəzilət mərtəbəsini gizlədən böyük şəxsiyyətlər olub. Düzdür, bu şəxsiyyətlərin bir çoxu həmin hərəkətlərinə bəraət qazandıracaq möhkəm dəlillərə malik olublar. Şəxsiyyətini gizlətmək insan üçün kamal hesab oluna bilər, amma həmişə yox! Əgər bütün alimlər şöhrətpərəstlikdən qurtulmaq üçün öz elmini gizlədərsə xalqın tə`lim-tərbiyəsi ilə kim məşğul olar?! Bu .kifayi vacib işlə hökmən kimsə məşğul olmalıdır

Mənim də tərbiyəyə ehtiyacım başqalarından daha çoxdur. Amma özümdən soruşuram ki, əgər bu vəzifəni yerinə yetirməsəm qiyamət günü nə cavab verərəm? Bu vacib işdən boyun qaçırdığıma şöhrətpərəstlik qorxusu səbəb ola bilərmi? Elmi mərkəzlərdə tanınmış əxlaq ustadları dərs keçsələr də, yenə də bu işə ehiyac duyulur. Ona görə də bütün nöqsanlarına baxmayaraq mənim kimiləri üçün də tərbiyə işi ilə .məşğul olmaq vacib görünür

## TƏZKİYƏ MƏFHUMU

Təzkiyənin, yə`ni tərbiyənin hədəfi nəfsdir. “Təzkiyə” sözü ərəb dilindən tərcümə olunduqda iste`dadların çiçəklənməsi, kamilləşmə, inki-şaf mə`nasını verir. “Şəms” surəsinin ۹-۱۰-cu ayələrində buyurulur: “Öz nəfsini təmizləyən kimsə (təzkiyə edən) mütləq nicat tapmışdır; onu korlayıb bulaşdıran kimsə isə mütləq uduzmuşdur.” Ayələrdən göründüyü kimi “təzkiyə” kəlməsi “nəfsi təmizləmək”, onun əksi isə “nəfsi .bulaşdırmaq” mə’nalarını daşıyır

Bu kəlmə «ağaca qulluq» mə`nasını da verir. Bağban ağaca qulluq edir, ona su verir, dibini yumşaldır. O, ağacın inkişafı üçün ağacın budaqlarını budayır. Bütün bu işlərin .içəri-sində ağacı çirkabdan, zərərli həşəratlardan qorumaq da var

İnsanın da təzkiyəsi həmin iki istiqamətdə aparılır; nəfs hansısa xüsusiyyətlərlə .zinətlən-dirilir, eləcə də, hansısa xüsusiyyətlərdən pak-landırılır

## İNSAN TƏRBİYƏSİNİN SƏCİYYƏVİ XÜSUSİYYƏTLƏRİ

İnsanın tərbiyəsi başqa mövcudların tərbiyəsindən bə`zi xüsusiyyətlərinə görə :fərqlənir

İnsanın tərbiyəsi onun iradəsindən asılıdır. Bağbanın tərbiyə etdiyi ağacın iradəsi.١ olmadığı halda insanın iradə və istəyi onu başqa mövcudlardan fərqləndirir. Ağac .şəraitə təslim olduğu halda insan öz iradəsi ilə şəraitə tə`sir göstərir

Bir sözlə, insanın tərbiyəsində onun istəyi əsas şərtdir. İnsanı istəmədiyi halda kimsə yaxşılığa məcbur edib behiştə apara bilməz. Allah-təala Peyğəmbərə müraciətlə buyurur: “Şübhəsiz ki, sən istədiyin hər kəsi hidayət edə bilməzsən. Amma Allah istədiyini hidayət edər və O, hidayətə layiq olanları daha yaxşı tanıyır.”(١) Bəli, hətta əzəmətli məqam sahibi olan peyğəmbər (s) istədiyi insanı doğru yola məcbur edə bilməz. Yalnız Allah bu yola layiq olanları hidayət edir. “Nisa” surəsinin ۴۹-cu ayəsində buyurulur: “İstədiyini pak edə bilən yalnız Allahdır.” Demək, təzkiyə də hidayət kimi tərbiyəçinin ixtiyarında deyil. Bə`ziləri belə düşünə bilər ki, əgər hidayət və təzkiyə Allahın ixtiyarındadırsa onda insan nə vaxt hidayət ediləcəyini oturub gözləməlidir. Bu suala cavab vermək üçün “əf`ali tövhid” ifadəsi ilə tanış olmalıyıq. İnsan inanmalıdır ki, əsil fail, işi görən səbəbkar yalnız Allahdır və bu inam əf`ali tövhid adlanır. Allahdan başqa bütün varlıqlar öz hərəkətində tə`sirə möhtacdır. “Vaqiə” surəsinin ۶۴-cü ”?ayəsində oxuyuruq: “Onu (əkdiyiniz toxumu) siz bitirirsiniz, yoxsa biz



---

.Qəsəs” surəsi, ayə: ۵۶“ [۶] -١

Ayədən belə mə`lum olur ki, həqiqi səbəbkar Allahdır. Lakin "Hər şeyi Allah hərəkətə gətirir" demək özü də səhv fikirdir. Hər halda, mö`min şəxs bilməlidir ki, Allahın izni .olmadan heç bir hərəkət baş verə bilməz

Tərbiyələnmək insanın istəyindən asılı olsa da, Allahın iradəsi olmadan gerçəkləşə bilməz. İslam peyğəmbəri, mə`sum imamlar və cəmiyyətin digər tərbiyəçiləri yalnız Allahdan yardım almaqla bir iş görə bilirlər. "Təkvir" surəsinin ۲۹-cu ayəsində oxuyuruq: "Aləmlərin Rəbbi istəməyincə siz istəyə bilməzsiniz." "Nisa" surəsinin ۲۹-cu ayəsində buyurulur: "Allah istədiyini pak edər." "Ali-İmran" surəsinin ۱۶۴-ci ayəsində buyurulur: "(Peyğəmbər) onları pak edər, onlara kitab və hikmət öyrədər." "Şəms" surəsinin ۹-cu ayəsində isə belə buyurulur: "Nəfsini təmizləyən nicat tapdı." Son üç ayədən görünür ki, insanın tərbiyəsi Allah və onun rəsulundan, eləcə də insanın özündən asılıdır. Bu işdə Allah müstəqil, peyğəmbər və insan isə Allahın icazəsi ilə .fəaliyyət göstərir. Əf`ali tövhidin mə`nası budur

Deməк, ağac öz tərbiyəsində bağbana müqavimət göstərə bilmədiyi halda insan öz tərbiyəsində azaddır. İnsanın qəlbini zorla hansısa istiqamətə yönəltmək qeyri-mümkündür. Zorla görülən işdə kamillikdən söhbət gedə bilməz. İnsanın kamilliyi .doğru yola buxovlanmasında yox, doğru yolu öz istəyi ilə seçməsindədir

İnsanların tərbiyəsi ilə məşğul olan şəxs əvvəlcə kamilliyə maraq oyatmalıdır. Əgər o, tərbiyə etmək istədiyi şəxsin diqqətini yaxşılığa yönəldə bilsə müvəffəq ola bilər. Bütün insanların fitrətində yaxşılığa meyl var. Tərbiyəçinin işi yatmış fitrəti oyatmaqdır. Əgər insanın fitrətində bu meyl qoyulmasaydı onu kimsə tərbiyələndirə bilməzdi. Təbii ki, .insan meyli çəkməyən bir şeyə dəyər verə bilməz

Demək, insanın təzkiyəsi, tərbiyələnməsi üçün ona elə bir şərait yaratmaq lazımdır ki, .onda kamilliyə həvəs yaransın

Özünütərbiyə mümkündür. İnsanın tərbi-yəsinin ağacın tərbiyəsindən mühüm bir .۲ fərqi insanın özünütərbiyə qabiliyyətidir. İnsan ağacdan fərqli olaraq özü üçün təkamül şəraiti yarada bilər. İnsan tərbiyəçinin köməyi olmadan öz zəhməti hesabına tərbiyənin müəyyən mər-hələlərini təkbaşına qət edə bilər. Müstəqil şəkildə elm öyrənmək mümkün olduğu kimi, müstəqil şəkildə tərbiyələnmək də mümkündür. Müəllim və tərbiyəçinin rolu inkarolunmazdır. Amma söhbət ondan gedir ki, insan oturub müəllim və tərbiyəçi yolu gözləməməlidir. Bir çox mərhələləri tərbiyəçisiz qət .etmək olar

Dövrün İsgəndəri olsan da əgər

.Zülmətdə ustadsız eyləmə səfər

Amma elə mərhələlər var ki, bu mərhələlərdəki müvəffəqiyyətsizliyi müəllimsizliyin boynuna yıxmaq olmaz. Yalnız özünütərbiyənin ali mərtəbələrini ustadsız keçmək qeyri-mümkündür. “Saffat” surəsinin ۲۴-cü ayəsində buyurulur: “Onları yubadıb sorğu-sual üçün saxlayın.” İnsan qiyamətdə sorğu-suala çəkildiyi zaman üzr gətirə bilməz ki, .tərbiyəçisi olmadığı üçün kamala çata bilməyib

Əlbəttə ki, təkamülün ali mərtəbələrini ustadsız keçmək istəyən insanı şeytan aldada bilər. Amma ibtidai mərhələləri təkbaşına uğurla qət etmək olar. Ali mərtəbələrdə isə şeytan müdaxilə edib ustadsız yolçunu çaşdıra bilər. Elə ibtidai mərhələlərdə də ustadın olması çox gözəldir. Amma ustad yoxdursa dayanmaq da olmaz. Bu mərhələlərdə ayə və hədislər, Əhli-beyt maarifi, əxlaq alimlərinin kitabları müəllimi .əvəz edə bilər

### İKİNCİ DƏRS

### NƏFS VƏ ONUN TƏRBİYƏSİ

### ƏVVƏLKİ DƏRSƏ BİR NƏZƏR

Mövzumuz nəfsin tərbiyəsidir. Birinci söhbətdə tərbiyənin, yə`ni təzkiyənin mə`nası ilə tanış olduq. Qeyd etdik ki, ərəb sözü olan təzkiyəni dilimizə olduğu kimi tərcümə etmək çətindir. Hələ ki, "tərbiyə" sözü ilə kifayətlənirik. Dedik ki, nəfsin tərbiyəsində iki istiqamət var: təkamül üçün şərait yaratmaq və təkamülə mane ola biləcək daxili və xarici səbəbləri aradan qaldırmaq. Qeyd etdik ki, nəfsin tərbiyəsi Qur`anın diqqət mərkəzində olan məsələlərindəndir. Peyğəmbər-lərin də vəzifələrindən biri nəfsin .tərbiyəsidir

Qur`an ayələrindən mə`lum oldu ki, nəfsin tərbiyəsində üç fail - Allah, peyğəmbər və insan iştirak etməlidir. İnsanın özünütərbiyədə Allahı tə`sirli bilməsi "əf`ali tövhid"dir. İnsanın varlığı və hərəkəti yalnız Allahın iradəsi ilə mümkündür. Bu işdə peyğəmbərlərin vəzifəsi cəmiyyətin islahı üçün şərait yaratmaqdır. Nəhayət, insan .azad varlıq olduğundan onun özünün istəyi olmadan tərbiyə qeyri-insani-mümkündür

Bundan əlavə, ötən söhbətdə mə`lum oldu ki, təkamülün ilkin mərhlələrini insan .müəllimsiz, yə`ni təkbaşına qət edə bilər

## (NƏFSİN NÖVLƏRİ (ƏMMARƏ, LƏVVAMƏ, MÜTMƏİNNƏ

Sual oluna bilər: Nəfs elə əql deyilmi? Yoxsa nəfs və əql ayrı-ayrılıqda mövcuddur? Nəfslə əql arasında mübarizə dedikdə nə başa düşülür? Nəfsin növləri var, yoxsa elə ?bir növdür? Nəfs insanın özüdür, yoxsa ayrı bir varlıqdır

Nəfs" sözü də "təzkiyə" sözü kimi, ərəb dilinə məxsus sözdür. Mə`nası "özüm", "mən"" deməkdir. Qur`ani-kərimdə bu söz müxtəlif mə`nalarda işlədilmişdir. Adi halda nəfs dedikdə insanın şəxsiyyəti, varlığı nəzərdə tutulur. Beləcə, insanın şəxsiyyəti, yə`ni nəfsi vahiddir və onun müxtəlif yönümləri var. Bütün qüvvələr, meyllər, istəklər həmin bu nəfsə aiddir. Yaxşını pisdən ayırmaq iste`dadına malik olan əql də bu qüvvlərdəndir. Demək, insanda mövcud olan iki yönümdən biri əql, digəri isə ölçü-biçim tanımayan istəklərdir. Əql ilə nəfsin mübarizəsi dedikdə həmin bu iki yönümün .mübarizəsi nəzərdə tutulur

Əmmarə, ləvvamə və mütməinnə adlanan üç növ nəfs də həmin yeganə nəfsin müxtəlif hallarıdır. Nəfs fitrətən kamillik tələbin-dədir. İnsan hələ uşaq çağlarından öz .qüvvəsini və imkanlarını artırmağa çalışır. O, suallar verməklə elmini artırır

Amma kamilliyin konkret öz yolu vardır. Bu yoldan çıxan insan gecə-gündüz çalışsa belə kamala yetəsi deyil. Təkamül yolunda səhvə düçar olan insan nə vaxtsa üzücü peşimançılıq çəkir. Bu peşimançılıq əvvəlki nəfsin bir başqa halıdır. İnsanı pisliyə çağıran nəfs əmmarə adlanırsa, əqlin tə`siri ilə peşman olmuş nəfs ləvvamə nəfs adlanır. İki yol ayrıcında qalmış insan əqlinə müraicət etmədən həvəs ardınca gedirsə nəfs öz əmmarə halını möhkəmləndirir. Əmmarə nəfsə nəzarət olunmazsa insan böyük günahlara batar. Öz-özlüyündə pis olmayan istək yalnız nəzarətsiz qaldıqda

həddi aşıb bəlaya çevrilir. Məsələn, insanın yeməyə meyli təbii bir meyldir. Amma bu meylə nəzarət olunmadıqda insan halal-haram, xeyir-zərər bilmədən qarnını doldurur. Belə insanın nəfsi əmmarə halındadır. Bütün meyllər həddini aşdıqda bu hal baş qaldırır. Nəfsin qidalanmaya, əyləncəyə, istirahətə və s. meyli onun əmmarə olmasına .dəlil deyil. O, yalnız həddi aşdıqda əmmarə olur

İnsanın öz əqlinə zidd hərəkət etməsi onun azad olmasının nişanəsidir. İnsan həm əqlə, həm də azadlığa malikdir. O, əql vasitəsi ilə yaxşı və pisi tanıdıqdan sonra iki yoldan birini seçməkdə azaddır. İnsan iki yoldan birinə üz tutmağa məcbur deyil. İnsanın kamilliyi nəfsani istəklərin əqlə tabe edilməsindən asılıdır. Əqlin göstərişlərini eşitməməzliyə vuran insan əyri yolu seçir. Əqlin səsinə qulaq asan insan isə nəfsi cilovlaya bilir. İnsan yalnız bu zaman Allaha yaxınlaşa bilər. Əqlə təkrar-təkrar itaət edən insanlarda nəfsi cilovlamaq gücünə malik xarakter formalaşır. Bu zaman nəfs sakitləşir və insan çətinlik çəkmədən arxayın bir qəlblə həqiqətə doğru hərəkət edir. Bu həmin mütməinnə nəfsdir. Mütməinnə nəfs müxtəlif təhlükələri adlamış, ali dərəcəyə çatmış həmin əvvəlki nəfsdir. Ardıcıl şəkildə əqlinə tabe olan insanın nəfsi mütməinnədir. Əql və nəfsin mübarizəsi təkamül yolunda ilk addımlarını atan nəfsə .aiddir. Nəfs əqlin hakimiyyətinə keçdikdən sonra mövcud ziddiyyət aradan qalxır

### TƏBİİ (HEYVANİ) VƏ QÜDSİ (İLAHİ) NƏFSLƏR

Təbii və ya heyvani nəfs dünya malına, günaha, alçaq işlərə meyllidir. Eqoizm, özünəpərəstlik, paxıllıq və s. bu nəfsin xüsusiyyətləridir. Qüdsi və ya ilahi nəfs isə Allahla yaxınlığa, mərhəmətə, ədalətə, fədakarlığa və s. meyllidir. Bu nəfs pak olan ilahi bir ruhdur. “Hicr” səh:۱۳

surəsinin ٢٩-cu ayəsində buyurulur: “Ona öz ruhumdan üfürdüyüm zaman ona səcdə edin.” Bəli, mütməinnə nəfs həmin ruhdur. Demək, daxilimizdə daim mübarizədə olan qüvvələr eyni bir nəfsin iki yönümüdür. İnsan cism və ruhdan təşkil olunduğundan bə`zi ehtiyaclar ruha, bə`ziləri isə cismə aiddir. Məsələn, pulu olmayan insan yemək istəməklə yanaşı, kimsəyə əl açmayıb şəxsiyyətini qorumaq da istəyir. O, ya şəxsiyyətini qoruyub ac qalmalı, ya da şəxsiyyətini sındırıb qarnını doyurmalıdır. Bu istəkdən biri cismə, digəri ruha aiddir. Bu mübarizə biri heyvani, digəri ilahi olan iki “mən” və ya iki “ruh” arasında yox, vahid insanın iki istəyi arasında gedir. Ola bilər ki, iki .istək bir-birinə müqavimət yox, yardım göstərsin

## NƏFS VAHİDDİR

Qur`ani-kərimin müxtəlif ayələrində insanın vahid nəfsdən yaradıldığı bəyan olunur: “Odur sizi vahid nəfsdən xəlq edən.”(١) Bu ayədə nəfs hansı mə`nada işlənmişdir? Söhbət əmmarə və ya ləvvamə nəfsdən, yoxsa insanın şəxsiyyətindən gedir? Ayədə insanın ilk yaranışda bir şəxsdən yaranıb çoxaldığı bildirilir. Ərəb ədəbiyyatı baxımından “vahidə” kəlməsi qadın cinsində olduğundan bə`ziləri elə güman edirlər ki, ilk insan həzrət Həvva olmuşdur. Onlar öz fikrini sübut etmək üçün “Ə`raf” surəsinin həmin ayəsinin davamını dəlil göstərirlər: “Onun özündən zövcəsini yaradan da odur.” Guya həzrət Adəm həzrət Həvvadan yaradılmışdır. Hansı ki, “zövcə” kəlməsi kişiyə yox, qadına aiddir. Həmin səhv ərəb dili ilə lazımi qədər tanışlıq olmamağından irəli .gəlir

Nəfs kəlməsi Qur`anda bə’zi yerlərdə ruh mə`nasında işlədilmişdir. “Zumər” surəsinin ٤٢-ci ayəsində oxuyuruq: “Allah öləcəkləri zaman insanların nəfsini səh:١۴

---

.Ə`raf” surəsi, ayə: ١٨٩“ [٧] -١

tamamilə çıxarır.” Bu ayədə nəfs dedikdə ruh nəzərdə tutulur. Bu sözün düzgün mə`nasını anlamaq üçün diqqətli olmaq lazımdır. Nəzərə almaq lazımdır ki, bu söz bə`zən cism, bə`zən ruh, bə`zən insan, bə`zən də əmmarə və ya ləvvamə meyllər mə`nasında işlədilir. İnsanın öz istəklərini cilovlaya bilmədiyi halı əmmarə nəfs, günahdan peşmançılıq çəkdiyi hal ləvvamə nəfs, kamala çatmış halı isə mütməinnə .nəfs adlanır

Nəfs ilə əqlin düşmənçiliyi dedikdə əqlani qüvvə ilə nəzarətdən çıxmış nəfsani istəklər arasında olan təzad nəzərdə tutulur. İnsanın daxilində olan meyllər heç bir hədd-hüdudsərhəd tanımır. Əqlin işi kamilliyin ziddinə olan ifratın qarşısını almaqdır. Əql ilə nəfsin düşmənçiliyinin əsl mə`nası da məhz bundan ibarətdir. İnsanın daxilində iki .müstəqil varlığın savaşı yanlış təsəvvürdür

## NƏFSİN TƏRBİYƏSİNDƏ MƏQSƏD

Nəfsin tərbiyəsi dedikdə nəfsani bəlalardan qorunmaq nəzərdə tutulur. Nəfs bağbanın əkdiyi cavan ağac kimidir. Bağban gecə-gündüz onun qulluğunda durur, onu zərərverici həşəratlardan qoruyur. Nəfs də ağaca bənzəyir. İnsan bağban kimi ona qulluq etməlidir. Əxlaq alimləri bu işi “təxliyə” adlandırırlar. Yə`ni insan özünü nəfsin bəlalarından qurtarmalıdır. Ağac torpağa əkilib səmaya tərəf baş qaldırdığı kimi nəfs də ucalığa doğru can atmalıdır. Nəfsə belə bir yüksəliş üçün güc lazımdır. Bu gücü əldə etmək üçün bəlalardan qorunmaq zəruridir. Bu prosses təzkiyənin, yə`ni tərbiyənin .təxliyə adlanan ilk mərhələsidir

Növbəti mərhələdə insan nəfsin sağlamlığı üçün zəruri olan şeylərdən faydalanmalıdır. .Məhz bu mərhələdə nəfsin pərvaz etməsi üçün lazımı enerji əldə edilir

Unutmaq olmaz ki, cism ruhun miniyidir. Ruh nə qədər ki bu dünyadadır cismin köməyi .ilə hərəkət edir

Ona görə də bəladan qorunmaq və enerji əldə etmək cismə də şamildir. Xəstə cism ruhu mənzilə çatdırmaq iqtidarında deyil. Bədən nə vaxtsa çürüyəcək olsa da onun dünya həyatında olan rolu müstəsna əhəmiyyətə malikdir. Mənzilə çatdıqdan sonra ondan ayrılmaq olar. Amma həmin mərhələyədək bədənlə yoldaşlıqdan başqa çarəmiz yoxdur. Avtomobillə hərəkət etməyi qərara alan insan onun nasazlığını .aradan qaldırmalıdır. Əks təqdirdə insan yarı yolda qala bilər

### NƏFSİN İNKİŞAFıNıN AMİLLƏRİ VƏ ONUN QARŞISINI ALAN MANEƏLƏRİ

Konkret olaraq qeyd etmək olar ki, nəfsin bəlası günah, xoşbəxtliyi isə Allahı yad etməkdir. "Ənfal" surəsinin ۲۴-cü ayəsində buyurulur: "Ey iman gətirənlər, sizə həyat verəcək şeyə də`vət edən Allahın və peyğəmbərin də`vətini qəbul edin". Amma bu də`vətlər yalnız diri qəlblərə tə`sir edir. "Yasin" surəsinin ۱۱-ci ayəsində buyurulur: "Sən yalnız o kəsi qorxuda bilərsən ki, qəlbində Allah qorxusu olsun." Bəli, ruhən diri olmayan insana nəsihətin heç bir tə`siri yoxdur. Allah qorxusu olmayan qəlb ölüdür və .peyğəmbərin «nəsihət dəvası» onu dirildə bilməz

Nəfsin təzkiyəsi o qədər əhəmiyyətlidir ki, Allah bunu bəyan etməkdən ötrü on bir dəfə and içir. Qur`ani-kərimdə heç bir məsələnin bəyanında bu qədər and içilməyib: "And olsun günəşə və onun işığına; and olsun günəşin dalınca getməkdə olan aya; and olsun onu (yeri) cilvələndirən gündüzə; and olsun onu örtən gecəyə; and olsun göyə və onun binasını qoyana; and olsun yerə və onu döşəyənə; and olsun nəfsə və onu (nizama salana; sonra da ona xeyrini və zərərini ilham edənə!"(۱

Ey insan, əgər sən qurtuluş və səadətə nail olmaq istəyirsənsə, bil ki, bu iş yalnız nəfsi tərbiyələndirmək yolu ilə mümkündür. Əvvəlcə onu bəlalardan uzaqlaşdır, sonra isə gücləndir! Nəfsi güclənməsinə səbəb olan ən mühüm



---

.Şəms" surəsi, ayə: ۱-۸" [۸] -۱

amillərdən biri Allahı çox zikr etməkdir. Gün ərzində bir yox, beş dəfə namaz qılmağın vacibliyi təkrar zikrin faydası ilə əlaqəlidir. “Taha” surəsinin ١۴-cü ayəsində oxuyuruq: “Məni yad etmək üçün namaza dur.” Məqsədə çatmaq istəyən insan üçün Allahı təkrar-təkrar zikr etmək ümumi bir üsuldur. Məsələn, dünya çempionu olmaq istəyən pəhləvan öz arzusu miqdarında məşq edir. Kamilliyə çatmaq istəyən insan da bu sayaq «tər tökməlidir». Qəlbin iştirak etdiyi ibadət və zikr insan nəfsini paklaşdırır. Əlbəttə, qəlbin iştirak etmədiyi dil ibadəti və əyilib-düzəlmələrin heç bir faydası .yoxdur

İnsanı təzkiyə dirildir. Təzkiyə isə Allahı xatırlayıb günahdan uzaqlaşmaqla əldə edilir. Nəfsin tərbiyəsi və ruhun təkamül yolu Allah tərəfindən peyğəmbərlər vasitəsi ilə ixtiyarımızda qoyulmuşdur. Bu yolu tanıyıb məqsədə doğru hərəkət etmək üçün .Allahdan yardım alacağımıza ümid edirik

## ÜÇÜNCÜ DƏRS

## NƏFSİN TƏkAMÜL VƏ TƏNƏZZÜLÜ

### NƏFSİN İNKİŞAFı VƏ SÜQUTU

Mövzumuz nəfsin tərbiyəsidir. Qeyd etdik ki, bu söz Qur`andan götürülmüşdür. Ayələrdən mə`lum olduğu kimi nəfs üçün onu həm ucalığa, həm də tənəzzülə aparan .yollar vardır. O, həm təkamül, həm də süqutetmə xüsusiyyətinə malikdir

Nəfsin necə inkişaf etdiyini və ya necə süquta uğradığını gözlə görmək qeyri-mümkündür. Başqa sözlə, bu hiss üzvlərinin duya biləcəyi prosses deyil. Orqanizmin xəstəliklərini hiss etmək mümkün olduğu halda ruhun xəstəliklərini hiss etmək .mümkün deyil

Nəfsin xəstəliklərini tanımaq yalnız yüksək ruhi dərrakə vasitəsilə onu müşahidə etməklə mümkündür. Bu ruhani halət «hüzuri elm» (Allahın insanın qəlbinə əta etdiyi elm nuru) adlanır. Təkamülün müəyyən dərəcəsinə çatanlar bunun nə demək olduğunu asanlıqla anlaya bilərlər. Hüzuri elm vasitəsi ilə nəfsin vəziyyətini dərk edə .bilməyənlər ayə və hədislərdən yardım almalıdırlar

Qur`ani-kərimdə buyurulur ki, nəfs də bədən kimi çirklənə bilər. Çirkinlikdən təmiz-lənməmiş nəfs inkişaf edə bilməz. Toxumun cücərməsi üçün ilkin şərtlər lazım olduğu kimi, nəfsin də inkişafı üçün müəyyən şərait lazımdır. Çürük ağac meyvə verə bilmədiyi kimi xəstə nəfs də irəli addım ata bilməz. Ağacın od tutub yanması və ya quruması üçün təkcə xarici tə`sir rol oynamır. Elə bir şərait yarana bilər ki, ağac öz içindən yanar. Afrika və Avstraliyadakı meşə yanğınları buna bir nümunədir. Bə`zən elə ağaclarla rastlaşmaq olur ki, od tutub alovlanmadığı halda bu ağacın gövdə və yarpaqları yanmış ağac tək qaralır. Bu halı yaradan havadakı və torpaqdakı ifrat .quruluqdur

İnsanın nəfsi də belədir. Bə`zən o içindən od tutub alışır. “Bəqərə” surəsinin ۲۴-cü ayəsində buyurulur: “Yanacağı insanlar olan oddan qorxun.” Bu elə bir oddur ki, kənardan qığılcıma ehtiyacı yoxdur. “Huməzə” surəsinin ۶-۷-ci ayələ-rində oxuyuruq: “O, Allahın alışdırdığı oddur; elə bir od ki, qəlbləri bürüyür.” Xaric-dən gələn od insanın .cismini yandırır. Qəlbi yandıran od isə nəfsin xəstəliyindən doğan oddur

## NƏFSİN TƏKAMÜLÜ

Nə qədər ki insan özü nəfsin təkamül mərhələsinə çatmayıb bu işin həqiqi mə`nasını dərk edə bilməz. Anadan kor doğulmuş insana bir ömür rənglərdən danışsaq da heç nə anlada bilmərik. İnsana bir şeyi anlatmaq üçün o insanın idrakında zəif də olsa nümunə səh:۱۸

olmalıdır. Bu nümunə olmadan deyiləni təsəvvür etmək mümkün deyil. Nəfsin kamalını "dad-mamış", ona "toxunmamış" insan nəfsin təkamülünü anlamaqda acizdir. İnsana tanımadığı bir meyvəni tə`rif edəndə həmin şəxs bu meyvənin turş və ya şirin olması barədə sual verir. Onun təsəvvüründə "turş" və "şirin" anlayışları olduğundan bu anlayışlar vasitəsi ilə deyiləni dərk etmək istəyir. Bəs bu dadlardan xəbərsiz olan insana danışmağa dəyərmi?! Bütün bu ləzzətlərdən xəbərsiz insana mə`lumat .verməklə təşviq etmək olar. Nəfsin kamilliyini anlatmaqda ayə və hədislər bu işi görür

Bəli, adi insanlar üçün ibadət və duanın ləzzəti anlaşılmazdır. Amma bu ləzzəti cüz`i də olsa dadanlar "Xəmsi-əşərə" duasında zikr olunduğu kimi belə deyəcək: "İlahi, Sənin ".zikrinin ləzzətindən başqa olan bütün ləzzətlərdən tövbə edirəm

Əlbəttə ki, ləzzət ümumi məfhumdur və onun müxtəlif nümunələri vardır. Biz ləzzət məfhumunu anlasaq da onun bə`zi nümunələrindən xəbərsizik. Bir çox insanlar Allahla ünsiyyətin ləzzətindən tam xəbərsizdir. Belələrinə ləzzət məfhumunu anlatmaq olmasa da bu ləzzətin dəyərini izah edib təşviq etmək mümkündür. Hər bir insanın nəzərinə çatdırılmalıdır ki, cismani ləzzətlərdən daha üstün ruhani ləzzətlər vardır. Qur`ani-kərimdə insanları behişt ne`mətlərinə çatmaq üçün təşviq edərkən bu üsullardan istifadə olunur. Məsələn, insanlar dünyadakı şərabdan xəbərdar olduğu üçün Qur`an buyurur: «Təqvalılara və`də verilən rəngi və qoxusu dəyişməyən sudan, dadı dəyişməyən süddən, içənlərə ləzzət verən şərabdan və baldan arxlar...»(١) Dünyadakı şərab insanın əqlini başından çıxarıb onu dərdə düçar etdiyi halda, behişt şərabı tamamilə zərərsizdir. "Vaqiə" surəsinin ١٩-cu ayəsində



---

.Muhəmməd" surəsi, ayə: ١٥" [٩] -١

oxuyuruq: “Onu içəndə başları ağrımaz və ağılları azalmaz.” Əgər dünyadakı süd və bal bir müddətdən sonra dadını dəyişirsə, behiştdəki bal və süd heç zaman tamını itirmir. Qur`an insanlara tanış mə`nalardan istifadə etməklə onları axirət həyatına .həvəsləndirir

## ALLAHA YAXINLIQ

Allaha yaxınlıq” ifadəsinin mə’nasını daha aydın dərk etmək üçün bə`zi maddi və hissi“ anlayışlardan istifadə etmək olar. Yaxınlıq iki mə`nada işlənir. Birinci mə`naya qaşla gözün yaxınlığını misal göstərmək olar. İkinci mə`naya misal olaraq isə biri Kərbəla, digəri Məşhəddə yaşayan iki dostun qəlbən yaxınlığını göstərə bilərik. Əgər birinci mə`nada məkan yaxınlığı nəzərdə tutulursa, ikinci mə`nada mə`nəvi yaxınlıqdan .söhbət gedir

İnsan böyük şəxsiyyələrlə mə`nəvi yaxınlıqdan zövq alır. Məsələn, ölkə başçısı televiziya vasitəsi ilə hər hansı qəsəbə əhlinə öz məhəbbətini bildirirsə həmin bu qəsəbə əhli bundan mə’nəvi yaxınlıq hissi keçirərək qürur duyur. Amma elə insanlar da var ki, onlar yalnız Allahla yaxınlıqdan ləzzət duyurlar. Necə ola bilər ki, gec-tez torpaq əsiri olacaq insanla yaxınlıqdan ləzzət alan şəxs varlıq aləmini bir “ol” deməklə ən gözəl şəkildə yaratmış mərhəmətli Allahla ünsiyyətdən ləzzət duymasın?! Əsl iftixar bəşəriyyətin səadətini tə`min etmək qüdrətində olan böyük Yaradana yaxın olmaqdır. Həqiqi səadət odur ki, qüdrətli mə`bud insana nəzər salıb onu öz mərhəmətinə qərq .etsin

Tövhid maarifinin mehvəri Allaha yaxın-lıqdır. Bütün peyğəmbərlərin tə`limləri bu mehvər ətrafında səh:٢٠

toplanmışdır. Hətta bütpərəs-tlər də Allahla yaxınlığa can atmışlar. “Zumər” surəsinin ٣-cü ayəsində buyurulur: “Biz bütlərə yalnız Allaha yaxınlaşmaq üçün ibadət edirik.” Ayə Məkkə müşriklərinin dilindən deyilir. Demək, hətta yolunu azanlar da bu yaxınlığa can atır. Həzrət Əli (ə) buyurur: “Görmədiyim Allaha ibadət etməzdim.”(١) Əlbəttə, söhbət adi göz yox, bəsirət gözü ilə görməkdən gedir. Həzrət Əli (ə) “Nəhcül-bəlağə”də bu məsələyə toxunur: “Gözlər Onu aşkar dərk etməz, amma qəlblər Onu ”.iman həqiqəti vasitəsi ilə anlayar

## İNSANI NƏFSİN TƏRBİYƏSİNƏ SÖVQ EDƏN AMİLLƏR

İnsanı Allaha yaxınlaşmağa sövq edən amillərdən biri Qur`ani-kərimdəki təşviqlərdir. Behiştdəki bağlardan, hurilərdən, süd və bal axan çaylardan danışan ayələr bu qəbildəndir. Qur`an nəfsinə nəzarət edib onu kamala çatdıranlara misilsiz ne`mətlər və`d edir. Amma Qur`anda təşviqdən əlavə təhlükədən xəbər verən ayələr də vardır. İnsana xatırladılır ki, nəfsinə nəzarət etməyənləri müxtəlif bəlalar gözləyir. Allah-təala insana xəbərdarlıq edərək buyurur ki, ey insan, əlli il ömür sürdükdən sonra səni .peşman edəcək günahlardan uzaq ol

Əgər bağımızda bir ağac əkib neçə illər zəhmətini çəksək onun quruması bizi mə`yus edər. İnsanın vücudu Allahın yer üzündə əkdiyi ağaca bənzəyir. Bu ağaca lazımi tərzdə .qulluq edilməsə çətin ki bəhrə verə

İnsanda nəfsin tərbiyəsinə maraq oyatmaq üçün müxtəlif ayələrdə cəhənnəm əzabından danışı-lır. “Nisa” surəsinin ٥٦-cı ayəsində oxuyuruq: “Ayələrimizi inkar edənləri oda yaxacaq və əzabı dadsınlar deyə yanmış dərilərini yenisi ilə əvəz



---

.Biharul-ənvar”, ٤-cü cild“ [١٠]-١

edəcəyik.” “Nəbə” surəsinin ۴۰-cı ayəsində buyurulur: “Sizi yaxın olan əzab ilə xəbərdar etdik. O gün insan öz əlləri ilə göndərdiyi əməllərə baxar və kafir olan kəs deyər: «Ey kaş torpaq olaydım.»” Bəli, elə bir gün gələr ki, bə`ziləri «öz vücud ağacları»ndan bəhrə götürə bilməz. Belə insanları həsrət və peşmançılıq bürüyər. Şübhə yoxdur ki, onlar özləri-özlərini müsibətə salarlar. “Yunis” surəsinin ۴۴-cü ayəsində buyurulur: “Allah heç vəchlə kimsəyə zülm etməz, amma insanlar özləri-özlərinə zülm edirlər.” Allah-təala insanı gözəl biçimdə yaratmış və ona səadət yolunu göstərmişdir: “Öz aranızdan sizə peyğəmbər gəlmədimi ki, ayələrimi sizə oxuyub bu günkü görüşdən xəbərdar (etsin?”(۱

## CƏHƏNNƏMİN YARANIŞ FƏLSƏFƏSİ

?Allah-təala cəhənnəmi yaratmasaydı nə olardı? Cəhənnəmin yaradılması zəruri idimi

Əslində, behişt və cəhənnəm bir ipin iki ucu kimidir: biri varsa, o biri də olmalıdır. İnsan azaddır və bu iki sonluğu zəruri edən də insanın azadlığıdır. Behişt doğru yolu seçmiş azad insanın mükafatı, cəhənnəm isə şər yolu seçmiş azad insanın cəzasıdır. İnsanın azad şəkildə seçim aparması üçün onun qarşısında ən azı iki yol olmalıdır. Əgər qarşıda daim yalnız bir yol varsa insanın azadlığının heç bir mə`nası yoxdur. Əgər qarşıdakı yollardan yalnız biri ilə getməyə imkan varsa insan yenə də azad deyil. Çünki .bu iki halda insan iradəsindən asılı olmayaraq addım atır

Allah-təala insanı azad, muxtar yaratmışdır. Həm yaxşılığa, həm də pisliyə meyl onun daxilindədir. Yaxşılığı seçən yaxşılığa, pis-liyi seçən pisliyə çatmalıdır. Əgər bu iki qrup .insanın aqibəti eyni olsaydı, ilahi ədalətdən danışmağa dəyməzdi



---

.Ən`am” surəsi, ayə: ۱۳۰“ [۱۱]-۱

Demək, insanın qarşısında iki yol var. Bu yollardan biri onu Allah xəlifəsi məqamına, digəri ən alçaq səviyyəyə aparır. Birinci yol gecə ibadələri, bəndəlik, ilahi əmrlərə itaətdən ibarətdir. Bu yolun sonu behişt, misilsiz ne`mətlər və nəhayət, "Allahla görüş"dür. "Saleh bəndələr üçün hazırlananları nə bir göz görmüş, nə bir qulaq eşitmiş, nə də bir qəlb duymuşdur."(١) "Qaf" surəsində buyurulur: "Onlar üçün istədik-ləri hər ".şey vardır

İkinci yolun sonu cəhənnəm, ilahi əzab, yandırıcı od, ən alçaq mərtəbəyə süqutdur. Bu (yolun sonuna çatmış insan elə peşman olur ki, hətta "kaş torpaq olaydım" deyir.(٢

İnsan iki yol ayrıcındadır; bir yol kamal və sonsuz səadətə, digəri isə alçaqlıq və bədbəxtliyə aparır. İnsan bu məqamda olduqca ehtiyatla qədəm götürməlidir. Məhz .bu ehtiyatlılıq "təqva" adla-nır

Bəli, Allah-təala insanı yaratmış və yaxşılıqla pisliyi ona tanıtmışdır: "And olsun nəfsə və onu nizama salana, sonra da ona günahkarlığı və pərhizkarlığı ilham edənə."(٣) Doğru yolu seçənlər mükafata, yanlış yolu seçənlər isə cəzaya çatacaqlar: "Yaxşı iş görənlər on qat artıq mükafata çatacaq, pis iş görənlər həmin qədər (günahları qədər) (cəzalandırılacaqlar və onlara zülm edilməz."(٤



---

.Biharul-ənvar", ٨-ci cild" [١٢]-١

.Nəbəquot; surəsi, ayə: ۴٠" [١٣]-٢

.Şəms" surəsi, ayə: ٧-٨" [١۴]-٣

.Ən`am" surəsi, ayə: ١۶٠" [١۵]-۴

## :DÖRDÜNCÜ DƏRS

## KAMİLLİYİN ZİRVƏSİ ALLAHA YAXINLIQDIR

### KAMİLLİK FİTRİ İSTƏKDİR

And olsun nəfsə və onu nizama salana, sonra günahkarlığı və pərhizkarlığı ona ilham“ edənə, onu təmizləyən kimsə mütləq nicat tapacaq, onu bulaşdıran kimsə isə mütləq (zərərə düşəcək.”(۱)

Yuxarıdakı ayələrdən mə`lum olur ki, nəfs həm tərəqqi edə bilər, həm də süquta uğraya bilər. Əgər təzkiyə və tərbiyə olunsa inkişaf edib bəhrə verər, yox əgər başlı-başına buraxılsa zəifləyib məhv olar. Amma bütün insanlar fitrətən kamillik istəyindədirlər. Naqisliyi sevən insan tapmaq qeyri-mümkündür. Kimsə inkişafdan qalmaq, geriləmək istəmir. Kamilliyə, inkişafa meyl insanın daxilində qoyulmuş böyük ilahi ne`mət-dir. Bu meyl olmasaydı insan yerindən tərpənməz, hərəkətsiz qalardı. İnsanı hərəkətə gətirən mühərrik məhz bu daxili istəkdir. Kainatı yaratmaqda Allahın məqsədi budur ki, insan öz iradə və istəyi ilə kamilliyə ucalsın. Elə bu səbəbdən də .insanın firətində belə bir meyl yerləşdirib

İnsan bə`zən əməli işdə kamilliyin nədə olduğunu səhv salır. Necə ola bilər ki, insan bir yolun cəhənnəmə apardığını bildiyi halda iste`dad, güc, var-dövlətini bu yola sərf etsin? Əksinə, hamı çalışır ki, öz vəziyyətini daha da yaxşılaşdırsın. Sadəcə olaraq kamillik və tənəzzül etməkdən yaxa qurtarmağı hərə bir şeydə görür. Amma bu, göz yumulası səhv deyil və insanı əbədi bədbəxtliyə apara bilər. Belə bir səhvdən nicat tapmaqdan ötrü Allah-təala insana əql verib. Əql yalnız ilahi vəhydən kömək almaqla doğru yolu tanıya bilər. Vəhyin köməyi olmadan əql də həqiqəti tanımaqda acizdir. Beləliklə də Allah-təala insanlara doğru yolu göstərmək üçün peyğəmbərlər göndərmiş və onlara



---

.Şəms” surəsi, ayə: ۷-۱۰“ [۱۶] -۱

müjdə verməklə və qorxutmaqla yanlış yoldan çəkindirmişdir. “Bəqərə” surəsinin ٢١٣-cü ayəsində buyurulur: “Allah bəşarət verən və xəbərdarlıq edən peyğəmbərlər göndərmişdir.”

Bə`zi kamilliklər hamı üçün aydındır. Məsələn, mübahisəsiz qəbul olunan kamilliklərdən biri elmdir. Hamı gözəl başa düşür ki, elm kamal, savadsızlıq isə nöqsandır. Buna görə də hamı elmə hörmətlə yanaşır və hər hansı bir yolla öz biliyini artırmaq istəyir. Heç kim nadan olmağa can atmır, əksinə nadanlıqdan qaçır.

Kamilliyin digər bir nümunəsi qüdrət və gücdür. Zəiflik, acizlik insan üçün nöqsan hesab olunur. Bütün insanlar fitrətən qüdrətli olmağa can atır. Allah-təalanın ən qəti və ən yəqin kamal sifətlərindən biri də qüdrətdir.

İsnanın fitrətən can atdığı şeylərdən biri də səadət və xoşbəxtlikdir. Bədbəxtlik arzusunda olan insan tapmaq çox çətindir. Əqli başında olan şəxs əzab-əziyyət ardınca qaçmır. Bütün bəşəriyyət səadət, ləzzət, rahat-lıq, sakitlik sorağındadır. Belə ki, Allah-təala insanın fitrətində kamilliyə meyllə yanaşı kamillik nümunələrinə də meyl qoymuşdur.

## ALLAHA YAXINLIQ KAMİLLİK ZİRVƏSİDİR

Bəs kamilliyin zirvəsi nədir? Nə zaman insanı tam kamil hesab etmək olar? İlahi peyğəmbərlərin tə`limlərinə əsasən tam kamillik Allaha yaxınlıqdır. Bütün peyğəmbərlər bu nəzəriyyəni tə`lim etmişlər. Eləcə də, Allaha yaxınlıq fitri bir ehtiyacdır. Qeyd etdik ki, hətta müşriklər və bütpərəstlər də Allaha yaxınlığa cəhd etmişlər.(١) Bu da mə`lum oldu ki, insan özündə Allaha yaxınlığın heç olmazsa ən aşağı mərtəbələrini



---

١- [١٧] “Zumər” surəsi, ayə: ٣.

hiss etməsə, bu yaxınlığın həqiqi mə`nasını dərk edə bilməz. Amma bu qaranlıqdan .çıxmaq mümkündür

Biz yaxınlıq dedikdə adətən məkan və ya zaman yaxınlığını təsəvvür edirik. Görənsən Allahla bu cür yaxınlıq mümkündürmü? Allaha zaman və məkanca yaxınlaşmaq ?olarmı

Allah-təala üçün zaman və məkan anlayışları mövcud olmadığından Onunla belə bir yaxınlıq qeyri-mümkündür. Bə`ziləri elə güman edirlər ki, Allah göydədir və insan göyə qalxarsa, Allaha yaxınlaşar. Bu fikir Allah haqqında mə`lumat-sızlıqdan doğur. "Nəcm" surəsinin ۷-۹-cu ayələrində İslam Peyğəmbərinin me`racına işarə ilə buyurulur: "O lap uca üfüqdə idi; sonra yaxına gəldi və aşağı endi, iki yay məsafəsində, yaxud ondan da yaxın oldu." Allah cism olmadığından Onun maddi məkan baxımın-dan Peyğəmbərlə yaxınlığı tam məntiqsiz bir fikirdir. Hansı ki, həmin ayələri dəlil gətirərək Allahın göydə olduğunu iddia edənlər var. Ayədə isə heç şübhəsiz ki, məkan və zamanca yaxınlıq .nəzərdə tutulmamışdır

## ALLAHA YAXINLIĞIN MƏ`NASI

Bə'zi nəzər sahibləri tərəfindən Allahla yaxınlıq məsələsinə dair verilmiş müəyyən tə`riflər zahirən düzgün görünsə də, eybsiz deyildir. Onların fikrincə əvvəl insanın vücudunda çoxlu nöqsan və çatışmazlıqlar mövcud olur. İnsan yaşadığı dövrdə bu çatışmazlıq və naqislikləri vicdana çevirdikcə Allaha yaxın-laşır. Mütləq kamillik yalnız Allah olduğundan insan öz naqisliklərini kamilliyə çevirə-çevirə həmin müləq kamilliyə .doğru hərəkət edir. Məsələn, insan öz elmini artırdıqca Allaha yaxınlaşır

Yuxarıdakı nəzəriyyəni araşdırıb qiymətlən-dirdikdə görürük ki, heç də hər sifətin güclən-məsi insanı ilahi məqama yaxınlaşdırmır. Məsələn, bədənin qüvvə və çəkisinin artımı inkişaf hesab olunsa da, bu inkişafın

ilahi kamilliklə heç bir əlaqəsi yoxdur. Ağırlıq qaldırmaqda, güləşdə dünya çempionu .adı qazananları Allaha yaxın hesab etməyə heç bir əsasımız yoxdur

Bə`ziləri iddia edirlər ki, insanın elmi artdıqca o, Allaha yaxınlaşır. Bütün elmlərdə belə bir xüsusiyyət varmı? Unutmaq olmaz ki, İslam dinində bə`zi elmlərin təhsili haram buyurulmuşdur. İslam isə yalnız insanı Allahdan uzaqlaşdıran şeyləri haram buyurur. .Deməli, yuxarıda zikr olunmuş xüsusiyyət heç də bütün elmərə şamil deyil

Allaha yaxınlığa aparan amillər barəsində olan rəvayətlərin mütaliəsi bizə həqiqəti tapmaqda kömək edə bilər. Mərhum Kuleyninin "Üsuli-kafi"də, Şeyx Bəhainin "Ərbəin"də nəql etdiyi bir rəvayət əxlaq alimləri arasında məşhurdur. İmam Sadiq (ə) :nəql edir ki, həzrət Peyğəmbər (s) buyurmuşdur

Allah-təala buyurur: Mənim dostlarımdan birinə hörmətsizlik edən şəxs Mənə qarşı" müharibə e`lan etmişdir. Mənə yaxınlaşmaq üçün ən gözəl vasitə vacib buyurduqlarıma əməl etməkdir. Bəndəm müstəhəb işləri yerinə yetirməklə Mənə o qədər yaxınlaşar ki, onu sevərəm. Onu sevən zaman ona eşidən qulaq, görən göz, ".danışan dil, işləyən əl olaram. Əgər məndən bir şey istəsə ona əta edərəm

Allahın Öz bəndəsinə qulaq, göz, dil, əl olması olduqca maraqlı görünür. Necə ola bilər ki, Allah insanın dili ilə danışsın? Araşdırmalar göstərir ki, rəvayəein əsl mə`nası zahiri mə`nasından fərqlidir. Zahiri mə`nadan belə çıxır ki, Allah qulaq, göz, dil və əl olur. .Allah maddi olmadığından belə bir iş də mümkün deyil

Rəvayətin əsl mə`na və məqsədi Allahın öz bəndəsinə olduqca yaxınlaşdığını göstərməkdir. Rəvayətdə nəzərdə tutulan bəndə elə bir məqama çatmışdır ki, Allah daim onun yaxınlığın-dadır. Belə bir insan daim Allahın lütf və inayətindən bəhrələnir. Adi insanlar

Allahın xüsusi lütfündən təsadüfən bəhrələndikləri halda rəvayətdə nəzərdə tutulan .insan ilahi lütfə qərq olmuşdur

Hər bir insan öz həyatında az-çox Allahın inayətini, yardımını hiss edir. Allahın öz bəndələrinə inayətlərindən kitab tərtib olunsa bu kitabın cildləri saya-hesaba gəlməz. Gözlənilməz halda çətinliyin aradan qalxması, hər hansı bir işin düzəlməsi Allahın lütf :və inayətindən danışır. Müəllif şahid oluduğu bir neçə hadisəni nəzərinizə çatdırır

Uzun illər Nəcəfdə olmuş tələbə İrana gəldiyi zaman deyirdi: «Atamla anam ixtilaf üzündən ayrıldıqlarından anamı tapa bilmirdim.» Bu tələbə Məşhədə gedib imam Rizanı (ə) ziyarət edir və imamdan anası ilə görüş istəyir. Tələbə deyirdi ki, imamı (ə) ziyarət !edib bayıra çıxanda anamla rastlaşdım

Allah evinin ziyarətindən qayıdan bir şəxs belə nəql edirdi: "Rəcəb ayında Məkkədə "ümrə" əməlini yerinə yetirməyin böyük savabı var. Amma Mədinədə şər`i çətinliyim olduğu üçün Məkkəyə gedə bilmirdim. Müqəddəs bir torpaqda oduğum halda "ümrə"ni əldən vermək mənə ağır gəlirdi. Rəcəbin qurtarmasına iki-üç gün qalırdı. Həzrət peyğəmbərin (s) ziyarətinə gedib dua etdim ki, bu səfərə getməyim üçün şərait yaratsın. Səhəri gün oteldə məni çağırıb, "hazırlaş, maşın gözləyir, Məkkəyə gedirsən" !dedilər

Ərəfə" duasında oxuyuruq: "Ya Rəbb, Öz tədbirinlə məni öz tədbirimdən ehiyacsız et."" Öz ixtiyarınla məni öz ixtiyarımdan ehtiyacsız buyur." Bu duada məqsəd o deyil ki, insan tənbəllik üzündən öz işlərini Allaha tapşırsın. Məqsəd ilahi inayət və yardımdan faydalanmaqdır. Qur`ani-kərimdə buyurulur: "Allaha təvəkkül edən üçün Allah kifayətdir."(۱) Allaha təvəkkül edən bəndə öz vəzifələrini yerinə yetirdiyi



---

۱- [۱۸] "Təlaq" surəsi, ayə: ۳.

halda qəlbən inanır ki, əsil müvəffəqiyyət yalnız Allahın yardımı ilə mümkündür. O, əmindir ki, Allahın iradəsi, istəyi olmadan göstərilən sə`y əbəsdir. Belə insan həm (çalışır, həm də Allaha təvəkkül edir: "İşlərimi Allahın ixtiyarına verirəm."(١

Üsuli-kafi"dən nəql etdiyimiz rəvayətdə də məqsəd Allahın iradə və istəyini hər" şeydən üstün tutan bəndənin məqamını işıqlandırmaqdır. Belə bəndə danışarkən, dinləyərkən, baxarkən, iş görərkən əsil hərəkətverici kimi Allahı tanıyır. Rəvayətin sonunda buyurulur ki, bu bəndə nə istəsə ona verilər. Duaları qəbul olan belə insanlara ."müstəcəbüd-də`və" deyilir

### !?YAXINLIQ, YOXSA YAXINLIĞIN ƏSƏRLƏRİ

Deyilənlər Allahla yaxınlıq yox, olsa-olsa onun əsərləri idi. Yaxınlığın əsəri nişanəsi odur ki, Allah öz bəndəsinin istədiyini verir. Əgər əsər budursa, əsəri yaradan necədir? Qısaca bunu demək olar ki, əsərin yaradıcısı vəsfə gəlmir. Elə vəsfə gəlmədiyindən də .yalnız onun əsərlərindən danışmaqla kifayətlənirik

Əsl yaxınlıq isə Fir`onun arvadı hərzət Asyanın Allahdan istədiyi yaxınlıq idi. Asya sadə bir mö`min yox, yüksək mə`rifət əhli idi. Bu əzəmətli qadın hətta çarmıxa çəkilən zaman bir olan Allahı inkar etmədi. O, belə dua edir: "Pərvərdigara, behişdə Öz yanında mənə bir ev ver."(٢) Əslində Asya nə behişt, nə də behiştdəki evləri nəzərdə .tutur. Asya Allaha yaxın məqam diləyir

Bu məqamlar, həqiqətlər ifadə olunduqları kəlmələrin qəliblərinə yerləşmir. Həqiqət ifadə edildiyi sözdən çox-çox ucadır. Bu mövzunu araş-dırarkən rastlaşdığımız tə`birlərin zahiri yox, əsil mə`nasına diqqət yetirmək lazımdır. "Şə`baniyyə" münacatında



---

.Ğafir" surəsi, ayə: ۴۴" [١٩]-١

.Təhrim" surəsi, ayə: ١١" [٢٠]-٢

deyilir: “Pərvərdigara, ümid və intizarımı Səndən başqa hər şeydən tamamilə üzməyi mənə nəsib et və Sənə doğru aşkar nəzər yetirməkdən ötrü qəlbimin bəsirətini aç ki, (qəlbimin bəsirəti) nur pərdələrini yarmaqla Sənin dərgahının əzəmətini dərk etsin və ”!ruhum müqəddəs izzət nuruna qovuşsun

Bəli, insanın ruhu inkişaf edib elə bir kamala çata bilər ki, nuraniyyət mə`dəninə qoşular, ilahi dərgahda yerləşər. Belə insan artıq özünü unudur və yalnız şüa saçan nur mə`dənini görür. Belə bəndə özünü mütləq pak vücuda bağlı hiss edir. Ariflər bu mərtəbəni “fəna məqamı” adlandırır-lar. Bəli, bəndə öz Allahında fani olub “mən”ini .itirə bilər

Elə bir aşiq təsəvvür edin ki, öz mə`şuqunun eşqi ilə vurnuxur. İllər uzunu çalışır ki, heç olmaya bir dəfə uzaqdan da olsa mə`şuqunu görüb səsini eşitsin. Qəfildən gözünü açan aşiq özünü mə`şuqun ağuşunda görərsə, bundan da böyük ləzzət duya bilərmi? Həzrət Əli (ə) və digər imamlar (ə) “Şə`baniyyə” münacatında Allahdan belə bir məqam istəyiblər. Bəli, aşiq yalnız mə`şuqa qovuşduğu zaman rahatlıq tapar. Nəfsini .tərbiyələndirən bəndə heç şübhəsiz bu böyük səadətə - Allahla yaxınlığa çatacaqdır

## :BEŞİNCİ DƏRS

## KAMİLLİYİN SİRRİ BƏNDƏLİKDİR

### KAMİLLİYİN ZİRVƏSİ

İslam tə`limlərindən aydın olur ki, insanın ruhu həm təkamül, həm də tənəzzül imkanına malikdir. Kamilliyin me'yarı Allaha yaxınlıq-dır. Allaha yaxınlaşma mərtəbələrində addım-addım ucalan insanın ruhu da kamilləşir. Kamilliyin zirvəsinə çatmış insan üçün özü ilə Allah arasında heç bir pərdə qalmır. İlahi nura qovuşmuş insanın diqqəti hər şeydən kəsilir və yalnız Allaha yönəlir. Ariflərin "fəna" adlandırdığı bu məqama çatanlar özünü yaddan çıxarır. Bu insan Allahdan qeyri bütün bağlılıq-lardan azad olur. Və həqiqi səadəti yalnız Allaha yaxınlıqda görür. O, anlayır ki, mütləq varlı Allah, başqa hər nə varsa fəqirdir. "Nəhl" surəsinin ۷۵-ci ayəsində buyurulur: "Heç "?bir şeyə gücü çatmayan qul ilə infaq edən şəxs birdirmi

Fəna məqamını dərk etmək bir qədər çətindir. İnsan üçün ən çətin və ən uca mərtəbə odur ki, tam asılı olduğunu dərk etsin. Asılılığın bu sayaq dərki kamillik zirvəsində mümkündür. Əgər insan belə bir mə`rifətə çatarsa Allahdan asılılı-ğını tam hiss edər və kamilliyin ən ali zirvəsinə nail olar. Belə bir mə`rifət isə yalnız "hüzuri elm"lə (Allahın .insanın qəlbinə əta etdiyi elm nuru) əldə edilə bilər

### İLAHİ MƏQAMA ÇATMAQDA BƏNDƏLİYİN ROLU

Maraqlıdır ki, qeyd olunan məqama hansı yolla çatmaq olar? Ayə və rəvayətlərdən məlum olur ki, insan bu məqama yalnız ibadət yolu ilə çata bilər: "Cin və insanları Mənə ibadət etməklərindən ötrü yaratdım."(۱) İnsan Allahın nəzərdə tutduğu ibadət



---

.Zariyat" surəsi, ayə: ۵۶" [۲۱] -۱

vasitəsi ilə məqama nail ola bilər. Ayədə kamillik üçün ikinci yol göstərilməyib. Amma nəzərə almaq lazımdır ki, ayədə işlədilmiş ibadət kəlməsi fiqh elmində nəzərədə tutulmuş ibadətdən fərqlənir. Ayədə elə bir ibadətdən danışılır ki, bu ibadət Allahın razılığını qazanmaq məqsədi ilə görülmüş bütün işləri özündə birləşdirir. "Yasin" surəsinin ۶۰-۶۱-ci ayələində oxuyuruq: "Ey Adəm övladı, Məgər sizdən əhd almadımmı ki, şeytana ibadət etməyəsiniz? Axı o sizin açıq-aşkar düşmə-ninizdir! Mənə ibadət edin, doğru yol budur!" Bir sözlə, insan yalnız bir yolla kamala yetişə bilər və bu yol Allaha ibadətdir. Allaha ibadət sayılmayan bütün başqa işlər şeytana itaət hesab olunur. "Zariyat" surəsinin ۵۶-cı ayəsində işlə-dilmiş "yalnız" kəlməsi bir daha göstərir .ki, bəşəriyyət üçün hədəf və bu hədəfə aparan yol birdir

### ?ALLAHIN BİZİM İBADƏTİMİZƏ EHTİYACI VARMI

Allah insanı ibadət üçün yaradıb" dedikdə nə nəzərdə tutulur? İnsanların ibadətinə," səcdəsinə Allahın ehtiyacımı var? İnsan özünə qarşı ehtiram görəndə qəlbi açılır. ?Görən Allah da ehtirama möhtacdırmı

Bütün bu suallar Allahı tanıyan insan üçün öz qənaətbəxş cavabını tapmışdır. Allah mütləq kamal sahibi və mütləq ehtiyacsızdır. İnsanın yaradılması və ibadət edib-etməməsi Allaha bir şey artırıb-əskiltmir. Tənhalıqdan əziyyət çəkmək naqis vücuda xas sifət olduğundan yaranışı Allahın tənhalığı ilə də əlaqələndirmək olmaz. Həzrət Əli (ə) "Nəhcül-bəlağə"də buyurur: "Allah məxluqu onun ibadətin-dən ehtiyacsız, ".itaətsizliyindən amanda olduğu halda yaratdı

Allah insanın ibadətindən ləzzət almadığı kimi, onun üsyanından da əziyyət çəkmir. Allahıtanıma bəhslərində oxuyuruq ki Allahın sifətləri özünəməxsusdur. Yə`ni səh:۳۲

əgər eyni bir sifət Allahda və insanda varsa bu sifətlər arasında fərq vardır. Məsələn, Allahın elmi insanın elmindən fərqlənir. İnsanın elmi “hüsuli”, yə`ni öyrənməklə əldə edilmişdir. Amma Allahın elmi “hüzuri”dir, yə`ni Allah zatən alimdir. İnsanın qüdrəti, gücü inkişaf etmiş əzələlərdən ibarətdirsə, cism olmayan Allahın qüdrəti tamam başqa .məzmundadır

Allahın razılığı və qəzəbi də insanın razılıq və qəzəbindən fərqlənir. Əgər insan razı qalanda şadlanırsa, Allah şadlanmaq halından çox uzaqdır. “Ərəfə” duasında oxuyuruq: “Pərvər-digara, Sənin rizayətin müqəddəsdir və heç bir səbəbə bağlı deyil. Belə deyil ki, əvvəl Sənin rizayətin mövcud olmayıb, Sən onu sonradan xəlq etmişsən, o ki, qaldı mən Sənin rizayətinə səbəb olum.” Allahın qəzəbi də belədir. Bu qəzəb onun halını dəyişmir. Allah üçün hal dəyişməsi qeyri-mümkün olduğundan insan bu halı .dəyişməkdə acizdir

### BƏNDƏLİK MƏQAMINA NAİL OLMAĞIN YOLU

Qeyd etdik ki, kamilliyin zirvəsi Allaha yaxınlıq, bu zirvəyə aparan yol isə ibadət və bəndəlikdir. Bəndəliyin mə`nası Allaha bəndə, yə`ni qul olmaqdır. Kamillik odur ki, insan Allahın iradəsi olmadan heç nəyə qadir olmadığını anlasın. Nə qədər ki, Allahla bəndə arasında pərdələr mövcuddur, həqiqəti dərk etmək qeyri-mümkündür. Allaha bağlı olduğunu qəlb gözü ilə görən insan bütün hərəkət və fəaliyyətində Onun tə`sir .qüvvəsini hiss edir

Belə bir məqama çatmaq üçün ilk addım insanın özünü Allahın iradəsinə tabe etməsidir. Adi insanlar öz

iradəsini müstəqil bilir. Belə ki, çoxlarının istəyi Allahın istəyindən fərqlənir. Nə qədər ki, insan üçün iki iradə mövcuddur, o, özünü azad hiss edir. Allahlıq iddiasına düşən Fir`on da özünü azad bilirdi. Fir`onun adi bəndələrdən fərqi azadlıq hissində ifrata varması idi. Əlbəttə ki, bu azadlıq həqiqi azadlıq deyil. Həqiqi azadlıq Allaha qul olub başqala-rının əsarətindən çıxmaqdır. İnsanın öz nəfsinə və özü kimi insanlara tabe olub Allahın qanunlarına itaət etməməsi bu günkü dünyada azadlıq hesab olunsa da, həqiqətdə əsl əsarətdir. Amma Allah insana buyurur: “Səni azad yaratdım, başqalarına qul olma!” Söhbətimizdəki azadlıq da məcazi mə`na daşıyır. “Allahın istəyinin mənə dəxli yoxdur” deyən insanın özünə elə gəlir ki, o azaddır. Bəndəlik odur ki, insan həqiqəti, yə`ni hər şeyin Allah iradəsindən asılı olduğunu anlayır. Nəfsin azadlığı bəndəliklə bir araya sığmır. Bəndəlik yolunda irəliləyən insan nəf-sini cilovladıqca kamal məqamına yaxınlaşır. Kamillik zirvəsinə çatdıqda isə nəfs unudulur və insan Allahın iradəsi ilə .”“nəfəs alır

Əgər bəndəlik məqamına çatmaq istəyiriksə, bizi bədbəxtliyə sürükləyən nəfsani istəkləri bir kənara qoyub Allahın istəklərini mehvər seçmə-liyik. Şəriətdəki vacib əməllər və haramlar ilahi istəyin təcəssümüdür. Bu hökmlərə əməl etməklə insan Allah .iradəsinə təslimini möhkəmləndirir

### BƏNDƏLİK BUXOV DEYİL

İslam tə`limlərinə əsasən, bəndəlik buxov və məhdudiyyət demək deyil. Bəndəlik o deyil ki, insanın heç bir şəxsi nəzəri olmasın. Bəndəliyin müxtəlif mərtəbələri vardır. Həzrət Əli (ə) buyurur: “İbadət üç növdür: qulların ibadəti, tacirlərin ibadəti, azad insanların ibadəti. Bir qrup insan Allaha cəhənnəm əzabı qorxusundan ibadət edirlər— bu, qulların ibadəti-dir. Digər bir qrup Allaha behişt tamahı ilə ibadət

edir—bu, tacirlərin ibadətidir. Bir qrup da var ki, Allaha pərəstişə layiq olduğu üçün ".ibadət edir—bu, azadların ibadətidir

İslam bu ibadətlərin heç birini rədd etmir. Əsas məsələ Allahın iradəsinə tabe olmaqdır. Əlbəttə ki, əsl bəndə Allahı ibadətə layiq bilərək azadanə ibadət etməlidir. Bir hədisdə buyurulduğu kimi, Allaha cəhənnəm qorxusu və behişt tamahı ilə yox, Onu ibadətə layiq bilərək pərəstiş etmək lazımdır. Belə abid əsl aşiqdir. Onu Allah qarşısında vadar edən mə`rifət və məhəbbətdir. Belə insan Allaha tərəf bir addım atdıqda, Allah ona on addım yaxınlaşır. Belə bəndə gecənin qaranlığı və gündüzün .işığında Allahla ünsiyyətdən ayrılmır

## BƏNDƏLİYİN MƏRTƏBƏLƏRİ

Qeyd etdik ki, insanı yaranış hədəfinə çatdıracaq yeganə yol bəndəlikdir. “Şə`baniyyə” münacatında mə`sum imamların istədiyi məqam həqiqi bəndəlk məqamıdır. Allahın dərgahında izzət nuruna qovuşmaq istəyənlər Onunla öz aralarında olan rabitəni gücləndirməlidirlər. Əlbəttə, insanın varlığının özü Allahla rabitədir. Sadəcə olaraq biz bunu dərk etmirik. Belə bir dərketmə hüzuri elm vasitəsi ilə mümkündür. Bunu dərk etməyən insan özü kimi kimdən və nədənsə asılı olan min bir vücuda bağlanır. Amma Allaha bağlanan kəs bütün səmərəsiz bağlılıqlardan azad olur. Bu mərtəbəyə qalxmış bəndə Allahdan qeyrisini görmür və Ondan qeyrisinin ətəyindən yapışıb kömək .istəmir

Bəndəliyin digər bir mərtəbəsində insan Allaha ibadət edir, iradəsini Allahın iradəsinə tabe edir. Bu bəndə anlayır ki, Allah onun səadət şərtlərini daha yaxşı bilir. Deyilənləri dərk edərək yerinə yetirilən ibadət şəksiz ki, qəbuldur. Allah yalnız insanın xeyri üçün nəyi isə vacib, nəyi isə haram buyurur. Bunu anlayan insan vacibə əməl edib haramdan çəkinir. Amma bu ibadət

Həzrət Əlinin (ə) buyurduğu ibadət deyil. Çünki bu mərtəbədəki bəndə öz xeyirini düşündüyü üçün Allahın iradəsinə tabe olur. Belə itaət həkimin göstərişinə itaət kimidir. Xəstə həkimin sevdiyi üçün yox, öz sağlamlığını qorumaq istədiyi üçün ona itaət edir. Belə bir ibadət “azadanə” olmasa da qəbuldur. Amma bu ibadətdə .özünəpərəstiş əlamətləri var. Onu tacirlərin ibadətinə aid etmək olar

Hürr insanlar isə ibadət zamanı özlərini düşünmürlər. Onlar üçün ən mühüm məsələ mə`şuq qarşısında boyun əyməkdir. Mə`sum imamlar məhz bu sayaq ibadət etmişlər. Onlar Allahı ibadətə layiq bildikləri üçün ona səcdə edirlər. İmam Zeynül-abidin (ə) belə dua edir: “Xudaya, məni təkrar-təkrar cəhənnəmə aparıb oda çəksən də məhəbbətindən əl götürmərəm.” Mə`sumların mə`rifəti ilə bizim mə`rifətimiz arasındakı fərq aydın görünür. İstəyimiz həyata keçməyəndə necə də dilxor olur, naşükürlük edirik! Allah insana Onun xəlifəsi olmaq iste`dadını vermişdir. Bu məqama .çatan insan Allahdan qeyrisini görmür, Allahdan qeyrisini köməyə çağırmır

Belə bir məqama çatmaq arzusunda olub çalışan insanlar üçün mümkündür. İnsan aşağı mərtə-bədən başlayıb addım-addım yuxarı qalxmalıdır. İlk addımda öz iradəmizi Allahın iradəsinə tabe edib nəfsin istəyini yox, Allahın istəyini yerinə yetirməliyik. Növbəti addımda öz razılığımızı Allahın razılığına tabe edib onun razılığına fədakarlıqla çalışmalıyıq. Kamillik zirvəsinə çatmaq üçün təkrar-təkrar sə`y göstərmək lazım gəlir. İnsan hər bir söz, hər bir hərəkətindən qabaq Allahın razılığını düşünməlidir. Bir dəfə nəfsi azad buraxmaq insanı xeyli geri atır. Amma çox-çox sə`y göstərənlərin işini Allah öz öhdəsinə götürür, öz zikri ilə bəndənin qəlbini işıqlandırır. Bəli, Allahın lütfünün nazil olduğu məqam vardır. “Sad” surəsinin ۸۲-۸۳-cü ayələrində oxuyuruq: “Şeytan dedi: And

olsun Sənin izzətinə müxlis bəndələrindən savayı hamısını azdıracağam.” Qur`ani-kərim təsdiq edir ki, yalnız Allahı görən, yalnız Allahdan istəyən, yalnız Allahın iradəsi və razılığına tabe olan xalis bəndələr vardır. Onlar danışarkən, dinləyərkən, baxarkən, iş görərkən, hətta düşünərkən Allahın razılığını əsas götürürlər. Belə bəndənin həyatının hər dəqiqəsi ibadətdir. İbadət təkcə namaz və oruc deyil. Namaz və orucu ibadət edən bəndənin Allah iradəsinə tabe olmasıdır. Əgər bir insan namaz qılıb oruc tutmaqla Allahı yox, bir başqasını razı salmaq istəyirsə belə namaz və oruc ibadət sayılmır. Əksinə, Allahı razı salmaq üçün bir insanın acı sözünə səbr edən bəndə üçün bu səbr ibadətdir. Bəli, insan qəlbindən bütün bütləri qovub yalnız Allaha pərəstiş edə bilər. “Ən`am” surəsinin ٧٩-cu ayəsində buyurulur: “(İbrahim dedi) mən, həqiqətən, müvəhhid olaraq üzümü göyləri və yeri yaradan şəxsə tərəf döndərmişəm və mən müşriklərdən deyiləm.” Həmin surənin ١۶٢-ci ayəsində oxuyuruq: “De ki, namazlarım, ”.ibadətlərim, diriliyim və ölülüyüm aləmlərin Rəbbi olan Allah üçündür

## :ALTINCI DƏRS

## ÖZÜNƏPƏRƏSTİŞ SÜQUT AMİLİDİR

### ƏVVƏLKİ MÖVZULARA BİR BAXIŞ

Mövzumuz Qur`an və İslam baxımından nəfsin tərbiyəsi məsələsi idi. Qeyd etdik ki, ayə və rəvayətlərə görə nəfsin tərbiyəsində məqsəd Allaha yaxınlaşmaqdır. Eləcə də, .bu yaxınlığa bəndəlik yolu ilə çatmaq olar

Deyildi ki, insanın kamilliyi ixtiyaridir, yə`ni onun öz ixtiyarındadır. İxtiyari işdə isə insanın qarşısında hökmən iki və ya daha artıq yol olmalıdır ki, seçim aparmaq mümkün olsun. Buna görə də Allah insanın qarşısında iki yol – xeyir və şər yollarını qərar verib və əvvəlcədən bu iki yolu öz bəndəsinə tanıtdırıb. İnsanın təkamül və tənəzzülü onun öz ixtiyarındadır. İnsanın doğru yolu seçməsi üçün Allahın onu hidayət etməsi zəruridir. Amma insanın özünün təkamül istəyi yoxdursa onun kamilləşməsi qeyri-mümkündür. Şeytan isə insanı daim süqut yoluna sürükləyir. O, insanın alçaq məxluq olduğunu sübuta yetirəcəyini və`d edir: “And olsun izzətinə, onların hamısını (azdıracağam.”(١

Kamillik zirvəsinə çatmış insan Allahla özü arasında olan bütün pərdələri qaldırır. Bu məqama çatmış insan dərk edir ki, Allahdan uzaqlıq miskinlik, Allaha yaxınlıq isə ehiyacsızlıqdır. Belə bir məqam Allaha yaxınlığın zirvəsidir. Bu məqama nail olmuş bəndə üçün Allahın iradə və istəyindən kənar şəxsi iradə və istək yoxdur. Belə bir məqama çatmayan insana üçün onu dərk etmək mümkün deyil. Belə bir ali məqama çatmaq hər insana müyəssər olmasa da, zirvə nöqtəsini daim



---

.Sad” surəsi, ayə: ٨٢“ [٢٢] -١

diqqət mərkəzində saxlamaq lazımdır ki, doğru yol itirilməsin. Məsələn, insan bir dağın .zirvəsinə çıxa bilməsə də, zirvəni gözdən itirməyibsə ona doğru hərəkət edə bilir

**ƏN DƏRİN SÜBUT**

Əgər kamilliyin zirvə nöqtəsi hər şeyi Allahdan bilməkdirsə, süqutun son nöqtəsi insanın hər şeyi özündən bilməsidir. Yə`ni kamil insan üçün Allahın iradə və istəyi hər şeydən üstündürsə, naqis insan üçün hər şeydən üstün öz şəxsi iradə və istəyidir. Naqis insan hamını özünə tabe etməyə çalışır. O belə bir əqidədədir ki, kimsəyə təslim olmamalı, kimsənin sözünü dinləməməlidir. Bəli, hər addımda öz acizliyini görən insan elə bir həddə alçala bilər ki, bilərəkdən və ya bilməyərəkdən öz acizliyini inkar edər. Bəli, insan bə`zən günəşlə üzbəüz durduğu halda gözlərini yumub onu inkar edir. Hər an Allahın mərhəmətinə şahid olan bəndənin Onu inkar etməsi mümkündür. Bu nahaq inkarın əsl səbəbi eqoizm, özünəpərəstişdir. Əlbəttə ki, özünəpərəstişin də mərtəbələri vardır. Bu çirkin sifətin son həddinə alçalmış insan özünü Allah hesab edir. Nəfsinə uymuş Fir`on dedi: “Sizin ən böyük rəbbiniz mənəm.”(١) Həzrət Musa (ə) Fir`onun yanına gedib ona Allaha iman gətirməyə də`vət edəndə Fir`on Allahın kimliyi və harada olduğu və Musanın peyğəmbərliyi barədə sual verdi. Musa (ə) buyurdu ki, Allah mənə mö`cüzələr verib. Sonra mö`cüzəli əsa və işıqlı əlini Fir`ona göstərdi. Əsanın əjdahaya çevrildiyini görən Fir`on dəhşətə gəldi və Musadan düşünmək üçün möhlət istədi. Sonra həqiqəti axtarırmış kimi uca bir bürc tikdirib həmin bürcdən səmada Allahı axtarmağa başladı. “Ğafir” surəsinin ٣٦-٣٧ surəsində oxuyuruq: “Ey Haman (vəzir), mənim üçün üstü açıq bir qəsr



---

.Naziat” surəsi, ayə: ٢٤“ [٢٣] -١

tik, bəlkə, o yollara yetişəm; göylərin yoluna və Musanın Allahına tərəf boylanıb baxam. Doğrusu, mən onu çox yalançı zənn edirəm.” Fir`on Allahı göydə axtarsa da tapa bilmədi və üzünü camaata tutub “özümdən başqa Allah tanımıram” dedi. Həzrət Musa (ə) Fir`ona xitabən buyurdu: “Yə`qin ki, sən bunların göylərin və yerin Rəbbi tərəfindən nazil olduğunu bilirsən.”(١) Ayə diqqəti bu nöqtəyə yönəldir: Fir`on əmin idi ki, Allah var və Musa bir Allahın elçisidir. Bununla belə, həqiqəti inkar edir, Musanı yalançı adlandırırdı. Deyilənlər insanın nə dərəcədə alçala bildiyinə bir sübutdur. Bəli, insan həqiqəti bildiyi halda, öünəpərəstiş ucbatından bu həqiqəti inkar edə bilər. Əlbəttə ki, gözünü yummaqla günəşi inkar edənlər çox deyil. Amma Qur`an bildirir ki, .beləlləri var və gələcəkdə Fir`ondan da artıq alçalanlar ola bilər

## YÜKSƏLİŞ VƏ SÜQUTUN MƏRTƏBƏLƏRİ

Yüksəliş və süqut insanın qarşısında açılmış iki yoldur. Allahın iradəsini üstün tutanlar yüksəliş, öz iradəsini üstün tutanlar süqut yolunun yolçusu olur. Yüksəliş yolunu tutanlar Allahın istəyini özləri üçün daha faydalı bilərək Ona təvəkkül edirlər və bu məqama çatmış insan öz vücudunu Alahın varlığına bağlı bilir. O, anlayır ki, bütün kainat Allahın iradəsi ilə hərəkət edir və Allah nəzərini çəkərsə, aləm məhv olar. “Yasin” surəsinin ٨٢-ci ayəsində oxuyuruq: “Bir şeyi iradə etdiyi, istədiyi zaman Allahın ”.əmri yalnız “ol” deməkdir, o da olar

Yüksəliş yolunun ziddi olan ikinci yol insanın tənəzzül, süqut yoludur. Bu yolun yolçusu öz istəyini hər şeydən üstün tutur və nəhayətdə Allahlıq eşqinə düşür. O, bütün dünyanı özünə səcdəyə çağırır. Yüksəliş zirvəsi ilə süqutun son nöqtəsi arasında -saysız



---

.İsra” surəsi, ayə: ١٠٢“ [٢۴] -١

hesabsız mərtəbələr vardır. Xalis bəndəlik məqamına çatmamış istənilən bir insanda tövhid və şirk, xeyirlə şər qatışıq haldadır. Allaha, peyğəmbərlərə və qiyamət gününə iman gətirən insanların əksə-riyyəti bu haldadır. Onların imanında cüz`i də olsa şirk ləkələri vardır. Bu şirk insanı cəhənnəmə aparmaq gücündə olmasa da təhlükəlidir. İnsanın özünə diqqətsizliyi həmin şirki gücləndirə bilər. Mə`rifətli insanlar isə daim bu .məsələyə diqqətlidirlər

Məşhur İslam alimi mərhum Şeyx Ənsari vəsiyyətində rica edir ki, ömür boyu qıldığı bütün namazların qəzasını qılıb təzələsinlər. Çox maraqlıdır! Yaxınlarından biri soruşur ki, ağa, məgər sizin qəza namazınız var? Şeyx Ənsari buyurur: “Mən namazdan çox ləzzət alırdım. Qorxuram ki, bu ləzzətlər niyyətimə tə`sir göstərsin, namazlarım Allaha yaxınlığa görə yox, ləzzətə görə olsun!” Bu sözlər bə`zilərinə nağıl kimi də görünə bilər. Amma unutmayaq ki, çoxları-nı nadan vəziyyətdə saxlayan onların həqiqətə nağıl kimi yanaşmasıdır. Şeyx Ənsari kimi şəxsiyyətlərin böyüklüyü ondadır ki, ən incə məsələlər .də onların nəzərindən yayınmır

### ŞİRK VƏ GİZLİ KÜFR

Şeyx Ənsari namazdan aldığı ləzzətdən ehtiyat edirdi. Hansı ki, əksər abidlərin arzusu belə bir ləzzətə çatmaqdır. Əgər mə`rifət əhli ilə sadə abid arasında bir bu qədər fərq varsa, mə`rifətlə cəhalət arasındakı fərqdən danışmağa dəyməz. Şeyx ehtiyat edirdi ki, namazdan aldığı ləzzət onunla Allah arasında pərdə ola. Əgər doğrudan da həmin ləzzət insanın ilahi niyyətinə xələl gətirərsə, gizli şirk hesab olunar. Belə bir şirk insanı cəhənnəmə aparmasa da, təkamül yolunda maneədir. “Yusuf” surəsinin ۱۰۶-cı ”.ayəsində oxuyuruq: “Onların çoxu ancaq şərik qoşaraq Allaha inanırlar

Hər halda, bu qəbildən olan şirklər gizli və zəifdir. Eləcə də övliyalardan savay əksər insanlarda mövcuddur. Əgər özümüzə diqqət etsək bir çox ibadətlərimizdə bu mənfi halı müşahidə edərik. Əksəriyyətimiz çox təsadüfən namazımızı qəlbin iştirakı (hüzuri-qəlb) ilə qılırıq. Qəlbin iştirak etmədiyi namaz tam faydasız olsaydı, yə`qin ki, çoxumuz namazdan uzaqlaşardıq. Amma Allaha xatir görülən iş gizli şirkə malik olsa da səmərəsiz deyil. Təkamülə üz tutmuş yolçuların dərəcələri müxtəlifdir və hər dərəcənin öz gizli şirki var. Şeyx Ənsari kimi şəxsiyyətlər bizim həsrətində olduğumuz ibadət ləzzətindən xoflanırlar. Bir daha qeyd edək ki, gizli şirk Allahın qəzəbinə səbəb olan şirk deyil. "Nisa" surəsinin ۴۸-ci ayəsində buyurulur: "Allah ona şərik qoşanları bağışlamaz." Ayədə nəzərdə tutulan şirk insanın bütün saleh əməllərini puça çıxaran şirkdir. "Nur" surəsinin ۳۹-cu ayəsində oxuyuruq: "Kafirlərin əməlləri düzənlikdəki ilğıma bənzər, susayanlar onu su bilib yaxınlaşdıqları zaman orada heç nə tapa bilməzlər." Küfr və şirkin ali mərtəbəsi Fir`onda idi. Amma adi insanlarda müşahidə .olunan şirkin zəif bir halıdır və insan bu halın güclənməməsi üçün diqqətli olmalıdır

Şirkin gizli formasını daşıyan insan Fir`on kimi Allahlıq iddiası etmir. Amma onda da Fir`on kimi insana sərf eləməyən həqiqətə qarşı inkarçılıq mövqeyi müşahidə edilir. "Küfr" "örtmək" mə`nasını verir. Kafir həqiqətin üstünü örtən insana deyilir. Əgər biz əhəmiyyətsiz də olsa bildiyimiz həqiqəti inkar ediriksə hansısa səviyyədə küfrə yol veririk. Bu küfr zəif halda qorxulu olmasa da nəzarətsiz buraxılıb güc-lənərsə imanı kökündən qoparar. Ona görə də imanlı insan nəfsinə qarşı çıxmaqla gizli küfrü daha da zəiflətməlidir. Gizli küfr bir növ kiçik Fir`ondur. Bu kiçik Fir`ona meydan verən şəxs bir .gün özünü Allah da hesab edə bilər

## SÜQUTUN KÖKÜ ÖZÜNƏPƏRƏSTİŞDİR

Bütün küfrlərin əsası öünəpərəstişdir. İnsan gizli və ya açıq küfrün hansı mərtəbəsindədirsə həmin mərtəbəyə uyğun özünəpərəstişə düçardır. Gördüyümüz işin təkamülə və ya tənəzzülə apardığını tə`yin etmək üçün bu işin kimin istəyi ilə görüldüyünü müəyyənləşdirməliyik. Allahın istəyi ilə görülən iş isə insanı təkamülə, nəfsin istəyi ilə görülən iş süquta aparır. Bə`zi mərtəbələrdə özünəpərəstiş o qədər .gizli ola bilər ki, nəzərdən yayınar

Hər halda nəfsin hiylələrinə qarşı diqqətli olmaq lazımdır. Nəfs bə`zən özünəpərəstişi gizləmək üçün yalançı məntiqlə müəyyən dəlillərdən istifadə edir. Hələ ilk yaranışda Adəmə səcdə etməkdən boyun qaçıran İblis Adəmə səcdənin yanlış addım olmağını .dəlil gətirmişdi. Nəfs də müxtəlif elmi məsələlərlə insanı aldada bilər

Yaşadığımız dövrdə özünəpərəstişə yoluxub imanını əldən verən çox şəxsiyyətlər görmüşük. Onlar elmi dəlillər gətirərək öz yanlış fikir-lərinə həqiqət donu geyindirməyə çalışırlar. Hətta uzun illər dini mərkəzlərdə təhsil alanlar arasında da nəfsin hiyləsinə aldananlar tapılır. Qırx il dini elmlərlə məşğul olan alim “iman yəqinlə bir araya sığmır” iddiası ilə çıxış edir. O, Qur`ana istinad edərək Qur`anın ziddinə hökm çıxarır. Guya, insan yalnız bilmədiyi məsələyə iman gətirə bilər. Hansı ki, Allah-təala açıq-aşkar şəkildə inam məsələsində zənn və gümanı məzəmmət edərək insanları yəqinliyə çağırır. Qur`an inam məsələsində şübhəni eyb kimi tanıtdıraraq yəqinliyi olmayanları zəif düşüncəli hesab edir. “Nəml” surəsinin ۶۶-cı ayəsində ”.oxuyuruq: “Olsun ki, onların axirət haqqında elmləri yetərsizdir

səh:۴۳

### İMAN VƏ YƏQİNİN ƏLAQƏSİ

Peyğəmbər və mə`sum imamlar öz də’vətlərində şəkk-şübhədən qurtularaq yəqinlik əldə etmək məsələsinə xüsusilə tə’kid etmişlər. “Biharul-ənvar”ın ٧٠-ci cildində belə bir rəvayət nəql olunur: “Bir gün sübh çağı peyğəmbər məscidə daxil oldu. Məsciddə gördüyü gəncin pərişan-lığı onun diqqətini cəlb etdi. Həzrət (s) cavandan soruşdu: “Sübhü necə açdın?” Cavan ərz etdi: “Sübhü yəqinlik halında açdım.” Həzrət buyurdu: “Yəqinliyinin əlaməti nədir?” Cavan ərz etdi: “Sanki ne`mətə qərq olmuş behişt əhlini və əzaba düçar olmuş cəhənnəm əhlini görürəm, gözümün yuxusu ərşə çəkilib.” ”.Peyğəmbər ona dua etdi: “Allah səni bu halda sabit saxlasın

Bəli, Allah Öz bəndələrindən yəqinliyə çatmış iman istəyir. İnsan behişt və cəhənnəmi görürmüş kimi iman gətirməlidir. Yəqinliyin də dərəcələri vardır: elmül-yəqin, eynül-yəqin, həqqül-yəqin. Bütün bu deyilənləri çox gözəl bilən bir alim “iman yəqinlə bir !araya sığmır” deyir! Aman nəfsin əlindən

Bu ziddiyyətin sirri nədir? Yalnız və yalnız özünəpərəstiş! “Casiyə” surəsinin ٢٣-cü ayəsində buyurulur: “Həva-həvəsini özünə tanrı edəni və öz elmi ilə zəlalətə düçar olmuşu, qulağı və qəlbi möhürlənmişi və gözünə pərdə çəkil-mişi gördünmü? Onu ”!?Allahdan başqa kim hidayət edəcək

### ?ALİM YOLUNU AZA BİLƏRMİ

Əsas məsələ nəfsə tabe olmaqda, həvəs ardınca getməkdədir. Hər kəs, hətta alim olmasına baxmayaraq özünü Allahla bir edib nəfsini özünə tanrı edərsə Allah onu yolundan azdırar. Təbiidir ki, Allahın kimsə ilə düşmənçiliyi yoxdur. Sadəcə olaraq nəfs ardınca getməyin təbii nəticəsi zəlalətdir. “Yunis” surəsinin ۴۴-cü səh:۴۴

ayəsində buyurulur: “Allah insanlara əsla zülm etməz. Lakin insanlar özləri-özlərinə zülm edərlər.” Allah-təala peyğəmbərlər vasitəsi ilə insanlara lazımınca xəbərdarlıq etmiş, nəfsin cilovunu buraxacaqları təqdirdə süquta uğrayacaq-larını bildirmişdir. Bu xəbərdarlıqları qulaqardına vuranların zəlaləti əvvəlcədən bildik-ləri təbii nəticədir. Allah və Onun göndərdiyi peyğəmbərlər nə qədər mərhəmətli olsalar da özüözünə mərhəmət etməyən insana çarə yoxdur. “Nəcm” surəsinin ۲۹-cu ayəsində oxuyuruq: “(Ya Muhəmməd!) Bizim zikrimizdən üz döndərib dünya həyatından başqa bir şey istəməyən kim-sədən üz çevir.” Belə insanlar bütün qapıları özləri öz üzlərinə bağlayırlar. Allahın və peyğəmbərin onları qorxutmasının heç bir faydası yoxdur. “Yasin” surəsinin ۱۰-cu ayəsində buyurulur: “Onları qorxutsan da, qorxutmasan da heç ”.bir fərqi yoxdur, iman gətirməyəcəklər

Mən Corc Buşa mə`sum imamlardan çox inanıram” deyən şəxsdən nə gözləmək“ olar?! Belə insanı doğru yola necə gətirmək olar? Nəsihət, həqiqətən, qorxan insana .tə`sir edir. Allahdan qorxmayan şəxsi hidayət etmək qeyri-mümkündür

## :YEDDİNCİ DƏRS

## İNSANİ ŞƏXSİYYƏT AXTARIŞINDA

### QƏFLƏT İNSANLIĞA ZİDDİR

Əvvəlki mövzularda qeyd etmişdik ki, insan özünü tərbiyələndirməkdə azaddır və .ağac kimi bağbana möhtac deyil. Eyni zamanda insan tərbiyə yolunu özü seçir

Fəlsəfədə sübut edilib ki, ixtiyari hərəkətin əsasını elm və agahlıq təşkil edir. Azad insan düşüncəsində təsəvvür və müəyyən olunmuş işi görür. Deməli, tərbiyə də elm və agahlıqdan asılıdır. İnsanın tərbiyə haqqında təsəvvürü yoxdursa onun tərbiyələnməsi də qeyri-mümkündür. Allaha yaxınlığa doğru təkamül fəaliyyətinə başlamaq üçün ilkin şərt agahlıq və bu işdə ilkin düşmən agahlığın ziddi olan qəflətdir. Qafil insan nəinki öz ilahi məqamından, hətta coğrafi mövqeyindən də xəbərsizdir. Məhz bu səbəbdən Qur`ani-kərim insanın bir çox məhru-miyyətlərinin səbəbini onun qəfləti ilə əlaqədar olmasını bildirir. “Ə`raf” surəsinin ۱۷۹-cu ayəsində buyurulur: “Şübhəsiz ki, biz cinlərin və insanların çoxunu cəhənnəm üçün yaratmış olduq. Onların qəlbləri var, amma anlamaz, gözləri var, amma görməz, qulaqları var, amma eşitməzlər. Onlar heyvan kimidirlər, bəlkə də, daha çox zəlalətdədirlər. Qafillər də məhz onlardır.” Ayədən

göründüyü kimi, çoxlarının cəhənnəmə vasil olmasının üç xas səbəbi var: qəlbləri olduğu halda həqiqəti anlamırlar, göz-ləri olduğu halda həqiqəti görmürlər, qulaqları olduğu halda həqiqəti eşitmirlər. İslam dinində qəlb, göz və qulaq agahlıq, tanıma, mə`rifət vasitəsi hesab olunur. Deмək, insanın bədbəxt-çiliyinin ən mühüm səbəblərindən biri bu vasitələrdən düzgün istifadə edilməməsidir. Bu duyğu üzvləri hər bir heyvanda da var. Sadəcə olaraq heyvani istəklər yolunda istifadə olunur. İnsanı heyvandan fərqləndirən onun daxilindəki kamillik meylidir. Əgər insan da heyvan kimi həmin üç alətdən kamillik yox, nəfsani istək-lərinə çatmaq üçün istifadə edərsə heyvandan heç bir fərqi olmaz. Belə insan, bəlkə, heyvandan da pisdir. Çünki onun əql .kimi daxili peyğəmbəri var

## ÖZÜNDƏN XƏBƏRSİZLİK

Belə bir sual yaranır ki, yuxarıda zikr olunmuş ayədə söhbət mütləq qəflətdən gedir, yoxsa sadəcə qəflətdən? Sözsüz ki, məqsəd ani bir qəflət deyil. Çünki insan, adətən, bir çox şeylərdən agah olmur. Hər hansı bir şüurlu varlığın hər zaman hər şeydən agah .olması çətin məsələdir

Ayədə məqsəd mütləq qəflət də deyil. Yə`ni şüurlu bir varlıq bütün həyatı boyu tam qəflətdə ola bilməz. Yalnız koma vəziyyətində olan insan tam qəflətdə hesab oluna bilər. Demək, ayədə zikr olunmuş qəflət xüsusi bir qəflətdir. İnsanı heyvan səviyyəsinə, hətta ondan da aşağı səviyyəyə endirən səbəb nədir? Əqlə əsasən deyə bilərik ki, insan yalnız öz insanlığını unutduğu zaman belə alçala bilər. Amma bu cavab qənaətbəxş deyil. İnsan bir çox xüsusiyyətlərinə görə heyvanla müştərəkdir. Yemək, içmək, yorğunluq, cinsi ehtiyac həm insanda, həm də heyvanda müşahidə edilir. Bu meylləri heyvani, təbii, maddi meyllər adlandıra bilərik. Agahlıq dedikdə bu sayaq təbii işlərə diqqət

nəzərdə tutulmur. Çünki bu növ ehtiyaclara heyvanlar da diqqət yetirir. Ən alçaq insanlar, hətta kafirlər də yeməyi-yatmağı yaddan çıxarmır. Demək, qəflət bu sayaq işlərə aid deyil. Aydınlaşdırmalıyıq ki, insanı insan edən nədir? Məhz insanı insan edən xüsusiyyətlərdən qafil olanlar heyvana çevrilir. Bəs insanlıq xüsusiyyətləri hansılardır? Bə`zən belə deyirlər ki, insani xüsusiyyətlər insanın maddi yönümünün ziddi olan ilahi yönümdür. Allahdan qəflətin nəticəsi insanlığı unutmaqdır. Qur`ani-kərimdə buyurulur: "Allahı unutduqlarına görə özləri özlərinə unutdurulanlar kimi olmayın!"(١) Ayədən mə`lum olur ki, insanlıq Allahla bağlı bir məfhumdur. Allahı unudan özünü unudur. Allahı unutmağın cəzası özünü unutmaqdır. Maraqlı bir nəticəyə gəlirik: deməli, insan-lığını unutmayan kəs Allahını unuda bilməz. Ekzistensializmin banisi məsihi keşişi Kyerkeqorun belə bir fikri vardır: "Əgər insan Allahı unutsa, insanlığını da .unutmuşdur." Onun bu fikrinin dini mənbələrdən götürül-düyünü düşünürük

Bə`ziləri elə düşünür ki, yeyən, içən, yatan, əylənən varlığa insan deyilir. Əslində isə bu heyvana aid olan xislətdir. Bu təsəvvürdə olan elmlər doktoru ilə ən avam insan arasında heç bir fərq yoxdur. "Cümə" surəsinin ٥-ci ayəsində buyurulur: "Tövratın elminə sahib olduqdan sonra ona əməl etməyənlərin məsəli kitab daşıyan uzunqulağın məsəli kimidir." Bəli, heyvan da acıyır, yeyir, istirahət edir, suya girib yuyunur, hətta özünə ev də tikir. Amma bə`zən insan heyvandan da alçaq səviyyəyə enir. Əgər heyvan öz ehtirasını yalnız öz növündən və müxalif cinsdən tə`min edirsə, XXI əsrin insanları nəinki öz həmcinsi, hətta heyvanla da yaxınlıq edir. Ədalətdən dəm vuran qərb və Amerika isə bu sayaq rəzil təmayülləri azadlıq hesab edir. Sual



---

١- [٢٥] "Həşr" surəsi, ayə: ١٩.

olunur: öz həmcinsi ilə yaxınlıq edən insan, yoxsa bu işdə ölçü gözləyən heyvan daha alçaqdır?! "Ə`raf" surəsinin ۱۷۶-cı ayəsində oxuyuruq: "Onun məsəli it məsəli kimidir ki, üstünə cumsan da, cummasan da dilini çıxarar." Həzrət Əli (ə) buyurur: "Fikri-zikri (otlamaq və yemək olan insanın nəyi heyvandan üstündür?"(۱)

## ŞƏXSİYYƏT SAHİBİ OLMAQDA AXİRƏT İNANCININ ROLU

Həyatı yalnız maddi və heyvani istəklərin tə`min edilməsindən ibarət olmasını hesab edən insan yalnız həmin məsələlərə diqqət göstərir və öz insani şəxsiyyətindən qəflətdə qalır. Hansı ki, insanı heyvandan fərqləndirən ondakı ilahi ruhun mövcudluğudur. Bu ruha əhəmiyyət verən insan heyvanlıqdan uzaqlaşır. İnsan öz şəxsiyyətini anlamaq üçün daxilindəki ilahi yönümü araşdırmalıdır. Həzrət Əli (ə) buyurmuşdur: "Allah rəhmət etsin haradan gəldi-yini, harada olduğunu və haraya gedəcəyini bilən insana."۲ Bu üç suala cavab tapan insan özünü dərk edər. Əslində bu .sualların cavabı dinin əsasını üsulid-din təşkil edir: tövhid, nübüvvət və məad

Din insanın səadətini tə`min etmək üçün göndərilmişdir. Xoşbəxt olmaq istəyən kəs həmin suallara cavab tapmalıdır. Allahla rabitəsi olmayan insan özünü tanıya bilməz. Əslində insanlıq Allahın fe`li, Allahdan asılılıq, vücudən Ona bağlılıq deməkdir. Əlbəttə ki, bu məsələləri dərk etmək üçün dərin fəlsəfi mövzu-ları araşdırmaq lazım gəlir. Allahı tanıdıqdan, Onun fe`li olduğumuzu bildikdən və Ondan xilqətə gəldiyimizi anladıqdan sonra belə bir sual yaranır ki, varlıq aləminin yaradılmasında məqsəd nədir? Bu sualın



---

.Biharul-ənvar", ۳۳-cü cild" [۲۶] -۱

cavabı məad mövzusunu araya gətirir. Demək, iki suala cavab tapılmalıdır: başlanğıcımız haradandır və yaranışda məqsəd nədir? Qur`ani-kərimdə Allaha və qiyamət gününə (məad) e`tiqad yanaşı zikr olunur: “Yaxşılıq odur ki, bir şəxs Allaha və axirət gününə iman gətirsin.”(۱); “Allaha və axirət gününə iman gətirib, saleh əməl edənlər üçün heç bir qorxu yoxdur.”(۲); “Allahın məscidlərini yalnız Allaha və qiyamət gününə iman gətirənlər abad edə bilərlər.”(۳); “Elə bir qövm tapa bilməzsən ki, Allaha və qiyamət gününə inandıqları halda Allahın müxalifləri ilə dostluq edələr.”(۴)

Varlıq aləminin başlanğıcı Allah, son məqsəd isə qiyamət günüdür. Bəs son məqsəd olan qiyamət haradır? Qur`ani-kərimə görə qiyamət elə bir yerdir ki, onun behişt və cəhənnəmi var. Həm Allahla görüş, həm də əbədi əzaba çatacaq yerdir. Bəs insan cəhənnəm və əzabdan qurtulub, behişt və Allahla görüşə nail olmaq üçün nə etməlidir? Başlanğıc və son arasında insana hansı həyat proqramı təqdim olunur? Bu suallara cavab tapmaq üçün yeganə yol dinə müraciət etməkdir. Peyğəmbərlərin göndərilməsində də məqsəd insana doğru yolu göstərməkdir. Din Allahın peyğəmbərlər vasitəsi ilə insanlara təqdim etdiyi həyat proqramıdır.

İslam peyğəmbərinin birinci vəsisi Həzrət Əli (ə) “Nəhcül-bəlağə” kitabında dünya həqiqətini insanlara anlatmağa sə`y göstərir. Həzrət (ə) buyurur: “Dünya keçid yeridir”; “Agah olun ki, dünya qalacaq yer deyil və nə də siz onun üçün xəlq olunmusunuz.”

Qeyd etdiyimiz kimi, insanın özünü tanıması üçün dinin üç əsasını – tövhid, nübüvvət və məadı tanıması



---

۱- [۲۸] “Bəqərə” surəsi, ayə: ۱۷۷.

۲- [۲۹] “Maidə” surəsi, ayə: ۶۹.

۳- [۳۰] “Tövbə” surəsi, ayə: ۱۸.

۴- [۳۱] “Mücadilə”surəsi, ayə: ۲۲.

zəruridir. Bu üç əsasdan xəbərdar olmaq insanı qəflətə düçar edir. Hətta insan bu həqiqətlərin biri barəsində kifayət qədər mə’lumatı olmazsa küfrə düşə bilər. “Yunis” surəsinin ٧-٨-ci ayələrində buyurulur: “Bizimlə qarşılaşacaqlarına ümidvar olmayan, dünya həyatına bel bağlayıb ayələrimizdən qafil olanların düşəcəkləri yer oddur.” “Qaf” surəsinin ٢٢-ci ayəsində oxuyuruq: “Sən bundan qafil idin. Daha bu gün (qiyamət günü) ”.pərdəni gözündən götürdük. Bu gün sənin gözün sərrast görür

Bəli, insan öz fəaliyyətini Allaha doğru istiqamətləndirmək üçün mə’lumata ehtiyacı var. Bu mə’lumat və agahlıq üç həqiqətin dərk olunmasından ibarətdir: Allah, qiyamət .günü və qurtuluş yolu

## :SƏKİZİNCİ DƏRS

## QƏFLƏTDƏN QURTULUŞ

### ÖTƏN MÖVZULARA BİR NƏZƏR

Qeyd olunduğu kimi bütün fəsadların, azğınlıqların əsası insanın qəflətidir. Bu Qur`an ayələri ilə sübut olundu. Aydın oldu ki, söhbətimizin mövzusu olan qəflət mütləq qəflət deyil. İslam dinində qəflət dedikdə insanlığın həqiqətinə e’tinasız yanaşmaq insani şəxsiyyətdən xəbərsizlik nəzərdə tutulur. İnsan maddi, fizioloji cəhətdən digər canlılardan fərqlən-mir və onun təbii ehtiyacları heyvanlarla üst-üstə düşür. İnsan öz

maddi yönümünə çox diqqət yetirir. Acıyan dərhal yeyir, yorulan dərhal yatır və s. Amma insan öz ruhani yönümünə, xoşbəxtli-yini tə`min edəcək zərurətlərə maraq daşımır. Halbuki, onun əsl şəxsiyyət kimi formalaşmağı, ən mühümü isə axirət səadəti .məhz bundan asılı-dır

İnsanlığın həqiqətini aydınlaşdırmaq bir qədər çətindir. Amma əksəriyyətimiz bilirik ki, daxilimizdəki insani şəxsiyyət, heysiyyət bizi kamilliyə sövq edir. Belə bir şəxsiyyət hissi bütün yaranmışlar arasında yalnız insana məxsusdur. İnsan qədər ucalmaq mümkün olmadığı kimi, insan qədər alçalmaq da mümkün deyil. İnsan o qədər alçala bilər ki, hətta cəhənnəm oduna daxil olar. Amma digər canlılar cəhənnəmə aparacaq .qədər alçaqlığa qadir deyillər

İnsanlıqdan qafil olan şəxs, heç şübhəsiz ki, heyvani istəklər ardınca gedəcəkdir. Fikri-.zikri yeyib-yatmaq olan insanın heyvandan heç bir üstünlüyü yoxdur

İnsanın maddi yönümü, başqa sözlə, heyvani istəkləri onu kamilliyə aparan vasitə olmalıdır. Amma müasir dünyamızda müşahidə edirik ki, insanların böyük əksəriyyəti öz insanlığını özünün heyvani yönümü üçün, əqlini nəfsi, ruhunu cismi üçün vasitə qərar vermişdir. Ruhlar cismlərə hakim olmaqdan onun nəfsani istəkləri-nin əsarətinə .altına düşmüşdür

Belə bir qəflətdən qurtulmaq üçün insani şəxsiyyətimizə diqqət etməli, ondan agah olmalıyıq. Qeyd edildi ki, agahlıq əldə etmək üçün üç məsələyə diqqət yetirilməlidir: haradan gəlmişəm? (tövhid), haraya gedirəm? (məad), qurtuluş üçün nə etməliyəm? (nübüvvət). Tövhid bütün varlıq aləmi və bəşəriyyətin Allahdan olmağını, məad insanın öz əqidəsi və əməli müqabilində əbədi cənnət ya cəhənnəmlə qarşı-laşacağını, nübüvvət isə peyğəmbərliyin həqiqəti və bunun vasitəsilə insana təqdim olunmuş yaşayış proqramını anlayıb dərk etməkdən ibarətdir. Bu üç səh:۵۲

şeydən birindən qəflətdə olan insan tənəzzülə doğru gedir. Allah, Onun göstərişləri və .Onun sorğu günündən xəbərsizlik insanı əzaba düçar edir

### QƏFLƏTDƏN AYILMAQ ÜÇÜN İLK ADDIM

Hər hansı bir məsələdən qəflət etməkdən qurtarıb həmin məsələ barəsində mə’lumat əldə edib ondan agah olmaqdan ötrü əvvəlcə diqqəti həmin məsələnin surətinə yönəltmək lazımdır. İnsan təsəvvürü olmayan bir şey haqqında sual verə bilmir. Məsələn, müxtəlif elm sahələrinə aid bir çox məsələlərdən tamamilə xəbərsizik. Amma insan deyirsə ki, filan məsələni bilmirəm, demək, məsələnin surətindən xəbərdardır. Elə məsələlər də var ki, insan həmin məsələlərin varlığından xəbərsizdir. .Bu hal məsələnin surətindən xəbərsizlikdir

İnsan uşaqlıq dövründən çıxanadək hətta bir sıra məsələləri təsəvvür də edə bilmir. Məsələn, üç yaşlı körpə tətbiqi riyaziyyatın anlayış-larından qəflətdədir. Körpə həmin .anlayışları yalnız əqli inkişaf etdikdən sonra qavraya bilər

İslamda dini e`tiqadın üç əsasını təsəvvür etmək üçün müəyyən yetkinlik həddinə çatmaq lazımdır. Bu yaşa çatmayanlar həmin məsələlərdən tam qəflətdədirlər. Yalnız yetkinlik həddinə çatdıqdan sonra insan bu üç məsələni təsəvvür edə bilər və həmin .mövzu barəsində onun zehnində müəyyən suallar yaranar

### MƏSƏLƏNİN SURƏT BARƏDƏ TƏSƏVVÜR ƏLDƏ ETMƏK YOLU

:İnsan zehnində məsələnin surətinni yaranması üçün əsas üç amil tə`sirlidir

;Fitri qavrayış.١

;Problemlər, çətinliklər.٢

.Müəllimlər və peyğəmbərlər.٣

Bə`zi insanlarda “haradan gəlmişəm və hara gedirəm” sualı müəyyən zehni inkişaf həddinə çatdıqdan sonra fitri şəkildə yaranır. Elə insanlar da var ki, həmin sual onların zehnində yalnız çətinliklərlə qarşılaşdıqları zaman əmələ gəlir. Amma başqa bir qrup insan yalnız müəllimin tə`siri ilə uyğun sual ətrafında düşünürlər. Qur`ani-kərimdə .hər üç hala uyğun nümunələr vardır

Həzrət İbrahim (ə) birinci qrup şəxslərdəndir və bu məsələyə fitri surətdə üz tutmuşdur. O, səmaya nəzər salarkən varlıq aləminin yaradanı barədə düşünərdi. Həzrət (ə) düşünərdi ki, gün, ay, ulduz dünyanı necə yarada bilər? Həmin hal bə`zən körpə uşaqlarda da müşahidə olunur. Bə`zən körpələrdən “dünyanı kim yaradıb?” kimi .suallar eşidirik

Bə`zi insanlar yalnız çətinliklə üzləşdikləri zaman yaranış barəsində fikirləşirlər. “Ənkəbut” surəsinin ۶۵-ci ayəsində buyurulur: “Onlar gəmiyə mindikləri zaman səmimi ”.qəlblə Allahı çağırır, elə ki, quruya çıxdılar, yenidən Allaha şərik qoşurlar

Qur`ani-kərimdə iki yerdə vurğulanır ki, peyğəmbərlər göndərilən zaman xalq çətinliyə salındı. Bu çətinlikdə məqsəd onların diqqətini Allaha yönəltmək idi. “Ən`am” surəsinin ۴۲-ci ayəsində buyurulur: “Səndən qabaqkı ümmətlərə peyğəmbərlər göndərdiyimiz zaman o ümmətləri çətinliyə saldıq ki, bəlkə yalvarıb-yaxaralar.” “Ə`raf” surəsinin ۹۴-cü ayəsində oxuyuruq: “Biz hansı ölkəyə peyğəmbər göndərdiksə, onun əhalisini sıxıntıya saldıq ki, bəlkə yalvarıb-yaxaralar.” Çətinlik insanın yatmış fitrətini oyadır. Sıxıntıya düşmüş insan yardım axtardığı zaman Allah haqqında .düşünməyə başlayır. Ətrafındakılardan ümidi üzülmüş insanın diqqəti Allaha yönəlir

Nə fitri yolla, nə də çətinliklər vasitəsi ilə diqqəti ilahi həqiqətlərə yönəlməyən şəxs müəllim və peyğəmbərlərə ehtiyaclıdır. “Nəhcül-bəlağə”də peyğəmbərlərin səh:۵۴

göndərilməsinin səbəbi insanların yatmış fitrəti olması qeyd olunur: “Allah Öz peyğəmbərini onlara göndərdi ki, Allaha verdikləri fitri və`di tələb etsin və unudulmuş ne`mətləri xatırlatsın.” Hər bir insanın Allahla fitri bir əhdi vardır. İnsan bu əhdi unutduğundan xatırlatmağa ehtiyacı var. Qur`an buyurur ki, peyğəmbərlərin işi “təzəkkür”, yə`ni xatırlatmaqdır. “Təlaq” surəsində İslam peyğəmbəri haqqında buyurulur: “Həqiqətən Allah sizin üçün xatırladan kəs göndərmişdir.” Həmin ayədə “rəsul” kəlməsi “zikr” sözü ilə ifadə olunmuşdur. Bə`zi ayələrdə Qur`anın özü də zikr adlandırılır: “Həqiqətən, Allah sizə zikri nazil etmişir.”(١) Bə`zən digər səmavi kitablar da zikr hesab olunur. Hər halda, peyğəmbərlər və səmavi kitablar ona görə zikr adlandırılır ki, onların işi insanların fitri yaddaşlarını oyatmaqla onları qəflətdən qurta-.rıb agah etməkdir

Deməli, insanın təkamül hərəkatinə başlaması üçün onun qəflətdən çıxması lazımdır. Qəflət-dən çıxmaq üçünsə zehndə növbəti suallar yaranmalıdır: Sənin yaradanın yoxdurmu? Qiyamət olmayacaqmı? Sorğu-sual yoxdurmu? Beləcə, Qur`an və peyğəmbər zehnlərdə müəyyən suallar doğururlar: “Elə güman edirsiniz ki, sizi əbəs yerə yaratmışıq və Bizim hüzurumuza qayıtmaya-caqsınız?”(٢) Özünə bu cür suallar verməyənlər tamamilə Allah, peyğəmbər və axirətdən qəflətdə-dirlər. Bəli, özünü yalnız cismdən və bu cismə qulluq etməkdən ibarət bilənlər var. Onları dünya həyatından başqa heç nə düşündürmür. Bu insanları qəflət yuxusundan oyatmaq üçün onlara agahlıq verilməlidir. Peyğəmbərlər zehnlərdə suallar doğurur və bu suallara .cavab verirlər



---

Təlaq” surəsi, ayə: ١٠“ [٣٢] -١

.Mö`minun” surəsi, ayə: ١١٥“ [٣٣] -٢

Qeyd etdik ki, ilk növbədə zehndə müəyyən suallar yaranmalıdır. Lakin suallar yarandıqdan sonra bu suallara müxtəlif münasibətlər müşahidə edilir. Bə`ziləri bu suallara ciddi yanaşıb cavab axta-rır, bə`ziləri isə "hələ ki, bundan da vacib işlərimiz .var" deyərək bu məsələyə laqeyd yanaşırlar

İlahi mərhəmətə nail olmaq üçün bu tip suallara ciddi münasibət göstərmək mühüm şərtdir. Allah-təala onun ne`mətlərinə ciddi yanaşanlar üçün bu ne`mətləri artırır. Bu, ilahi qanundur. "İbrahim" surəsinin ٧-ci ayəsində buyurulur: "Əgər şükr etsəniz, hökmən ne`mətlərimi artıraram." Peyğəmbərlərin göndərilməsi, onların zəruri suallar doğurması, eləcə də, həmin suallara cavab verməsi ilahi ne`mətlərdəndir. Bu ne`mətlərə ciddi yanaşanları Allah doğru yola hidayət edir. Amma bu ilahi ne`mətə e'tinasızlıq göstərənlərin haqqı ilahi əzabdır. E'tinasızlıq göstərənlər arasında da fərqlər var. Bə`ziləri məsələnin ciddiliyini anlayaraq diqqətsizlik göstərirlərsə, başqa biriləri məsələnin nə dərəcədə ciddi olduğunu anlamırlar. "Saffat" surəsinin ١٣-cü ".ayəsində buyurulur: "Onlara nəsihət verildiyi zaman ibrət alırlar

Hər hansı bir məsələyə məs'uliyyətlə yanaşıb onun barəsində dəqiq mə'lumat əldə etməyin də müxtəlif mərhələləri var: məsələnin surətinə diqqət, məsələyə ciddi yanaşaraq onu aydınlaş-dırma, yaranmış suallara cavabların qəbul edilməsi. Bə`ziləri bu yolda səhlənkarlıq ucbatından qənaətbəxş cavab tapmır, digərləri qənaətbəxş cavab tapdıqları halda tərslik göstərərək bunu izhar etmir, bir başqaları isə tapdıqları yanlış cavaba təslim olaraq azırlar. Üçüncü qism insanlara "mürəkkəb cahil" deyilir. Belə insanda iki cür cəhl var: biri məsələdən xəbərsizlik, digəri öz səh:٥٦

.nadanlığından xəbərsiz-lik. “Bəsit cahil” isə bilmədiyindən xəbərdar olan şəxsə deyilir

**!DİQQƏT**

Mə`lum oldu ki, hər bir kəsin Allah, qiyamət və nübüvvət məsələlərinə qarşı bəslədiyi münasibə-tində bir sıra xətərlər mövcuddur. İnsanın bu mövzulardan tam xəbərsizliyi və ya bu mövzulara ciddi yanaşmaması, bə`zən də həqiqəti bilərəkdən inkar etməsi onun aqibəti üçün çox qorxuludur. “Zumər” surəsinin ۴۵-ci ayəsində oxuyuruq: “Allahın adı zikr olunarkən axirətə inan-mayanların qəlbi sıxılar.” Bəli, Allahın adından narahat olanlar da var. Maraqlıdır ki, bu narahatlıq insanların axirətə imansızlığından irəli gəlir. Görəsən, Allahla axirət inancı arasında hansı bağlılıq mövcuddur? Müasir dünyamızda özünü müsəlman, ziyalı, millətçi, hətta İslam mücahidi adlandırdığı halda sözünü Allahın adı ilə başlamaqdan çəkinənlər var. Cildlərlə kitab yazan müsəlman alimlərinə nədənsə öz kitablarını “Bismillahir-rəhmanir-rəhim”lə başlamaq ağır gəlir. Hətta bə`ziləri onlardan ötrü xoşagəlməz olan bu işə şər`i don geyindirmək üçün öz yazılarını “bismillah”sız başlamış “Tövbə” surəsi ilə müqayisə edirlər. Belə insanların azğınlığını Allah daha da artırır. Bu barədə Qur’anda belə buyurulur: “Onlar üz döndərdikdə Allah da onların qəlblərini döndərdi. Allah fasiq qövmü hidayət etməz. Açıq-aşkar dəlilləri gördükləri halda inad göstərənlərin qəlbi möhürlənər”(۱); “Allah onların qəlblərini və qulaqlarını möhürləmiş, gözlərinə pərdə çəkmişdir.”(۲) Bu insanlar öz nəfslərinə itaət edənlərdirlər. Onlar Allaha pərəstiş etmək əvəzinə özlərinə pərəstiş edirlər. Qəlbi möhürlənmiş insanı isə



---

.Səff” surəsi, ayə: ۵“ [۳۴] -۱

.Bəqərə” surəsi, ayə: ۷“ [۳۵] -۲

(kimsə hidayət edə bilməz; “Allahın azdırdığı kəsə bələdçi yoxdur.”(١

Allahın hidayət etmək istəmədiyi insanlar da olur. “Kəhf” surəsinin ٢٨-ci ayəsində buyurulur: “Qəlbini bizi yad etməkdən qəflətdə saxladığımız, nəfsinin istək-lərinə uyan və işində ifrata uğrayan kəslərə itaət etmə.” Bu sayaq qəlbi möhürlənənlər öz şəkk-şübhələri ilə fəxr edir. Hətta başqalarını da şəkkə salırlar. Onların nəzərində həqiqətə şübhə etmək nöqsan yox, hünərdir. Bəli, insan Allahın adını eşitməyə təhəmmül etməyəcək qədər alçala bilər. Bundan da böyük bədbəxtçilik ola bilərmi?! Bə`zən nahaq qanlar axıtmış daş ürəkli cinayətkar mühakimə zamanı üzünü hakimə və salondakılara tutub “mən sizin hamınıza nifrət edirəm” deyir. Bu, həqiqətə nifrətin bir misalıdır. Unutmayaq ki, bu günkü mövqeyimizdən asılı olmayaraq nəfsimizi özbaşına buraxsaq. Həmin təhlükə ilə üzləşə bilərik. Bəs özümüzü necə qoruyaq? Axı biz nəinki məsələnin surətini anlamışıq, bəlkə doğru cavab əldə edib bu cavaba iman da gətirmişik. Hansı amil bizi yenidən heyvan səviyyəsinə endirə bilər? Məgər Allaha, axirətə iman gətirmək insanlıq mərhələsinə çatmaq deyilmi? Bilməliyik ki, gözümüzü əbədi olaraq yumanadək bu günkü əqidədə qalacağımıza heç bir zəmanət yoxdur. .Yeganə çıxış yolu bizi azdıra biləcək amilləri tanıyıb, bu amillərin qarşısını almaqdır



---

.Rə`d” surəsi, ayə: ٣٣“ [٣۶] -١

## :DOQQUZUNCU DƏRS

## QƏFLƏTİN SƏBƏBLƏRİ

### QƏFLƏTƏ SƏBƏB OLAN AMİLLƏRİN ƏQLİ CƏHƏTDƏN ARAŞDIRILMASI

Qeyd olundu ki, insanı uçuruma yuvarladan səbəb qəflətdir. Allahdan, məaddan və bəndəlik vəzifələrindən xəbərsizlik insanı heyvanlıq dərəcəsinə, bə`zən ondan da aşağı alçaldır. Dinin əsaslarından xəbərdar olmayan insanın təkamül yolunda hərəkət etməsi qeyri-mümkündür. İndi aydınlaşdırmalıyıq ki, insanda qəfləti doğuran və yaxud insanı qəflətdən çıxaran səbəblər hansılardır. Bu suallara cavab tapmaq üçün ayə və rəvayətlərdən istifadə edərək əqli araşdırma aparmağımız lazım gəlir. Əvvəla heç bir mənbəyə istinad etməmiş anlayırıq ki, müəyyən bir məsələyə diqqət yetirmək diqqətin başqa bir məsələyə yönəlməsindən irəli gəlir. Çox vaxt insan bir işə başı qarışdığından digər bir işi unudur. Ola bilər ki, işə tələsən insan yolda çoxdan arzuladığı dostu ilə rastlaşıb işə gecikdiyini yaddan çıxarsın. Başqa bir misal; fikri bayırda qalan şagird müəllimin dediklərini başa düşmür. Ümumiyyətlə, insan eyni zamanda iki məsələyə .diqqət yönəldə bilmir

İnsanı Allah, qiyamət və dini vəzifələrindən qəflətdə saxlayan onun diqqətinin başqa məsələlərə yönəlməsidir. Xüsusilə, nəfs istək-ləri insanı əsas məsələdən uzaqlaşdırır. .Bə`zən insan ömrün elə bir çağında oyanır ki, artıq ölüm qapını kəsmişdir

Ətrafımızdakı mənzərələr təbii olaraq insanın diqqətini cəlb edir. Bə`zən insan bu cazibədarlığın tə`sirindən həyat əhəmiyyətli məsələləri unudur. İnsanın bu sayaq məstliyi, uyması haramdır. Allah spirtli içkiləri ona görə haram buyurmuşdur ki, bu içkilər insanın ağlını əlindən alır, onun diqqətini əsil hədəflərdən yayındırır. “Ğina” adlanan bir qrup musiqi də bu tə`sirə malikdir. İnsana öz şəxsiyyətini unutduran

musiqilər haramdır. Bu qəbildən haram işlərə adətkar olan insan ilahi həqiqətləri dərk edib anlamaq qabiliyyətindən uzaq düşür. “Loğman” surəsinin ۶-cı ayəsində oxuyuruq: “Elə insanlar var ki, boş sözləri satın almaqla xalqı nadanlığa salıb Allah yolundan ”.azdırırlar

Amma heç də hər şey insana Allahı unutdurmur. Allahı unutdurmayan şeylər isə haram deyil. Bə`zən insanın başı televiziya verilişlərinə, dostlarla söhbətə qatışdığından namazını unudur. Uyğun təzahürü iki cür izah etmək olar. İslamda bə`zən yemək müstəhəb oruc tutmaqdan daha fəzilətli hesab olunur. Məsələn, müstəhəb oruc tutmuş şəxs bir mö`minə qonaq olarsa, mö`minin təklif etdiyini yeyib onu sevindirmək müstəhəb orucdan fəzilətlidir. Demək, adətən insanı ilahi düşüncədən ayıran yemək də ibadət hesab oluna bilər. Aydın olur ki, namazın vaxtını ötürən insanın həmin vaxt hansı işlə məşğul olması şərtdir. Dostlarla dünyəvi söhbətə məşğul olub namazı unutmaq əsl qəflətdirsə, avtomobil qəzasına uğramış şəxsi xəstəxanaya çatdırıb namazı azca yubatmaq xeyirxahlıqdır. Bu misallardan mə`lum olur ki, ağına-bozuna baxmadan bütün dünyəvi işləri zərərli bilmək olmaz. Bir qismini qəflətə düçar edən iş digər bir qismi üçün faydalı ola bilər. İşin nəticəsini insanın niyyəti .müəyyən edir

### AYƏ VƏ RƏVAYƏTLƏRDƏ QƏFLƏTİN SƏBƏBİ

Qur`ani-kərimdə və dini rəvayətlərdə bildirilir ki, insanda qəflət doğuran əsas səbəblərdən biri var-dövlət və ailə-uşağa bağlılıqdır. “Münafiqun” surəsinin ۹-cu ayəsin-də buyurulur: “Ey iman gətirənlər! Mallarınız və övladlarınız sizi Allahı yad -etməkdən yayındırmasın.” İnsanda öz var

dövlətini qəpik-qəpik artırmaq həvəsi onu Allahdan və qiyamətdən qəflətdə saxlayır. Əgər insan bu bağlılıqda ifrata varmasa, var-dövlət və ailə-uşaq faydalı ola bilər. Qur`ani-kərim həmin ne`mətlərdən düzgün faydalanan insanları da yad edir: “İnsanlar var ki, ticarət, alver onların fikrini Allahdan qəflətdə saxlamaz.”(١) Demək, insan dünya həyatını elə yaşaya bilər ki, Allahın razılığını qazanar. Bəs bunu necə ?etməli

Əgər dünya işləri insan üçün hədəf olarsa dünya onun qibləsinə çevrilər. Qibləsi dünya olan insanın Allahı yada salması imkansızdır. Amma insan Allahı və qiyaməti unutmadan dünya və onun ne`mətlərinə vasitə kimi də baxa bilər. Son məqsədi Allaha yaxınlaşmaqda görən insan üçün dünya ne`mətlərindən istifadə ibadətə çevrilə bilər. Yeyərkən, yatarkən, istirahət edərkən Allahı unutmayan insan üçün bu işlər heç də qorxulu deyil. Dünya ne`mətlərinə Allahın Öz bəndəsinə mərhəməti kimi baxan insan Allahı necə unuda bilər? Belə bir baxışla övlada məhəbbət qəflət yox, ibadət hesab .olunur

Əlbəttə ki, belə bir baxış yalnız özünütərbiyədən sonra mümkündür. Sadəcə olaraq .bilməliyik ki, bu iş mümkündür

### ?DÜNYA QƏFLƏT, YOXSA TƏAMÜL VASİTƏSİDİR

Qeyd etdik ki, dünyaya baxış iki cürdür. İnsan dünyaya elə baxa bilər ki, daha da kamilləşər. Amma elə baxış da var ki, insanı qəflətdə saxlayar. Qur`ani-kərimdə dünyanın cazibədarlığı fitnə adlandırılır. “Fitnə” “imtahan” deməkdir. İmtahanın isə iki nəticəsi ola bilər: məqbul və ya qeyri-məqbul. “Ənfal” surəsinin ٢٨-ci ayəsində buyurulur: “Bilin ki, var-dövlət və övladlarınız sizin üçün ancaq bir imtahan-dır.” Bu imtahanda vəzifəsini layiqincə yerinə yetirən şəxs Allaha yaxınlaşır, qəflətdə qalan isə uçuruma səh:٦١

---

.Nur” surəsi, ayə: ٣٧“ [٣٧] -١

yuvarlanır. Qur`an xəbərdarlıq edir ki, dünya sizi aldatmasın: "Dünya həyatı sizi aldatmasın."(۱) Qur`an əmr etmir ki, dünya ne`mətlərindən uzaqlaşaq. Sadəcə, xəbərdarlıq olunur ki, dünya hədəf yox, vasitədir. Həzrət Əli (ə) buyurur: "Dünya ona ibrət gözü ilə baxanları bəsirət sahibi, onun zinətlərinə aldananları isə kor etdi."(۲)

Demək, dünya həm bəsirət gözünü aça bilər, həm də kor edə bilər. Dünyaya vasitə kimi baxanların bəsirət gözü açılar. Dünyanı özünə qiblə edənlərin isə bəsirət gözü tutular. Dünya eynək kimidir. Eynəkdən baxan həqiqəti, eynəyə baxan onun şüşəsini görür. Bu insan (eynəyə baxan) üçün eynək kömək yox, pərdədir. Əgər insan dünya və onda olanları Allahın ne`məti kimi qəbul etsə, onlara nəzər saldıqda Allahı xatırlayacaq. Allahı xatırlayan insan isə halal-harama diqqət yetirib olub, vəzifələrinə lazımınca əməl edəcək. "Ali-İmran" surəsinin ۹۲-ci ayəsində oxuyuruq: "Sevdiyiniz şeylərdən haqq yolunda sərf etməyincə yaxşılığa nail olmayacaqsınız." İnsan Allah yolunda sevdiyi şeylərdən sədəqə verməklə dünya malına məhəbbətdən yaxa qurtarmalıdır. İnsan var-dövlətə o qədər hərisdir ki, sədəqə verəndə də əzik, cırıq manatları verir. Təmiz və şax pulları sədəqə etməklə dünyaya olan qorxulu bağlılıqdan xilas olun. Əks təqdirdə dünyapərəstlikdən qurtulmaq çətin olacaq.

### NƏFSİN PAKLAŞDIRILMASINDA DAVAMİYYƏTİN ROLU

Qəflətdən qurtarmaqdan ötrü insanın gündəlik proqrama ehtiyac var. Dua, Qur`an, zikr, namazdan ibarət olacaq bu proqramın vəzifəsi ardıcıl şəkildə Allahı xatırlatmaqdır. Allah-təalanın beş vaxtda namazı



---

۱- [۳۸] "Loğman" surəsi, ayə: ۳۳.

۲- [۳۹] "Nəhcül-bəlağə".

vacib etməsi də bu məqsədi daşıyır. Amma vacib namazlardan əlavə müstəhəb ibadətlərə də ehtiyac var. On yeddi rək`ət namaz vacib, bu namazları əvvəl vaxtında qılmaq isə müstəhəbdir. Ən azı namazları əvvəl vaxtında qılmağa diqqət yetirmək lazımdır. Bu iş ilk əvvəl çətin görünsə də az sonra davamiyyət nəticəsində adət halını alır və insan namazı əvvəl vaxtında qılmaqdan ləzzət alır. Bundan əlavə, müxtəsər də .olsa, müstəhəb ibadətlər nəzərdə tutulmalıdır

Məşhur "Üsuli-kafi" kitabında ibadət barəsində iki fəsil mövcuddur. Orada qeyd olunur ki, hətta ibadətdə də ifrata varmaq zərərlidir. Bir gün ərzində on cüz Qur`an oxuyan insan elə yorula bilər ki, bir ay əlinə Qur`an götürməz. Amma hər gün eyni bir vaxtda orta həddə Qur`an oxumaq və bu işə fasilə verməmək daha faydalıdır. İbadətdə orta .həddi gözləyərək ardıcıl, davamlı olmaq çox faydalıdır

Əhzab" surəsinin ۴۱-۴۲-ci ayələrində oxuyuruq: "Ey iman gətirənlər! Allahı çox zikr" edin. Sübh və şam Onu təqdis edib şə'ninə tə`riflər deyin." Yə`ni insan günün .əvvəlində və sonunda Allahı davamlı şəkildə xatırlamalıdır

Zikr təkcə dilə aid deyil. Əsil zikr Allahı qəlbdə xatırlamaqdır. Əlbəttə ki, dil zikri qəlbə köməkçidir. Amma insanın fikri kənarda qaldığı halda dili zikr edərsə belə bir zikrmn faydası yoxdur. Namaz da Allahı xatırlamaq üçündür. Allah-təala "Taha" surəsinin ۱۴-cü ayəsində buyurur: "Məni xatırlamaq üçün namaz qıl." Allahı və qiyamət gününü düşünmək özü də zikrdir. Gündəlik proqramda Allahı düşünmək üçün vaxt ayırmaq zəruridir. Qur`ani-kərimdə təfəkkür barəsində belə buyurulur: "(Onlar) göylər və yer haqqında düşünərək belə deyərlər: Pərvərdigara, bütün bunları əbəs yerə (yaratmamısan!"(۱



---

.Ali-İmran" surəsində, ayə: ۱۹۱" [۴۰]-۱

## :ONUNCU DƏRS

## ALLAHI XATIRLAMAĞIN ŞƏXSİYYƏTƏ TƏ`SİRİ

### MAİDƏ" SURƏSİNİN ۱۰۵–Cİ AYƏSİ"

Qeyd olundu ki, Qur`an ayələrinə əsasən, eləcə də, əqli və təcrübi araşdırmalara görə insanın mə'nəvi cəhətdən tənəzzülə uğraması qəflətdən irəli gəlir. Bu qəflət insanın özündən və yaranış məqsədindən xəbərdar olmamasından ibarətdir. Təbii ki, bu .qəflətin müalicəsindən ötrü diqqəti həmin məsələlərə yönəltmək lazım-dır

Qur`ani-kərimin "Maidə" surəsinin ۱۰۵-ci ayəsi bu mövzunu işıqlandırır. Ayədə buyurulur: "Ey iman gətirənlər! Nəfslərinizi qorumaq sizin öz borcunuzdur. Siz doğru ".yolda olsanız, yolunu azanlar sizə heç bir zərər yetirə bilməzlər

Mərhum Əllamə Təbatəbai yuxarıdakı ayənin təfsirində nəfs barəsində mə'rifət əldə etmək, bu mə`rifətin mərtəbələri, bu mə`rifətin ilahi mə`rifətlə sonuclanması barədə dəyərli fikirlər söyləyir. Təfsirə görə ayənin zahiri mə`nası budur ki, insan öz eyblərinə məşğul olub başqalarında nöqsan axtarmamalıdır. Bə`zən insan bütün diqqətini ətrafdakılara yönəltdiyindən özündən xəbərsiz qalır. Əksərimiz

insanların yaxşı xüsusiyyətlərini bir kənara qoyub, adətən onların eyblərinə diqqət yetiririk. Bizdən bir şəxs haqqında soruşulanda həmin şəxsin nöqsanlarından danışmağa üstünlük veririk. İnsan eyb axtara-axtara bir də onda ayılır ki, eyb axtarmaq onda xasiyyətə çevrilib. Deyilənlər ayənin zahiri mə`nasını təşkil edir. Amma bir az da diqqət etdikdə daha dərin mə`nalar üzə çıxır. Mərhum Əllamə diqqətimizi bə`zi dərin incəliklərə yönəldir. Ayədə insanın özünə qarşı diqqətli olması ilə onun doğru yolu tutması, hidayəti arasında əlaqə mövcuddur. Demək, doğru yola yönəlmək üçün insanın özünə diqqət yetirməsi şərtdir. Yə`ni nəfsi tanımaq Allahı .tanımaq üçün bir müqəddimədir

## NƏFSİ TANIMAQLA ALLAHI TANIMAQ OLAR

Həyat təcrübəsi nəticəsində bizim hər birimizə mə'lumdur ki, bə'zən başımız ətraf mühitə, dünyəvi məsələlərə və nəfsani istəklərə elə qarışır ki, kim olduğumuzu, harada olduğumuzu, hansı hədəfdən ötrü yaradıldığımzı tamamilə unuduruq. Xüsusi ilə, bə`zi əyləncəli oyunlar zamanı insan hər şey yaddan çıxır. Dində bu hal “ləhv” adlanır və islama görə bu sifət mö`minə yaraşmayan sifətlərdən hesab olunur. Ləhvin bə`zi dərəcələri isə haram buyurulmuşdur. Bu cür halın əlaməti ondan ibarətdir ki, həmin vaxt insana özünü xatırlatdıqda narahat olur. Belə insanlar Allah, axirət, dini vəzifələri haqında düşünməməklə qalmır, bu fikirləri unutduracaq mühitə can atır. Bu adam sanki özündən qorxur. Tənhalıqda öz şəxsiyyəti haqqında düşünə biləcəyi halda özü ilə təklikdə qalmaqdan qaçır. Bu insan artıq kənarda başını müxtəlif əyləncələrə qatmağa adət etmişdir. Bir çox azğınlıqların, günahların səbəbi məhz insanın özündən .qaçmasıdır

İnsan şüurlu varlıqdır. Elm və özünüdərketmə hissi onun zatında mövcuddur. Ona görə də vücudunda özünüdərketmə hissi az olan insan insaniyyətdən

uzaqlaşır. Bu, onun özünə biganəliyindən irəli gəlir. Özünəbiganəlik haqqında qərbdə də müxtəlif nəzəriyyələr mövcuddur. Amma İslamda həmin məsələ daha dərin və əsaslı şəkildə araşdırılmışdır. İslam maarifi nəzərindən insan özünü həqiqət prizmasından qiymətləndirə bilsə ilahi mə`rifətə nail olar. "Biharül-ənvar"da nəql olunmuş məşhur hədisdə buyurulur: "Özünü tanıyan Allahını tanımışdır." Bu hədis həm Həzrət Peyğəmbər (s), həm də Həzrət Əlidən (ə) nəql olunmuşdur. Buna diqqət yetirmək lazımdır ki, hədisdə "Allahı tanımağın yolu nəfsi tanımaq-dır" deyilməyib. Bu iki məsələ (Allahı tanımaq və özünüdərketmək) bir növ cütlük təşkil edir, başqa sözlə, .bir-birlərindən ayrılıqda mümkün deyil

## NƏFSİN KAMİLLƏŞMƏSİNDƏ ALLAHI TANIMAĞIN ROLU

Söhbətimizin xülasəsi olaraq deyə bilərik ki, bütün azğınlıqların və büdrəmələrin əsası qəflətdir; insanın özündən, öz şəxsiyyətindən, dini vəzifələrindən qəfləti! Özünü dərk edən insan daimi olaraq Allahdan asılı olduğunu anlayır. Anlayır ki, onun varlığı Allaha .bağlı olmayacağı təqdirdə bir heçdir

Qəflət xəstəliyinə yoluxmamaq üçün özümüzə diqqət yetirmək və nəzarət etmək məqsədi ilə günün müəyyən bir vaxtında "özümüzlə görüş" tə`yin etməliyik. Xəlvət bir guşədə özümüzdən soruşma-lıyıq: sən kimsən? Haradasan? nə axtarırsan? aqibətin nə olacaq? Bu proqrama hər gün müntəzəm olaraq əməl edən insan hökmən irəli .doğru addım atır

Qur`an, peyğəmbər və mə`sum imamlardan nəql olunmuş hədislərdə Allahı zikr etməyə çox böyük əhəmiyyət verilir. Maraqlıdır ki, Allahı zikr etməyin insanın kamilləşməsində rolu nədən ibarətdir? Bu suala adətən belə cavab verilir ki, Allahı .xatırlayan insan günaha yol vermir, vəzifələrini daha yaxşı icra edir

Əlbəttə ki, bu cavab doğrudur. Özünü Allahın hüzurunda hiss edən insan günaha .cür`ət etməz, namazını əvvəl vaxtda və daha artıq diqqətlə qılar

Amma bu deyilən faydalar çənənin yeməkdən götürdüyü faydaya bənzəyir. Yemək zamanı daim hərəkətdə olan çənə qüvvətlənməyə doğru inkişaf etsə də yeməkdə məqsəd çənənin inkişafı deyil. Həmçinin, Allahı xatırlamağın da daha böyük və daha mühüm faydaları vardır. Bunu da qeyd edək ki, Allahı düşünməklə günahdan uzaqlaşmaq heç də kiçik fayda deyil. Amma bundan da böyük faydaların olduğunu unutmamalıyıq. Nəzərdə saxlamalıyıq ki, insan kamillik üçün yaradıl-mışdır və bu sahədə nailiyyət daim Allahla əlaqədə olmağa bağlıdır. Allahla bağlılıq isə insanın qəlbi vasitəsi ilə gerçəkləşir və qəlbin işi Allahı düşünməkdir. Aparılan təhlildəki ardıcıllıqdan aydın olur ki, insanın yaranış məqsədi olan təkamül üçün Allahı xatırlamaqdan başqa vasitə yoxdur. Ruhunu kamilləşdirmək istəyən insan yalnız Allahı zikr etməklə .məqsədinə nail ola bilər. İnsan Allahı düşündükcə qəlbi və ruhu Allahın nuru ilə işıqlanır

Daim zahirə diqqət edən insana elə gəlir ki, insanı uçuruma yuvarladan ən böyük səbəb günahdır. Amma anlamırıq ki, bütün günahların arxasında Allahın zikrindən qəflət dayanır. Bütün büdrəmələrin, çaşqınlıqların, günah-ların, pisliklərin ilkin səbəbi Allahdan qəflətdir. Eyni zamanda insanı ibadətə, saleh əmələ sövq edən də Allahın zikridir. Bütün deyilənləri təsəvvür və təsdiq etmək üçün ruhumuzu nurani etməli, .nəfsimizi paklaşdır-malıyıq

Fəlsəfi baxımdan Allahla insan arasındakı əlaqə səbəblə nəticə arasındakı əlaqə kimidir. Belə bir əlaqədə nəticənin dərk olunması səbəbin dərkidir. Yə`ni nəticə səbəbi dərk etmədən özünü dərk edə bilməz. Nöqsanlı da olsa, belə bir bənzətmə var: insan çıraqla əlaqəli bir şö`lədir. Əlbəttə ki, Allah nəhayətsiz nurdur. Onun

şö`ləları də nəhayətsizdir. Mənbəni dərk etmədən şö`ləni dərk etmək mümkün deyil. Biz Allahın müqəddəs zatının şö`ləriyik. “Hicr” surəsinin ٢٩-cu ayəsində oxuyuruq: “Mən ona surət verib ruhumdan üfürdüm.” Buna görə də, ruhumuzun təkamülü yalnız .Allahı xatırlamaqla mümkündür

## ALLAHI ÇOX ZİKR ETMƏK

Qur`ani-kərimdə zikrin kəmiyyəti barəsində “kəsir” (çox) və “şədid” (daha artıq) ifadələri işlədilmişdir. “Əhzab” surəsinin ٤١-٤٢-ci ayələrində oxuyuruq: “Ey iman gətirənlər! Allahı çox yad edin. Səhər-axşam Onu təqdis edib şə’ninə tə’riflər deyin.” “Bəqərə” surəsi-nin ٢٠٠-cü ayəsində buyurulur: “Həcc mərasimini tamamlayıb qurtaranda (keçmişdə) ata-babalarınızı yada saldığınız kimi, hətta ondan daha da artıq şəkildə Allahı yad edin.” Kəmiyyətcə çox zikr deyilməsi aydındır. Bəs şiddətli (Qur’anda ?işlədilən «şədid») zikr nədir? Görəsən, burada məqsəd zikri uca səslə deməkdirmi

Ayədə həcc mərasimindən sonrakı vaxt nəzərdə tutulur. Mə’lumdur ki, insan vəzifəsini yerinə yetirdikdən sonra arxayınlaşdığı üçün şeytanın əlinə münasib fürsət düşür. Məsələn, əksər insanlar namazı bitirdikdən sonra dua etmək əvəzində ani olaraq ətrafa boylanırlar. Bu hal şeytanın vəsvəsəsindən irəli gəlir. İki-üç dəqiqəlik namazdan sonra insanı bu sayaq yayındıran şeytan, təbiidir ki, uzun və ağır həcc əməlindən sonra daha fəal olur. Ehram halından çıxmış insan güzgüyə baxmağa, ətirlənməyə tələsir. Şeytan da bu vəziyyətdən məharətlə istifadə edir. Məhz bu səbəbdən də həcc əməllərini bitirənlərə ehram halından çıxdıq-dan sonra Allah zikrini unutmamaqları .tövsiyə olunur

Aydındır ki, zikrin kəmiyyətindən əlavə şiddəti (dərinliyi) də ola bilər. İnsan ən əziz adamını kənar bir

şəxsi xatırladığı kimi xatırlamır. Məsələn, övladını xatırlayan valideynin ruhu təlatümə gəlir. Demək, zikrin çoxluğundan əlavə şiddəti də şərtdir. Okeanla dənizin ləpəsi eyni gücdə olmur. Allahın zikri okean dalğası tək əzəmətli olmalıdır. Biz demək istəmirik ki, Allahı zəif şəkildə xatırlamaq səmərəsizdir. Sadəcə olaraq insan mövcud vəziyyətlə .kifayətlənməyib, öz zikrini elə güclən-dirməlidir ki, bütün vücudu lərzəyə gəlsin

Adi insanlar, adətən, Allahı bir adı və bir sifəti ilə xatırlayırlar. Bir çoxları Allahı yalnız ruzi verən kimi yad edirlər. Amma elə insanlar da var ki, bütün kamal sifətlər Allahın zatında toplandığından diqqətlərini bu zata yönəldirlər. Belə bir diqqət fəqət bir ilahi sifətə diqqətdən qat-qat güclüdür. Həzrət Əli (ə) namaz zamanı Allahın zatına o qədər diqqət verərdi ki, ayağından ox çıxarılan zaman heç bir şey hiss etmədi. Qur`ani-kərimdə buyurulur ki, Həzrət Yusifin gözəlliyindən heyrətə gəlmiş Misir qadınları .özlərinin də xəbəri olmadan meyvə kəsdikləri bıçaqla əllərini kəsdilər

## ŞƏHİD MÜTƏHHƏRİDƏN BİR XATİRƏ

Bu əhvalatı o böyük alim və dahi şəxsiyyətin yaxın adamları danışırlar. Deyirlər, bir gün mərhum Mütəhhəri övliyalardan birinin məh-zərində olarkən mə`rifəti artırmaq yollarından söz düşür. Övliya Mütəhhəridən soruşur: «Namaz zamanı qəlbini kənar fikirlərdən necə qoruyursan?» Mərhum Mütəhhəri cavab verir: «Namazın əvvəlindən axırınadək dediyim sözlərin mə`nasına diqqət edirəm. Övliya buyurur: “Bəs Allaha nə ”?vaxt diqqət edirsən

Olduqca uca mətləbdir! Elə bu söhbətdən aydın olur ki, adi insanlarla övliyalar arasında nə qədər fərq var. Hər halda çalışmalıyıq ki, öz zəif zikrimizə ilahi rəng verək və .Allahdan istəyək ki, övliyalara nəsib etdiyi ləzzətdən bizə də daddırsın

Bə`zi insanlar namazda o qədər diqqətsiz olurlar ki, namaz qıldıqlarını yalnız namazı bitirdikdən sonra xatırlayırlar. Bir mərtəbə üstün olanlar namazın sözlərinə diqqət edir. Növbəti mərhələdə insan dediyi sözlərin mə`na dərinliyinə varır. Daha sonrakı mərhələdə əvvəlcə qəlb, sonra isə dil danışır. Hər bir insan daha yuxarı mərtəbəyə qalxmaq üçün sə`y göstərməlidir. İnsan özünü elə tərbiyə edə bilər ki, təkcə namazın sözlərinə yox, hətta ətrafdakı bütün şeylərə diqqət verdikdə Allahı xatırlayar. Məsələn, üzünə toxunan küləyi hiss edən insan ani olaraq Allahın qüdrətini yada salıb, duyduğu sərinliyə görə Böyük Yaradana şükr edə bilər. Beləcə, insan Allahın zikrini artırmaq və .dediyi hər bir sözün mə'nasını dərindən düşünməklə təhlükəli qəflətdən xilas ola bilər

## :ON BİRİNCİ DƏRS

## DİLİN ZİKRİ İLƏ QƏLBİN ZİKRİ

### ÖTƏN MÖVZULARA BAXIŞ

Ötən bəhslərdən mə`lum oldu ki, ayə və rəvayətlərə, əqli və təcrübi dəlillərə əsasən, insanın süqutunun əsl səbəbi onun öz şəxsiyyətindən qafil olmasından ibarətdir. İnsani şəxsiyyətdən qəflət isə səbəb olur ki, insan digər üç şeydən qafil olur: O, hardan gəlib? hardadır? və haraya gedir? İnsaniyyətin həqiqətindən qəflət insanı süquta uğratdığı kimi, bunun ziddi olan özünüdərk və özünüqiymətləndirmə isə insanı kamilləşdirən amillərdir. İnsanın yuxarıda qeyd olunan üç suala diqqət yetirməsi elə onun .özünədiqqəti və özünütanımasıdır

Bütün diqqətlərin mərkəzində isə Allaha diqqət dayanır. İnsan özünü tanımaq üçün Allahla bağlılığını dərk etməlidir. Bu bağlılıqdan xəbərsiz insan özünü tanımaqda acizdir. Özünü və Allahla bağlılığını dərk edən insan Allahın "fe`li" olduğunu anlayır. Allah hikmət sahibi olduğu üçün Onun fe`lində, yaratdığında

da hikmət olmalıdır. Allahın dünya və insanı yaratmaqda məqsədini araşdırmaqla məad bəhsinə çatırıq. Bizi son məqsədə çatdıracaq yol nübüvvət bəhsini öyrənməklə .daha da aydınlaşır

Bütün deyilənlərdən bu nəticəyə gəlirik ki, insanı xoşbəxt edəcək ən əsas şərt Alahın zikridir. İnsanın “la ilahə illəllah” deməsinə Allahın heç bir ehtiyacı yoxdur. Sadəcə .olaraq kamala çatmaq üçün Allaha qarşı daim diqqətli olmaqdan başqa bir yol yoxdur

## QƏLB, YOXSA DİL ZİKRİ

Sual oluna bilər ki, zikrin sözləri insanın diqqətini Allaha yönəldə bilərmi? Yoxsa həqiqi zikr dil yox, qəlb zikridir? İlk nəzərdən belə görünə bilər ki, əsl zikr qəlb zikridir və dil zikri qəlb zikrinə yol tapmaq üçün bir vasitədir. Amma bu müxtəsər cavab qənaətbəxş deyil. Əgər dil zikri faydasızdırsa, bu məsələyə tə`kid edən ayə və hədislərdə məqsəd ?nədir? Daim Allahı xatırlayan insanın dil zikrinə ehtiyacı yoxdurmu

Sufilər arasında istər qəlb, istərsə də dil zikrində ifrata varma halları müşahidə edilir. Onlar dairəvi əyləşərək “zikr dairəsi” deyilən mərasim keçirirlər. Xüsusi avaz və hərəkətlərlə, uca səslə bir neçə saat ardıcıl eyni zikri təkrarlayırlar. Onlar bu zikri aşkar zikr adlandırırlar. Digər bir sufi firqəsi yalnız qəlb zikri ilə kifayətlənir. Namazın əvvəlindən axırınadək azca da olsa dillərini tərpətmirlər. Onlar iddia edirlər ki, dil zikri .qəlb zikrini oyatmaq üçündür və insan qəlbən zikr edirsə, dil zikrinə ehtiyacı yoxdur

Əhli-beyt maarifi nəzərindən yuxarıda qeyd olunmuş hər iki nəzəriyyə yanlışdır. Çünki ayə və rəvayətlərdə xüsusi zikrlər buyurulmuşdur. Bu zikrləri artırıb-əskiltmədən demək lazımdır. Mərhum Əllamə Məclisi “Bihar” kitabında imam Sadiqdən (ə) belə bir rəvayət nəql edir: “Tezliklə elə günlər (gecələr) gələr ki, aranızda sizi hidayət edəcək ”imam olmaz. Əgər “ğəriq

.duası oxumasanız, o günlərin qaranlığından qurtul-mazsınız

Əbdullah ibni Sinan imamdan soruşur ki, bu hansı duadır? Həzrət buyurur: Dua belədir: .Ya Əllahu, ya rəhmanu ya rəhimu ya muqəllibəl-qulubi səbbit qəlbi əla dinik

Əbdullah ibni Sinan deyir ki, mən duanı təkrar edərkən “ya muqəllibəl-qulubi vəl-”.əbsar” dedim. İmam məni saxlayıb “necə dedimsə, elə də təkrar et” buyurdu

Hədisdən aydın olur ki, xüsusi dualarda bir kəlmə də olsun belə yerbəyer etmək olmaz. Namazda həmd və surəni dillə demək də dini zərurətlərdəndir. Namazda yalnız qəlb zikrini kafi bilmək yanlış düşüncədir. Cəmiyyətdə geniş yayılmış cahil bir fikir var: “Təki qəlb pak olsun, namaz əsas deyil.” Hicaba münasibətdə də həmin cahil ideya ilə üzləşirik. Bir çox xanımlar “hicab əsas deyil, təki qəlb düz olsun” deyirlər. Bu nadanları bir sualla oyatmaq istərdik: Ey dini əmrlərə qarşı çıxanlar! Doğrudanmı siz özünüzü !?qadir Allahdan elmli sayırsınız

İnsan! Sənin özündən din ixtira etmək haqqın yoxdur. Biz Qur`an və rəvayətlərə müraciət edərək əməl yolunu öyrənməliyik. Eləcə də Allahı xatırlama, zikr mövzusunda adı gedən mənbə`lər-dən göstəriş almalıyıq. İmam Sadiq (ə) buyurur: “Atam çox zikr edərdi. Yolda getdiyi zaman, hətta camaatla ünsiyyətdə olduğu vaxt mən onun daim “la ilahə illəllah” dediyini eşidirdim.” Məgər bütün rəvayətləri qulaqardına vurmaq olarmı?! Əgər o böyük şəxsiyyətlər dildə zikr etmişlərsə, dil zikrini faydasız adlandırmaq olarmı?! Unutmayaq ki, xeyrli aqibətə çatmaq üçün Əhli-beytə .iqtidadan savayı yolumuz yoxdur

## DİL ZİKRİNİN BƏ`Zİ FAYDALARI

:Dil zikrinin bə`zi faydalarına nəzər salaq

Əvvəla ibadətdən bədənin hər bir üzvü faydalanmalıdır. Gözün ibadəti Qur`an ayələrinə baxmaqda, Kə`bə evinə nəzər salmaqdadır. Qulağın ibadəti Qur`an ayələrini dinləməkdir. Əgər qəlb ilahi məhəbbətlə dolarsa, bu, onun üçün ibadət hesab .olunar. Beləcə, dil üçün də ibadət nəzərdə tutulmuşdur və bu ibadət Allahın zikridir

Dil zikrinin tərbiyəvi əhəmiyyəti də vardır. İnsan Allaha diqqətini artırmaq üçün dil zikrinə nail olmaq daha asandır. Dünya bər-bəzəyi ilə üz-üzə dayanıb, daim qəlb zikrinə məşğul olmaq olduqca çətindir. İnsan mütaliə etməli, qazanc ardınca düşməli, din qardaşlarına yardım göstərməli, qohumlara baş çəkməli və sair gündəlik vəzifələrini yerinə yetirməlidir. Bu işləri yerinə yetirərkən daim düşünən insanın ardıcıl şəkildə Allahı xatırlaması müşkül məsələdir. Çoxları hətta namaz zamanı da gündəlik işlər barədə düşünürlər. Bir sözlə, adi insanlar üçün dil zikri daha rahatdır. Dil zikrinə adət verən insan tədricən qəlb zikrinə də nail ola bilər. Deməli, dil zikri diqqəti .toplamaq üçün ən yaxşı vasitələrdəndir

## QƏLB ZİKRİNİN BƏ`Zİ XÜSUSİYYƏTLƏRİ

Qəlb zikrinin müstəsna faydaları hamıya mə'lumdur. İnsanın mə`nəvi yüksəlişi, təkamülü-nün əsası Allahın qəlbən xatırlanmasıdır. Həcc zamanı Kə`bə evini təvaf edən (dolanan) insan üçün bu müqəddəs məkanı qəlbən təvaf etmək çox mühümdür. Əgər Kə`bə evini təvaf edən şəxsin fikri dünya işlərində, alverdə qalarsa bu ziyarətin dəyərindən danışmağa dəyməz. Ayə və rəvayətlərdə bir çox ibadətlərin qəbulu üçün qəlbin iştirakı zəruri şərt hesab olunur. “Biharul-ənvar”da gecə səh:٧٣

ibadətlərinə işarə ilə buyurulmuş belə bir hədis var: “Nə çoxdur gecəni oyaq qalıb oyaqlıqdan başqa bəhrə görməyənlər.”(١) Həmin kitabın ٩۶-cı cildində buyurulur: “Nə ”.çoxdur oruc tutub, aclıq və susuzluqdan başqa bəhrə görməyənlər

Qəlb zikri haqqında birinci onu qeyd etməliyik ki, o, təkamül üçün əsas şərtdir. Qəlbinin .iştirakı olmadan bir ömür dil zikri edən insan heç vəchlə kamala çata bilməz

Qəlb zikrini dil zikrindən üstün edən xüsusiyyətlərdən biri onda riyanın olmamasıdır. Riyakarlıq insanın bütün zəhmətlərini puça çıxarmağa qadirdir. Zahirən görünməyən ibadət-lərdə riya mümkün deyil. Məsələn, insan qeyri ilahi niyyətlərlə, kiminsə xoşuna gəlmək üçün dilində zikr deyib, namaz qıla bilər. Amma qəlb zikri, oruc kimi ibadətlərdə riyakarlıq qeyri-mümkündür. Nə oruc, nə də qəlb zikri gözə görünmədiyindən bu ibadətlər vasitəsi ilə yalnız Allahı razı salmaq olar. Məsələn, ulduzlu səmanı seyr etməklə qəlbində Allaha həmd oxuyan insanın bu böyük ibadətini kim hiss edə bilər?! .Bəli, qəlb zikri bu sayaq ilahi səmimiyyətə malikdir

Allah-təala bütün qəlbləri Özünə sarı yönəltməkdədir. Hər kəs səmimi qəlblə ibadət yolunda bir addım atarsa Allah ona qat-qat yardım göstərər. Sadiq bəndələrə qəflət üz verdikdə, Allah Özü bir səbəblə bu qəfləti aradan qaldırır. Bə`zən belə bəndələr Allahın lütfü ilə başqalarını görmədiklərini görər və günahdan çəkinərlər. Bəli, məhbub həqiqi !aşiqi qəflətdən oyadıb onun diqqətini özünə cəlb edər

## QƏLB ZİKRİNİN NÖVLƏRİ VƏ DƏRƏCƏLƏRİ

Dil zikri üçün konkret zaman, məkan və miqdar tə`yin olunmamışdır. Bu baxımdan xüsusi şəraitə malik dualar



---

.ci cild-٨٧ [۴١] -١

dua kitablarında nəql olunmuşdur. İnsan istədiyi vaxt istədiyi qədər zikr edə bilər. .Həmçinin, xüsusi dualara müraciət edə bilər

Amma qəlb zikri haqqında dərin mütaliə və araşdırmalara ehtiyac var. Bu sahədə övliyaların məsləhətləri çox faydalıdır. Bə`zi sufilər qəlb zikri sahəsində bir sıra ixtiralar etsələr də, bu ixtiralar şəriətlə uzlaşmır. Ona görə də ayə və rəvayətlərdən istifadə .etməyi lazım bilirik

Qəlb zikrinin üç mərhələsi vardır. Onun birinci mərhələsi vacibləri yerinə yetirib, haramları tərk etməklə gerçəkləşir. "Üsuli-kafi"nin ٢-ci cildində belə bir hədis nəql olunur: "Allahı daim zikr etmək ardıcıl olaraq "Sübhanəllah", "Əlhəmdulillah" sözlərini dilə gətirmək demək deyil. Məqsəd Allahın tə`yin etdiyi vacib və haramlara riayət etməkdir." Qəlb zikrinin ikinci mərhələsi şübhəli və xoşagəlməz (məkruh) işləri tərk etməkdir. Demək, zikrin bu mərtəbəsində insan çalışmalıdır ki, Allahın iradəsinə zidd hərəkət etməsin. Əslində zikrin bu mərtəbəsi elə təqvadır. Yada salaq ki, təqva Allahı narazı salacaq işlərdən çəkinmək-dir. Təbii ki, hər bir işdə Allahın razılığını düşünmək elə onu xatırlamaqdır. Allahdan qəflətdə olan insan dini vəzifələrə lazımınca riayət etməkdə acizdir. Vacibə əməl edib haramdan çəkinmək ilahi zikrin başlanğıc .mərhələsidir

Qəlb zikrinin ikinci və üçüncü mərhələləri cənab Əbuzərin Həzrət peyğəmbərdən nəql etdiyi bir hədisdə bəyan olunur. Bu hədis həm şiə, həm də sünnü mənbə`lərində nəql edilmişdir. Bu hədisdə Əbuzər Həzrət Peyğəmbərdən ehsan haqqında soruşur. Sualı doğuran isə "Maidə" surəsinin ٩٣-cü ayəsi olur: "İman gətirib saleh əməl edənlərə təqvalı olub, iman gətirərək saleh işlər görsələr, yenə təqvalı ikən iman gətirsələr və təqvalı ikən yaxşılıq etdikləri təqdirdə daddıqları (yeyib içdikləri) şeylərdən ötrü heç bir .günah yoxdur

Allah yaxşı iş görənləri dost tutar.” Ayənin zahiri mə`nasından belə mə`lum olur ki, xeyirxahlar (möhsinlər) cərgəsinə qoşulmaq üçün əvvəlcə təqvalı olmaq lazımdır. Ayəni eşidən Əbuzər anladı ki, möhsinlik müttəqilikdən üstündür. Ona görə də Peyğəmbərdən (s) insanın möhsinlik sifəti olan ehsan haqqında soruşdu. Həzrət Peyğəmbər (s) buyurdu: “Ehsan odur ki, insan Allah xatirinə elə əməl etsin ki, sanki (Onu görür. Sən Onu görmürsənsə də, O səni görür.”(۱)

Hədisdən aydın olur ki, qəlb zikrinin digər bir mərtəbəsi Allahın hüzurunda olduğunu daim nəzərdə tutmaqdır. Bu mərhələyə çatmış insan özü üzərində daim Allahın nəzərini hiss edir. Elə şüşələr var ki, bir tərəfindən o biri tərəf görünsə də, o biri tərəfindən əks tərəf görünmür. İnsan özünü belə bir şüşə qarşısında hiss etməlidir; o, Allahı görməsə də, Allah onu görür. Həyatda belə bir şüşə qarşısında dayanmış insan .hər bir an onu görə bilərlər deyə öz hərəkətlərinə nəzarət edir

Qəlb zikrinin üçüncü mərtəbəsinə çatmış insan sanki Allahı görür. Bu hal insanda tez-tez təkrarlanarsa xarakter xüsusiyyətə çevrilər. Həzrət Əli (ə) “görmədiyimə ibadət edərəmmi” buyurur. Aydındır ki, söhbət bəsirət gözü ilə görməkdən gedir. Həzrət öz buyurduğuna əlavə edir: “Gözlər Onu aşkar görməz, amma qəlblər Onu iman nuru ilə (”dərk edər.” (“Nəhcül-bəlağə

Demək, qəlb zkrinin üç mərhələsi mə’lum oldu: Əməldə Allahı xatırlamaq, özünü daim .Allahın hüzurunda hiss etmək, bəsirət gözü ilə Allahı görmək

### SONSUZLUĞA DOĞRU

Əgər insan doğru yoldan azmasa, onun təkamülü üçün hər bir şərait yaradılmışdır. Şeytanın hiyləsinə uymayan



---

.Biharul-ənvar”, ۵۹-cu cild“ [۴۲] -۱

insan həm dünya, həm də axirət səadətinə nail ola bilər. Təkamül və mə`nəvi yüksəlişin hədd-hüdudu yoxdur. İnsan üçün son təkamül nöqtəsi .müəyyənləşdirilməmişdir. Məq-səd Allaha yaxınlaşmaqdır. Təkamül yolu sonsuzdur

Elə bəndələr vardır ki, Allaha yaxınlığın ləzzətindən dünyanı unudurlar. Belə insanların nəzərində adi insanların həyatı uşaq oyununu xatırladır. Uşaqlar gün uzunu sevdikləri plastik oyuncaqlarla başlarını qatır, bə`zən bu oyuncaqlara görə dalaşırlar. Adi insanların dünya həyatı, dostluğu, düşmənçiliyi, sevgisi və nifrəti uşaq oyununu xatırladır. Bütün həyatını doktor, professor, ayətullah adını almaq üçün sərf edənlər necə də gülünc vəziyyətdədirlər. Bir başqa qrup həyatının mə`nasını var-dövlət toplamaqda, dünyada qoyub gedilən qəsrlər ucaltmaqda görür. Bu sayaq həyat tərzinə dəyər verənlər insaniyyətin həqiqətindən qafildirlər. Allaha yaxınlığın ləzzətini dadan insan üçün bu ucuz şirinliklərin heç bir qiyməti yoxdur. Bu ləzzəti dadan mə`sum imamlar, o cümlədən imam Səccad (ə) belə dua edir: "Ey mənim ağam! qəlbim Səni xatırlamaqla dirilir." İmamların (ə) dilindən qopmuş duaları oxumaq və düşünməklə insan bir çox həqiqətlərə nail olar və anlayar ki, bu dünyada maddi .ləzzətlərdən qat-qat üstün olan ilahi ləzzətlər də mövcuddur

Ya Rəbb! Qəlbimizdən qəflət pərdələrini qaldır, zikr xəl`ətini boynumuza sal, görüşünü !bizə nəsib et

səh:۷۷

### :ON İKİNCİ DƏRS

### QƏLB ZİKRİNƏ APARAN YOL

### HƏR ŞEY İLAHİ ZİKR ÜÇÜN ƏSASDIR

Qeyd etdik ki, təkamül ağıl və iradə ilə gerçəkləşə bilər. Düşüncə, iradə, agahlıqla əlaqəsi olmayan yüksəliş insani kamillik deyil. Kamillik agahlıqdan asılı olduğu üçün bu yolda ən böyük maneə qəflətdir. Ona görə də təkamül yolunda hərəkətə başlamaq üçün qəflətdən çıxmaq lazımdır. Qəflətdən çıxmaq üçün bir neçə şeyə diqqət etmək zəruridir: Hər şeyin əvvəli olan Allaha, qiyamətə və yaşanılan ömrə diqqət. Deyildi ki, bu üç əsas arasında mehvər Allaha diqqətdir. Qeyd olundu ki, Allahı xatırlamağın, zikrin mərtəbələri var və ən birinci mərtəbə dil zikridir. Dil zikrini tə`sirli edən amil onun .mə`nalarına edilən diqqətdir

Dil zikrindən sonra qəlb zikri gəlir. Onun da mərtəbələri var və o həqiqi bir zikrdir. .İnsan qəlb zikrinə nail olmaq üçün çox çalışmalıdır

Zikrin son hədəfi qəlb zikri olsa da adi insanlar əvvəlcə dil zikrinə nail olmalıdırlar. Dil zikrinin əsasını təşkil edən Allahın adları və sifətləri tədricən qəlb zikrinə aparan .amillərdir

Qəlb zikrinə çatmağın yollarından biri insanın rastlaşdığı hər bir şeyin Allahla dərəcədə əlaqəli olmağı barədə düşünməkdir. Əqli və təcrübi dəlillər vasitəsi ilə sübut olunmuşdur ki, bütün varlıq aləmi Allahın məxluqudur. İnsan gözəl rəsm əsəri ilə üzbəüz dayandığı vaxt onu çəkənin mahir bir rəssam olduğunu anladığı kimi, hər bir mövcuda baxdıqda da onun yaradanı haqqında düşünə bilər. Yalnız belə bir vərdiş ələ gətirməklə qəflətdən qurtulmaq olar. İnsanı bir şeydən qəflətdə saxlayan amil onun digər bir şeyə diqqət yetirməsidir. İnsan öz yaradanından da o zaman qafil olur ki, diqqəti hansısa digər mövcudlara yönəlir. Amma hər bir mövcuda Allahın məxluqu nəzəri ilə baxdıqda Allah onunla birgə yad olunur. Hər hansı sənət əsərinin gözəlliyinə heyran olmuş insan sənətkarın ünvanına afərin söyləyir. Əgər varlıq aləminə də lazımı diqqət yetirə bilsək Yaradana həmd oxumağı özümüzə borc bilərik. Axı bütün .gördüklərimiz Allahın əzəmət, qüdrət, elm və hikmətinin əlamətidir

Əlbəttə ki, Allahın övliyaları elə bir məqama çatmışlar ki, yalnız yaradanı görürlər. Onlar heç bir mövcuda müstəqil varlıq kimi baxmırlar. Amma adi insanlar əsərə diqqət .edərkən onun yaradıcısını xatırlamağa çalışmalı və bu yolla qəflətdən xilas olmalıdırlar

## İLAHİ AYƏTLƏR BARƏDƏ TƏFƏKKÜR

Qur`anda və rəvayətlərdə istər ilahi nişanələr (ayətlər), istərsə də bu ayətlər barədə təfəkkürə geniş yer verilir. Söhbət əsəri görərkən diqqəti onun yaradıcısına yönəltməkdən gedir. Qurani-kərimdə “ayə”, “ayətullah” kəlmələri ilə tez-tez .rastlaşmaq olar

Biz, adətən, “ayə” dedikdə Qur`an ayələrini nəzərdə tutsaq da, bu sözün lüğət mə`nası “nişanə” deməkdir. Qur`an insanı ilahi nişanələr barədə düşünməyə də`vət edir. “Nəhl” surəsinin ١٠-١١-ci ayələrində oxuyuruq: “Göydən sizin üçün su endirən Odur. O sudan siz də, içində (heyvanlarınızı) otardığınız ağaclar və otlar da içər. Allah onunla sizin üçün əkin (taxıl, bitki), zeytun, xurma, üzüm və bütün meyvələrdən bitirir. Doğrudan da, bütün bunlarda düşünən qövm üçün böyük bir nişanələr (ayətlər) vardır.” “Ali-İmran” surəsinin ١٩٠-cı ayəsində isə belə buyurulur: “Həqiqətən, göylərin və yerin yaradılmasında, gecə-gündüzün bir-birinin ardınca gəlib-getməsində ağıl sahibləri üçün mütləq dəlillər vardır.” “Rum” surəsinin ٢٣-cü ayəsində oxuyuruq: “Gecə və gündüz, sizin yuxunuz onun nişanələrindəndir.” “Ənbiya” surəsinin ٣٢-ci ayəsində oxuyuruq: “Göyü qorunub-saxlanılan tavan etdik. Amma onlar bu nişanələrdən üz ”.döndərirlər

Hər birimiz özümüzdən soruşmalıyıq ki, Allahın əzəmətli nişanələri haqqında lazımınca düşünürükmü? Görən, kiçik bir toxum yoğun gövdəli ağaca necə çevrilir? Yağışın necə yağmasından, onun faydalarından xəbərdarıqmı? Əgər yalnız gündüz, ya da ki, hər zaman gecə olsaydı vəziyyət necə olardı? Bir gün yatmayanda olmazın əziyyətini çəkən insan yuxunun necə bir ne`mət olduğunu fikirləşirmi? Sonu olmayan göy aləmi və ondakı mö`cüzələr diqqətimizi cəlb edibmi? Qur`anda buyurulur ki, yer, göy, dağlar, dənizlər, günəş, ay, ulduzlar hər biri Allahın nişanəsidir. Bütün bunlar gözü qarşısında olduğu halda insan necə olur ki, Allahdan qəflətdə qalır?! Bu, ona oxşayır ki, bir şəxs ömür boyu yanında oturmuş insanın divardan asılmış şəklinə baxıb şəkil .sahibindən qəflətdə olsun

səh:٨٠

İnsana Allahı xatırladacaq ünsürlər arasında “zaman” və “məkan” xüsusi əhəmiyyətə malikdir. Həm zaman, həm də məkan Allah tərəfindən yaradılsa da bə`zən hər hansı müəyyən bir zaman və ya müəyyən bir məkan fəzilət və şərafət baxımından üstünlük təşkil edir. Bütün yer üzünü Allah yaratsa da Kə`bənin şərafəti daha çoxdur. “Maidə” surəsinin ۹۷-ci ayəsində oxuyuruq: “Allah Kə`bənin ziyarətini insanların dirçəlişi üçün vasitə qərar vermişdir.” Bütün zamanlar Allaha məxsus olsa da, müəyyən olunmuş bə’zi zamanlar daha fəzilətli və daha şərafətlidir. “İbrahim” surəsinin ۵-ci ayəsində oxuyuruq: “Allahın günlərini onlara xatırlat.” Bəs hansı günlər Allah yanında “Allah günləri” hesab olunur? Bu suala “Qədr” surəsinin ۳-cü ayəsi cavab verir: “Qədr gecəsi min aydan xeyirlidir.” Amma qədr kecəsindən başqa da şərafətli vaxtlar var. Məsələn, “Qədir-xum” günü Qur`anda qeyd olunmuş əhəmiyyətli günlərdəndir: “Bu gün sizin dininizi kamil edib, Öz ne`mətimi sizə tamamladım.”(۱) Deməк, günəş, ay, ulduzlar kimi xüsusi zaman və məkanlar da insana Allahı xatırlada bilər. O cümlədən məscid, məscidin minarələrinin insana Allahı xatırlatması salması mümkündür. Hər hansı bir ziyarətgahı, onun günbəzini uzaqdan seyr etməklə Allahı xatırlamaq olar. Beləcə, bütün dini nişanələr Allahdan danışır. “Həcc” surəsinin ۳۲-ci ayəsində buyurulur: “Allahın nişanələ-rini bir şəxs uca tutursa, həqiqətən, bu, qəlbin paklığından irəli gəlir.” Məhərrəm ayında dini mərasimlər insanların zehnində Allah və Onun övliyalarının xatirəsini canlandırır. Qur`ani-kərimdə həcc ziyarətində yerinə yetirilən dini ayinlər də Allahın nişanələri kimi təqdim olunur. Hacıların Səfa və Mərvə



---

۱- [۴۳] “Maidə” surəsi, ayə: ۳.

arasındakı sə`yləri (gedişi) də bu nişanələrdəndir. “Bəqərə” surəsinin ۱۵۸-ci ayəsində oxuyuruq: “Həqiqətən, Səfa və Mərvə ilahi nişanələrdəndir.” Cəmiyyətdə ilahi nişanələrin genişlənib uca tutulmasına çalışanlar əslində insanlara Allahı xatırlatmağa .çalışırlar

## İLAHİ NİŞANƏLƏR

İlahi nişanələrdədn biri də ruhani libasıdır. Bu libas onu geyinən şəxs üçün böyük iftixardır. Çünki, insan geydiyi ruhani libasla ətrafdakılara Allahı xatırladır. Sözsüz ki, xüsusi bir zəhmət çəkmədən yalnız öz libasıyla Allahı yada salmaq insana olunan ilahi bir lütfdür. Ruhani libasını görən insanın zehnində ani olaraq məscid, Qur`an, dua və sair dini əlamətlər canlanır. Hətta ruhanilərə mənfi münasibətdə olanlar onlarla rastlaşarkən əvvəlcə Allahı xatırlayırlar. Şübhəsiz ki, Allahın nişanəsini daşıyan insan öz mə`nəviyyatı ilə seçilməlidir. Ləyaqətsiz insanın ruhani libası geyməsi bu libas, eləcə də, din haqqında mənfi fikirlər doğurur. Ruhani libası geymək iftixardırsa, onun .şə`ninə layiq olmamaq böyük günahdır

## İLAHİ NİŞANƏLƏRƏ MÜNASİBƏT

Diri qəlbli insanın mə’nəviyyatı dini nişanələrlə rastlaşdığı vaxt güclənir, Allaha diqqəti daha da artır. Bu nişanələrlə rastlaşarkən qəlbində biganəlik, mənfi münasibət hiss edən insan anlamalıdır ki, tənəz-zülə doğru gedir. Dini ayətlərin müşahidəsindən duyulan sevinc hissi isə insanın təkamül yolunda olmasının əlamətidir və bu sevincə .görə insan Allaha şükr etməlidir

Amma bu nişanələrə nifrət edənlər də var. “Zumər” surəsinin ۴۵-ci ayəsində oxuyuruq: “Allah tək olaraq xatırlandığı zaman axirətə iman gətirməyənlərin qəlbləri sıxılar. Allahdan qeyrisi yad edildikdə isə

onlar sevinərlər.” Bəli, Allahın adını eşitməklə qəzəblənəcək qədər alçalmaq olarmış. Beləəri Allahın adı çəkilərkən beləəri narahat olur. Qur`anda belə bir hal axirətə .imansızlığın əlaməti kimi göstərilir

### BİGANƏLİK NÜMUNƏLƏRİ

Bu günün özündə də elə insanlarla rastlaşırıq ki, millət və adət-ən`ənədən dəm vurur, keçirdiyi mərasimlərə dini büdcədən (beytul-maldan) pul xərcləyir, amma Allahdan və dindən söhbət düşəndə narahat olur. Onlar yalnız öz nəfsani istəklərinə çatmaq üçün özlərini dinə yaxın adam kimi göstərirlər. Beləəri dinə zidd mərasimlərə pul xərcləyir, növbə məscidə çatdıqda “qoy, məscid əhli özü çalışsın” deyir. Acı da olsa, aramızda hətta şəhid adından narahat olanlar da var. Bu insanlar dini və mə`nəvi dəyərlər üçün çalışanlara təşəkkür etmək əvəzinə onlara mane olurlar. “Kəhf” surəsinin ۵۷-ci ayəsində buyuru-lur: “Allahın ayələri ilə nəsihət edildiyi zaman üz çevirən və etdiyi əməlləri unudan kəsdən daha zalım kim ola bilər?” Beləəri susuzluqdan dodaqları çat-.çat olduğu halda təklif edilən suyu dağıdan xəstəyə oxşayırlar

Ə`raf” surəsinin ۱۷۹-cu ayəsində oxuyuruq: “Onların qəlbləri varkən anlamaz, gözləri“ varkən görməz, qulaqları varkən eşitməzlər.” Belə xəstələr üçün ən gözəl dərman Allahın zikridir. Amma onlar öz dəvasından üz döndərir, zəlalətlərini artırırlar. Onların fikrincə artıq dindarlıq zamanı başa çatmış, insan “modernizə” olunmuşdur. Guya, kamilləşmə, həqiqət yolunda fədakarlıq, bəndənin yaradan qarşısında ibadəti köhnənin qalığıdır. Guya, bəşər tarixində quldarlıq dövrü başa çatmış və insan azad olmuşdur! Sual olunur: Yalnız Allaha itaət edən kəs azaddır, yoxsa nəfsinə və dövrün iyrənc əxlaqsızlığına qul olan kəs? Əsl Allah bəndəsi həqiqət yolunda canından keçir, amma zülmə baş əymir. Nəfsini özünə tanrı edənlər isə gündə min bir səh:۸۳

boyaya girərək insani şəxsiyyətini satır. Kimdir azad? Bu qəbil insanlar Allaha inanmır və bu inamsızlıq səbəbindən də din, mə`nəviyyat mövzusundakı söhbətlərdən narahat olurlar. Onlar hər vasitə ilə dini mərasimləri aradan qaldırmaq, insanların düşüncəsini musiqi, rəqs, əxlaqsız filmlərlə məşğul etmək istəyirlər. Hətta e`tiqadlı insanları aldatmaq məqsədi ilə öz proqramlarında tez-tez “Allah” kəlməsini işlədirlər. Hətta bə`ziləri çox cazibədar səslə Qur`an oxuyub, əməldə Qur`ana zidd hərəkət edirlər. Məgər Qur`an yalnız gözəl səslə oxunmaq üçünmü nazil olub? Mə`nasını anlayıb əməl etmədən Qur`an oxumağın faydası nədir?! Bütün bunlar şeytan .fitnəsindən başqa bir şey deyil

İnsanlara dini təbliğ edən şəxs dinə biganə olmamalıdır. Xalqı Allah zikrinə çağıran .ruhaninin əməli sözü ilə uyğun gəlməlidir. Ruhaniliyə peşə kimi baxmaq əsla düz deyil

Bir sözlə, insan hər bir əsərə baxanda onun yaradıcısını xatırlamalıdır. Sudan ləzzət alan insan bu ne`məti bəxş etmiş Allahı unutma-malıdır. “Vaqiə” surəsinin ۶۸-۷۰-ci ayələrində buyurulur: «Buludlardan suyu endirən sizsiniz, yoxsa biz? Əgər istəsək onu acı edərik. Bəs nə üçün şükr etmirsiniz?» İnsan hər bir məxluqa baxdıqda onun xaliqini .düşünməklə qəflətdən qurtula bilər

## :ON ÜÇÜNCÜ DƏRS

## ZİKR ÜÇÜN ÜMDƏ MANEƏ

### ÖTƏN MÖVZULARA BAXIŞ

Qur`an ayələrindən aydın oldu ki, insanın süqutunun əsl səbəbi qəflətdir. İnsanın özündən, öz insani şəxsiyyətindən qəfləti onu uçuruma aparır. İnsanın özündən xəbərsiz olması onun tövhid, məad və nübüvvətdən qəflətdə olmasının nəticəsidir. Qur`an ayələri bu müddəanı təsdiqləyir: “Allahı unutdular və

O da onlara özlərini unutdurdu."(١) Digər ayələrdən mə`lum olur ki, özünə diqqətin səmərəsi hidayət və Allaha yaxınlaşmaqdır. Qeyd etdik ki, üç inanc arasında tövhid mehvər rolunu oynayır. Başqa sözlə, məad və nübüvvətə inam tövhidə inamdan doğur. Allahı tanıyan insan anlayır ki, Allah hikmətsiz iş görməz və yaranış məqsədsiz deyil. Beləcə, Allaha diqqət yetirmək insanı məad və qiyamətə də diqqət yönəltməyə .sövq edir. Allahı tanıyan insan əmindir ki, nə vaxtsa sorğuya çəkiləcəkdir

İnsanın diqqət mərkəzində olmağı lazım olan üç əsasdan biri məad, yə`ni axirət aləmidir. Axirət aləmi Allahın insan üçün nəzərdə tutduğu son mənzildir. Ayələrdə bildirilir ki, insanın əsl bədbəxtçiliyinin səbəbi qiyamət gününü unutmasıdır. Hesab gününə inanan insan əbədi cəhənnəm əzabına düçar olmamaq üçün saleh əməllər etməyə sə`y göstərir. Dünyanı əbəs bilməyən insan əməllərinə diqqət yetirir, öz insani .şəxsiyyətini qoruyur

## UNUDULMUŞ BƏNDƏLƏR

Mu`minun" surəsinin ١١٥-ci ayəsində qiyamət gününü unudanlara işarə ilə buyurulur:" "Elə güman edirsiniz ki, sizi əbəs yerə yaratmışıq və hüzurumuza qayıtmayacaqsınız?!" "Casiyə" surəsinin ٣٤-cü ayəsində oxuyuruq: "Bu günlə rastlaşacağınızı unutduğunuz kimi biz də bu gün sizi unuduruq." Bu o demək deyil ki, bə`zi bəndələr Allahın yadından çıxacaq. Söhbət ləyaqətsiz insanların ilahi ne`mətlərdən məhrum ediləcəyindən gedir. Bəli, Allah Onunla görüşə inanmayanları Öz lütfündən məhrum edər. "Taha" surəsinin ١٢٤-١٢٦-cı ayələrində oxuyuruq: "Hər kəs Məni yad etməkdən üz döndərsə həqiqətən .yaşayışı çətin olar və qiyamət günü onu kor məhşur edərik



---

.Həşr" surəsi, ayə: ١٩" [٤٤] -١

O, deyir: Pərvərdigara, məni nə üçün kor məhşur etdin, axı mən görürdüm. Ona buyurular: «Sənə ayələrimiz gəldikdə onları unutduğun kimi sən də unudulursan.» Ayədə həqiqəti anladıqları halda üz döndərənlər nəzərdə tutulur. Qur`an belə insanlara sıxıntılı həyat və`d edir. "Rə`d" surəsinin ٢٨-ci ayəsində buyurulur: "Agah ol ki, qəlblər yalnız Allahı zikr etməklə aram olar." Allahı yaddan çıxaranlar ruhi sakitlikdən məhrum olur, daim iztirab çəkir. Bu sıxıntı dünya həyatını zəhərə döndərir. Axirətdə isə çətinliklər lap dözülməz olur. Dünya həyatında ilahi həqiqətləri .görməməzliyə vuranlar axirət həyatına kor vəziyyətdə gətirilir

Bəli, insan üçün ən böyük bədbəxtlik Allahın nəzərindən kənarda qalmasıdır. Səadət və kamala çatmaq istəyən insan öz yaradanına qarşı e'tinasız olmur. Allahı unudan isə özünü unudur. O, nə üçün yaradıldığını və səadətə aparacaq doğru yolu unutmaqla .cəhənnəmə üz tutur

### ZİKRƏ DOĞRU BİR ADDIM

Yeganə çıxış yolu qəflətdən qurtulmaqdadır. Hər bir şəxsin agahlıq dərəcəsi onun öz nəfsini tanımasından asılıdır. Agahlıq insanın öz diqqətini haradan gəldiyinə, harada olduğuna və haraya gedəcəyinə yönəltməsidir. İnsan dünyanın bər-bəzəyinə aldanaraq bu uyğun məsələlərdən qəflətdə qaldıqca öz insani şəxsiyyətindən uzaqlaşır. Yalnız tövhid, nübüvvət və məad vasitəsi ilə kamilləşə biləcək insan qəflət doğuran səbəbləri tanımalıdır. "Ən`am" surəsinin ٦٨-ci ayəsində qəflət amilləri belə tanıtdırılır: "Bizim ayələrimiz barəsində cəfəng danışan şəxsləri gördüyün zaman söhbət dəyişənədək onlardan üz çevir. Şeytan sənin yadından çıxarsa, yadına düşəndən sonra zülmkar qövmlə oturma." Ayədən mə`lum olur ki, qəflət səbəblərindən biri şeytandır. Qur`an şeytan dedikdə

İblisdən olanları nəzərdə tutur. İblis isə Adəmə səcdə etməkdən boyun qaçıran şeytandır. Amma Qur`ani-kərimdə bütün şər mənbələri, eləcə də, şər cinlər və şər insanlar şeytan adlandırılır. İnsanı təkamül, Allaha itaət yolundan sapdıran hər bir mövcud şeytandır. İblis bu şər qəbiləsinin rəisidir. Bütün şər qüvvələr onun .məktəbində təhsil alır

### ZİKRİN AMİLLƏRİ VƏ MANEƏLƏRİ

Diqqət və zikrin əsas amillərindən biri Qur`ani-kərimdir. Bə`zən Qur`an özünü zikr də adlandırır: “Bu yalnız zikr və aşkar bir Qur`andır.”(۱) Qur`anın zikr adlandırılmasının səbəbi onun oyadıcı, xatırladığı xüsusiyyətə malik olmasıdır. Qur`ana bağlanan insan qəflətdən qurtulur. Agahlıq tapmaq istəyən insan Qur`anla ünsiyyət üçün xüsusi proqram hazırlamalıdır. “Qəmər” surəsində dəfələrlə təkrarlanan bir ayə var: “Qəti olaraq, Qur`anı insanın nəsihəti üçün göndərdik; Görən, nəsihət götürən varmı?”(۲) Qur`an hər bir insanın istifadə edə bilməsi üçün olduqca sadə qərar verlidi. Bir ayənin dörd dəfə təkrar olunmasında məqsəd yalnız və yalnız insanı qəflətdən qurtarmaqdır. Əlbəttə ki, yalnız Qur`anın mə`nalarına diqqət edərək oxuduqda agahlıq tapmaq .mümkündür

Qur`anla ünsiyyət, onu dinləyərkən mə`nalarına diqqət etmək insana oyadıcı tə`sir bağışlayır. Əgər mə`nasız söhbətlərə qulaq asmaq Allahı unutdurursa, Qur`an insana Allahı xatırladır. “Ən`am” surəsinin ۶۸-ci ayəsində buyurulur: “«Zülmkar qövmlə oturma.” Qur`ani-kərimdə ən böyük zülm şirk hesab olunur: “Doğrudan da, zülm böyük günahdır.”(۳) Şirk olduqca



---

.Yasin” surəsi, ayə: ۶۹“ [۴۵] -۱

.Qəmər” surəsi, ayə: ۱۷, ۲۲, ۳۲, ۴۰“ [۴۶] -۲

.Loğman” surəsi, ayə: ۱۳“ [۴۷] -۳

(böyük günah hesab olunur: "Allah Ona şərik qoşanları bağışlamaz."(١

Qeyd olundu ki, şeytansifət adamlarla oturub, onların söhbətinə qulaq asmaq insanı qəflətə doğru aparır və zülm hesab olunur. Dini həqiqətlərə qarşı insanların zehnində şübhə doğuran məclislərdə iştirak etmək yolveril-məzdir haldır. Dövrümüzdə az da olsa belələrinə təsadüf edirik. Onların işi avamlarda şübhə doğuracaq suallar verməkdir: "Qur`an Allahın kitabıdır, yoxsa peyğəmbərin? Görəsən, Qur`anda səhv var ya yox?" Sonra da özləri öz suallarına şeytan-şeytan cavablar verirlər. Hətta Allahın göstərişlərinin təcrübədə sınaqdan keçiril-məsini təklif edənlər də var. Qur`an belə insanlardan çəkinməyi tapşırır. "Nisa" surəsinin ١۴٠-cı ayəsində buyurulur: "Əlbəttə, kitabda sizə nazil etmişdir ki, Allahın ayələrinin inkar edildiyini və onlara istehza olunduğunu eşitdiyiniz zaman onlar ayrı bir söhbətə girişməyincə onlarla oturmayın. Ona görə ki, siz də onların tayı olarsınız. Allah münafiqləri və kafirlərin ".hamısını cəhənnəmdə bir yerə cəm edəcəkdir

## MƏSXƏRƏÇİLƏR

Müsəlmanlar arasında da Qur`an ayələrini məsxərə edənlər tapılır. Onlar Qur`anın günahkarlar haqqında çıxardığı qərarlara istehza edərək deyirlər: "Axı indi modern bir əsrdir. Belə bir əsrdə şallaq vurmaq olarmı?! Bu cəzalar quldarlıq dövrünün əlamətləridir. Sivil dünyada insanı belə cəzalandırmaq olmaz!" Belə çıxır ki, bir atom bombası ilə bütöv bir şəhəri məhv etmək sivil, başqasının namusuna toxunana şallaq vurmaq isə vəhşilikdir. Demək, insanı elektrik stulunda oturtmaq mədəniyyət, şallaq isə mədəniyyətsizlikdir. Bir sözlə, Qur`ani-kərim buyurur ki, belə düşünən və belə



---

.Nisa" surəsi, ayə: ۴٨" [۴٨] -١

danışan insanlarla yaxınlıq etməyin. Savadsızlıq ucbatından bu söhbətlərə uyub doğru yoldan azmaq qorxusu var. Müəllif şəxsən özü tanınmış bir ruhanidən “insanı eşşək kimi qırmaclamaq olmaz” sözlərini eşidib. Hansı ki, bu ruhani Qur`andan və Qur`anın “Nur” surəsinin ٢-ci ayəsindən gözəl xəbərdardır. Bu söhbətdən on beş-iyirmi il ötüb. Bu gün eyni sözləri həmin ruhaninin şagirdləri təkrarlayır. Onlar bir tərəfdən Qur`anı qəbul etdiklərini iddia edir, digər tərəfdən Qur`anın hökmlərini köhnəlmiş sayırlar. Hansı ki, min dörd yüz il əvvəl nazil olmuş Qur`an aktual olaraq qalır. Qur`an puç sözlər danışanlarla yaxınlığı qadağan edir. Çünki təlqinin tə`sirini o hamıdan yaxşı bilir. Nahaq bir sözü şirin üslubda təkrar-təkrar eşidən insan bu sözlərə inanmağa başlayır. Təlqinin insana tə`sirindən xəbərdar olan şeytanlar da bu üsuldan istifadə edərək düşüncələri azaddır. Bu barədə mö`təbər bir rəvayət vardır: “Danışanı dinləyən insan ona pərəstiş etmişdir. Danışan Allah kəlamı danışırsa Allaha, şeytan sözü danışırsa şeytana pərəstiş olunmuşdur.”(١) Bir sözlə, dinə rişxənd olunan məclislərdə iştirak .etmək əsla olmaz

### ZUMƏR” SURƏSİNDƏN İKİ AYƏ“

Bə`zən yuxarıda qeyd etdiyimiz həqiqətlərə qarşı hətta Qur`an ayələrindən də istifadə edirlər. “Zumər” surəsinin ١٧-١٨-ci ayələrində buyurulur: “«O bəndələrimə müjdə ver ki, onlar sözü dinləyib, onun ən yaxşısına tabe olarlar.” İnsanları azdırmaq qəsdində olanlar bu ayələri dəlil gətirərək iddia edirlər ki, bütün sözləri dinləmək Qur`an əmridir. Sual olunur: Haqq sözlə batili seçmək qüdrətinə malik olmayan insana Qur`an hər sözü dinləmək göstərişi verərmi? Əgər Qur`an insanları doğru yola hidayət edirsə bu



---

.Biharul-ənvar”, ٧٢-ci cild“ [٤٩] -١

ayəni bütün adamlara aid etmək yanlışdır. Ayə haqqı batildən seçmək əzmində olan insanlara müraciət edir. Batil söhbətlər nadan və zəif əqidəli insanları bir anda çaşdırır. Ona görə də adi insanlar zəlalətə düçar olmamaq üçün belə söhbətlərdən qaçmalıdırlar. Qur`anda batil sözləri sadəcə dinləmək yox, bu sayaq söhbət edənlərlə yaxınlıq etməmək də tapşırılır. "Nisa" surəsinin əvvəldə qeyd etdiyimiz ۱۴۰-cı ayəsinin sonunda buyurlur: "Allah münafiq və kafirlərin hamısını cəhənnəmdə toplayacaq." Yə`ni bir qrup insan mö`min olduğunu güman etsə də azğın insanlarla yoldaşlıq etdiklərindən qiyamət səhnəsinə münafiq kimi gətiriləcəklər. Çünki, Allah və din .haqqında deyilən batil sözlərə itaətkarlıqla qulaq asmaq mö`min sifəti deyil

Bəs "Zumər" surəsinin uyğun ayələri kimi nəzərdə tutur? Bilməliyik ki, belə sözlərin qabağında yalnız güclü imana və dini savada malik şəxslər dayana bilər. Hər hansı batil sözə cavab vermək üçün iman və elmə ehtiyac var. Tutaq ki, Allaha, peyğəmbərə və məada iman gətirmiş bir şəxs şeytani məclisə düşür. Əgər o öz e`tiqadında tutarlı dəlillərə malikdirsə bu dəlillərə istinad etməklə özünü və olsun ki, bu məclisdəkilərin də bə`zilərini şəkk-şübhədən qurtaracaq. Amma qənaətbəxş dəlillərə malik olmayan şəxs üçün imanını itirmək qorxusu var. Müasir dövrdə kütləvi informasiya vasitələrin-dən dini həqiqətlər haqqında batil sözlərə yol verilir. Demək, sən şeytandan qaçsan da, o, məsələn, televiziya vasitəsi ilə sənin evinə daxil olur. Ona görə də hər bir müsəlman .öz elmini artırmaqla özünü əks təbliğatlara qarşı hazır etməlidir

Bəli, pis həmsöhbət və yoldaş insanı zəlalətə aparır. Həmsöhbətin təkcə e`tiqadı yox, əxlaqı da mühüm şərtdir. Günahkar insanlarla yoldaşlıq insanı dini çərçivədən çıxarır, ,azğınlığa sövq edir. İstər e`tiqad

!istərsə də əxlaq baxımından azğın insanlardan uzaqlaşın

,Yarımın yarından var intizarım

.Dua gözləyirəm, min qınaq gəlir

Qəfəsdəki xəstə bülbül barədə

!Nə düşünür qızılquş? - maraq gəlir

,Çox deyiblər yarı gör, özün danış

.Peyk sözündə ifrat, təfrit, aldanış

,”Sən ha yalvar sözçüyə “düzgün danış

.Ağzın açdı, lap yaxın iraq gəlir

,Dərdimin dəvası dost dilindədi

,Deməsin hər nə var Yar əlindədi

,Səbəbkar da təbib məsəlindədi

.Yerə deyər, göylərdən soraq gələr

### GƏNGLƏR QARŞISINDA MƏS`ULİYYƏT

Elə bir dövrdə yaşayırıq ki, əksər ölkələrdə tə`lim-tərbiyə adı altında gənclər azğınlığa sürüklənir. Gənclərin istirahəti üçün təşkil olunmuş əksər mərkəzlərdə onları əxlaqsızlığa aparan tədbirlər keçirilir. Tələbələrə mə`nəviy-yatsızlıq təbliğ edən filmlər və konsertlər təqdim olunur. Görən, bu tədbirlər gəncliyə xidmət, yoxsa xəyanətdir? Belələrinə demək lazımdır ki, din bir yana dursun, heç olmaya dəm vurduğunuz milli adət-ən`ənələrə hörmət edin. Gənclər hər bir ölkənin sərmayəsi və gələcəyidir. Ölkənin gələcəyi üçün mə`nəviyyatsızlar ordusu hazırlamaq xəyanət deyilmi? Bu iş insani şəxsiyyətin tə`minatı olan din və e`tiqada qəbir qazmaqdır. “Bəqərə” surəsinin ”.۱۹۱-ci ayəsində buyurulur: “Fitnə qətldən daha pisdir

Axı bəşəriyyəti zülmətdən çıxaran din hansı əsasla mədəniyyətə zidd təqdim olunur? Əgər Allah-təala insanlara din göndərib, onlara insanlığı öyrətməsəydi insan mədəniyyət sözündən xəbərdar olardımı?! Amma bu gün mədəniyyət adı altında din və əxlaqa zidd olan filmlər çəkilir, kitab və qəzetlər çap olunr. “Nisa” surəsinin ۱۴۰-cı ayəsini bir daha xatırlayaq: “Allah-təala münafiq və kafirlərin hamısını cəhənnəmdə ”.toplayacaq

:ON DÖRDÜNCÜ DƏRS

TƏFƏKKÜRÜN ƏHƏMİYYƏTİ

DİQQƏTLİ OLMAQDA TƏFƏKKÜRÜN ROLU

Ötən söhbətlərdə Qur`an ayələri və əqli dəlillərdən mə`lum oldu ki, bütün azğınlıqların əsas səbəbi insanın özündən, öz insani şəxsiyyətindən xəbərsizliyidir. İnsan azad bir varlıq olduğundan səadət yolunu özü seçməlidir. İnsan özünə qarşı diqqətli olub, öz yaranış məqsədini anlasa səadətə çata bilər. Amma öz şəxsiyyətini unudan insanın heyvan dərəcəsinə, hətta heyvandan da alçaq dərəcəyə alçalması mümkündür: (“Onlar heyvan kimidirlər, bəlkə, daha çox zəlalətdədirlər.”(١

Qeyd etdik ki, qəflətin qarşısını almaq üçün onu törədən amilləri tanımaq lazımdır. İnsan öz diqqətini gücləndirmək üçün xüsusi bir proqram hazırlayıb bu proqrama əməl etməlidir. Bu proqram insana özünə, tövhid və məada qarşı diqqətli olmaqda kömək .göstərməlidir

Diqqətin müqəddiməsi tanımaqdır. İnsan tanımadığı bir şeyə diqqətli ola bilmir. Deməк, tövhid, nübüvvət, məad inanclarına diqqətli olmaq üçün bu həqiqətləri tanımaq lazımdır. Qeyd edildi ki, bu üç həqiqət arasında tövhid, yə`ni bir Allaha e`tiqad mehvər rolunu oynayır. Demək, bura qədər haqqında danışdığımız bütün həqiqətlərin mərkəzində Allaha inam, Allahı tanıma dayanır. Allahı tanımayan insan üçün zikrin, duanın heç bir əhəmiyyəti olmayacaq. Allahı tanımadan nübüvvət və məad həqiqətlərinə diqqətli olmaq qeyri-mümkündür. Bəs Allahı tanımaq üçün nə etmək ?lazımdır



---

.Ə`raf” surəsi, ayə: ١٧٩“ [۵٠] -١

Aksiomdan başqa heç bir bilik öz-özünə əldə olunmur. Tövhid, Allahın sifətləri və işləri, məad kimi biliklərə yiyələnmək üçün düşüncə və araşdırmalara ehtiyac var. Söz yox ki, məntiq və fəlsəfədə bütün nəzəri biliklərin aksiom üzərində qurulduğu bildirilir. Məntiqdə düşüncə məchulu əldə etmək üçün mə`lumlara doğru düzüm verməkdir. .Demək, Allahı tanımaq üçün də təfəkkürə ehtiyac var

Görəsən, Qur`an və rəvayətlərdə təfəkkür haqqında bir bu qədər danışılmasının sirri nədir? Qeyd etməliyik ki, düşüncə insanlığın açarıdır. Düşünməyən insan heç vəchlə öz şəxsiyyətini tanıya bilməz. İnsani şəxsiyyətdən xəbərsiz insan isə kamala çatmaqda acizdir. İslamda düşüncəyə necə üstün bir qiymət verildiyini anlamaq üçün rəvayətə nəzər salaq: “Bir saat təfəkkür etmək bir ilin ibadətindən üstündür.”(١) Əlbəttə ki, söhbət hər hansı şeytani və batil bir məsələ ətrafında yox, insani şəxsiyyət haqqında düşünməkdən gedir. Belə bir düşüncə bir saat davam edərsə insanın həyata baxışını dəyişə bilər. Bir il davam edən düşüncəsiz ibadət isə insanın təkamülündə heç bir müsbət rol oynamaz. Amma mə`rifət əldə etmiş və agahlığa çatmış insanın bir il ibadəti nadan halda min il davam edən ibadətdən tə`sirlidir. Biz qəflət haqqında danışarkən hər növ qəfləti nəzərdə tutmamışdıq. İnsanı bədbəxt edən tövhid, nübüvvət və məaddan olan qəflətdir. Düşünmək də belədir. Allah, axirət və dini vəzifələri haqqında düşünən insan xoşbəxt ola bilər. Çünki bu düşüncələr qəfləti .aradan aparır



---

.Biharul-ənvar”, ٧١-ci cild“ [٥١] -١

### İLAHİ SİFƏTLƏR VƏ FE`LLƏR BARƏDƏ TƏFƏKKÜR

Qur`ani-kərimin təfəkkürə barəsində olan bir sıra ayələri insana ilahi sifətlər və fe`lləri xatırladır. Allahı tanımaq Onun sifət və fe`llərini tanımaqdan ibarətdir. Belə bir tanışlıqdan sonra insan Allahı başqa mövcudlardan fərqləndirə bilir. İnsan fitrətən Allahla tanış olsa da, bə`zən başqa mövcudları Onunla səhv salır. Bütə pərəstiş edən Məkkə müşrikləri Allahı inkar etmir, sadəcə, Onu tanımaqda səhvə yol verirdilər. "Ənkəbut" surəsi-nin ۶۱-ci ayəsində buyurulur: "Əgər onlardan soruşsan ki, göyləri və yeri kim yaratmış, günəş və ayı kim ram etmişdir, qəti şəkildə deyəcəklər ki, Allah! Bəs niyə üz döndərirlər?" Onların çoxu deyirdilər ki, biz bütlərə yalnız Allaha yaxınlaşmaqdan ötrü bir vasitə bilərək pərəstiş edirik. ("Zumər", ۳) Bu insanlar anlamırdılar ki, axtardıqları sifət bütlərdə yoxdur. Əgər onlar Allahı tanısaydılar, Allahın belə bir işə razı olmadığını bilərdi-lər. Amma ilahi sifətləri dəqiq tanıyan insan bu sayaq .yanlışlıqlardan uzaq olur

### İLAHİ NE`MƏTLƏR BARƏDƏ TƏFƏKKÜR

Qur`an ayələrinin müəyyən bir qismi Allahın ne`mətləri barədə düşünməyi tövsiyə edir. Bu ne`mətlər barədə düşünən insan ona verilmiş ne`mətlərə görə ibadət və .təşəkkürü özünə borc bilir

Rum" surəsinin ۲۱-ci ayəsindən oxuyuruq: "Onun ayətlərindən biri də aramlığınız üçün" sizə özünüzdən zövcələr yaratmasıdır. O, sizin aranızda dostluq və mərhəmət qərar verdi. Həqiqətən, bu işdə düşünən qövm üçün böyük ibrətlər vardır." Ailə qurmazdan əvvəl müəyyən iztirablarla üzləşən insan mö`minə bir xanımla ailə qurduqdan sonra ,ruhən rahatlıq əldə edir. Bə`zi alimlərin tə`birincə tənha kəs "yarım insan"dırsa

ailə qurmuş şəxs “tam insan”dır. İnsan ailə qurmaqla yeni bir insaniyyət əldə edir. Bəli, .o, ailə adlı bir ne`mətə çatır və Qur`an bu ne`mət barədə düşünməyi təklif edir

Başqa bir ayədə oxuyuruq: “Sizə qorxu və ümid üçün ildırımı göstərməsi, göydən su nazil etməsi, bu su ilə ölmüş torpağı diriltməsi Onun qüdrəti nişanələrindəndir. Həqiqətən, bunda düşünənlər üçün böyük ibrətlər vardır.”(۱) İnsan düşünürmü ki, baharın gəlişi ilə təbiət dirilməsə dünya nə kökə düşər? Qısa müddət quraqlığa düçar olmuş torpağı gözləriniz önündə canlandırın. “Vaqiə” surəsinin ۶۸-۷۰-ci ayələ-rində buyurlur: “İçdiyiniz suyu görmürsünüzmü? Onu buluddan nazil edən sizsiniz, yoxsa biz? İstəsək onu acı edərik. Nə üçün şükr etmirsiniz?” Doğrudan da, dünyanın bütün su ehtiyacı şor olsaydı, insan nə edə bilərdi?! “Nəhl” surəsinin ۶۸-۶۹-cu ayələrində oxuyuruq: “Sənin Rəbbin bal arısına ilham etdi ki, dağlarda, ağaclarda, alaçıqlarda özünə yuva sal, bütün məhsullardan ye, sonra boyun əyərək Rəbbinin yolu ilə get. Qarınlarından insanlar üçün şəfa olan müxtəlif rənglərdə bal çıxır. Həqiqətən, bunda düşünənlər üçün böyük bir dəlil var.” Bal arısı tək kiçik bir mövcudda hansı xariqələr yaradılmışdır! İnsan gül şirəsini bala çevirən fabrik yarada bilərdimi?! Əgər yarada !?bilsəydi, bu fabrik hansı ölçüdə olardı

Bir sözlə, bütün faydalandıqlarımız ilahi ne`mətlərdir. Bir baxışla yüzlərlə ne`mət .qeydə almaq olar. Bu ne`mətlərə qarşı kor olmayan insan ibadətdən həqiqi zövq alır



---

.Rum” surəsi, ayə: ۲۴“ [۵۲] -۱

Qur`ani-kərimin təfəkkürə də`vət edən bir sıra ayələrində insanın özünə diqqətindən danışılır. İnsan necə yarandığı, necə inkişaf etdiyini, necə tərbiyə olunduğu, həyat çətinliklərindən necə qurtulduğu barədə düşünməlidir. "Ali-İmran" surəsinin ۱۳-cü ayəsində buyurulur: "Həqiqətən, iki dəstənin üz-üzə durması sizin üçün bir nişanə idi. Bir dəstə Allah yolunda vuruşanlar, o biri dəstə isə qarşısındakı mö`minləri iki qat artıq görən kafirlər idi. Allah öz köməkliyi ilə istədiyini güclən-dirər. Şübhəsiz ki, bu işdə ağıl sahibləri üçün ibrət var." Bu ayədə Bədr döyüşündən danışılır. Bu döyüşdə kafirlər müsəlmanlardan üç qat artıq idilər. Amma Allahın hökmü ilə iki qat artıq görünən müsəlmanlar qeybi yardımlar hesabına qalib gəldilər. Əlbəttə ki, bəsirət gözü açıq olanlar bu macəra vasitəsi ilə Allahı tanıya bilərlər. "Mursəlat" surəsinin ۲۰-۲۴-ci ayələrin-də buyurulur: "Məgər sizi dəyərsiz sudan yaratmadıqmı? Sonra onu sağlam bir yerdə qərar verdik, müəyyən bir müddətə qədər. Gücümüz-qüdrətimiz çatdı, necə də qüdrətliyik; O gün vay halına təkzib edənlərin!" Bu ayədə insanın bir zərrə sudan necə böyük qüdrətlə yaradıldığı onun nəzərinə çatdırılır. Aydın olur ki, öz yaranışı haqqında düşünən insan inkardan çəkinməyə məcbur olur. "Ənfal" surəsi-nin ۲۶-cı ayəsində buyurulur: "Yadınıza salın ki, bir zaman yer üzündə az və zəif idiniz. Adamların sizi qapıb-qaçırtmasından, ələ keçirməsindən qorxurdunuz. Allah sizə sığına-caq verdi, öz nüsrəti ilə sizi gücləndirdi və pak şeylərdən sizin üçün ruzi ayırdı ki, bəlkə şükr edəsiniz." Ayədə müsəlmanlara İslamın ilkin dövrü xatırladılır. Həmin dövrdə sığına-caqsız və müdafiəsiz müsəlmanlar qorxu içində üzülürdülər. Allah-təala qısa bir müddətdə bu zəifliyi səh:۹۸

qüdrətlə əvəz etdi. Haqqı tanıyan insanlar bu ne`mətlər müqabilində şükr etməyə .bilməz

### YARANIŞ MƏQSƏDİ HAQQINDA TƏFƏKKÜR

Bir sıra ayələr insanı yaranışın hədəfi barədə düşünməyə də`vət edir. “Ali İmran” surəsinin ١٩٠-١٩١-ci ayələrində buyurulur: “Həqiqətən, göylərin və yerin yaradılmasında, gecə-gündüzün bir-birinin ardınca gəlib-getməsin-də ağıl sahibləri üçün qəti dəlillər vardır. Onlar ayaq üstə olanda, oturanda, həm də böyrü üstə uzananda Allahı zikr edər, yerin yaradıl-ması barədə düşünərək deyərlər: Pərvərdigara, Sən bunları boş yerə yaratmayıbsan. Sən pak və müqəddəssən. Bizi od əzabından qoru.” Bəli, düşüncə sahibləri bütün ətraf aləmi ibrət gözüylə seyr edirlər. “Ənbiya” surəsinin ١۶-١٧-ci ayələrində oxuyuruq: “Biz göyü, yeri və onların arasında olanları oyun-oyuncaq yaratmadıq; Əgər oyun-oyuncaq etmək istəsəydik öz yanımızda edərdik. Biz isə bunu edən deyilik.” Ayədə bildirilir ki, yaranış məqsədyönlüdür və insan bu məqsəd barədə düşünüb öz yolunu tapmalıdır. “Mö`minun” surəsinin ١١۵-ci ayəsin-də buyurulur: “Elə güman edirdiniz ki, sizi əbəs yerə yaratmışıq və bizim yanımıza qayıt-mayacaqsınız.” Ayədən mə`lum olur ki, məhz yaranış məqsədli olduğundan qiyamət sorğusu da zəruridir. Bu məsələlər barədə düşünməyən insan dünyanı puç biləcəkdir. Qərbdə özünə bir çox tərəfdar toplamış “nihilizm” cərəyanı dünyaya puç baxışın məhsuludur. Yaranış aləmi haqqında təhlil apararkən Allahı nəzərdən qaçıranlar heç bir nəticə əldə edə bilməzlər. Yaranışa mə`na verən onun Allahla bağlı olmasıdır. “Allahsız” dünya əvvəli və sonu olmayan puç təxəyyüldən ibarətdir. Dünyanı Allahsız düşünmək kuzəni öz-özünə yaranmış bilmək və ya kuzəçinin kuzəni min bir əziyyətlə düzəldib qurtaran kimi onu

sındırdığına inanmaq kimidir. Allah-təala buyurur: “Elə düşünürsünüz ki, sizi əbəs yerə yaratmışıq?” Bəli, dünyanın yaradılışında hikmət var və o, öz yaradanına doğru .qayıdacaq. Bütün bu həqiqətləri isə yalnız düşüncə yolu ilə əldə etmək mümkündür

## İNSANIN HEYVANDAN ÜSTÜNLÜYÜ

Qur`ani-kərimin əsrarəngiz mə`naları təfəkkür sorağındadır. Yalnız təfəkkürlü məxluq bu mə`naları anlayıb həqiqəti dərk edə bilər. Ağlını işə salmayanlar zahirən insan olsalar da həqiqətdə heyvandan fərqlənmirlər. Həqiqi insan beyni daim həqiqət axtarışındadır. “Ali İmran” surəsində buyurulduğu kimi, o, daim zikr edərək yaranış haqqında düşünür. Günəş, ay, ulduz və başqa ne`mətlər haqqında düşünən insan bu .ne`mətlərin yaradıcısından qəflətdə qala bilməz

Bəli, yalnız düşüncə yolu ilə qəflətdən qurtulmaq olar. Bu həmin düşüncədir ki, onun bir saatı bir ilin ibadətindən üstün tutulur. Söhbət o düşüncədən gedir ki, insan Allah və Onun sifətlərini, yaranış məqsədləri haqqında düşünərək deyir: “Ey Rəbbim, bizi boş yerə yaratmamısan.” Yaranışın məqsədli olduğunu anlayan insan ilk əvvəl varlıq aləminin bir parçası kimi özü haqqında düşünməyə başlayır. Nəhayət, mə`lum olur ki, varlıq aləminin yaranış məqsədi ilə insan arasında xüsusi bir əlaqə mövcuddur. “Bəqərə” surəsinin ٢٩-cu ayəsində buyurulur: “Bütün yer üzündə olanları sizin üçün xəlq etdi.” Amma o da qeyd olunur ki, insan azad yaradıldı, səadət və ya bədbəxtlik yolunu seçmək onun öz ixtiyarına verildi. Demək, istər kamala çatan, istərsə də süquta uğrayan insan öz iradəsi ilə bunlara yetişir. “İnsan” surəsinin ٣-cü ayəsində buyurulur: “Ona doğru yolu göstərmişik; istər şükr edən olsun, istərsə də nankor.” “Kəhf” surəsinin ٢٩-cu ayəsində isə belə buyurulur: “Haqq Rəbinizdəndir. Kim istəsə inansın və kim istəsə inanmasın.” Yuxarıdakı mövzuda

Qur’an təfəkkür vasitəsilə insanı məad inancına doğru sövq edir. İnsanın seçimini .müəyyənləşdirib dəyərləndirmək üçün sorğunun gününün olması labüddür

Beləcə, təfəkkür insanı pillə-pillə mə`rifətə çatdırıb onu öz insani vəzifələrindən xəbərdar edir. O, anlayır ki, insani şəxsiyyətlərini unu-danları əzab gözləyir. Elə bu zaman əllərini dua üçün açıb Allahdan yardım diləyir. “Rum” surəsində oxuyuruq: «Məgər onlar özləri düşün-mürlərmi ki, Allah göyləri və yeri, onların arasında olanları haqt olaraq müəyyən vaxt üçün yaratmışdır?»(۱) Demək, axirətə inanmağın da yolu təfəkkürdür. İnsan düşünməli və kafirlərə və`d olunmuş əzabdan qurtulmaq üçün .şəkk-şübhələrdən qaçmalıdır



---

.Rum” surəsi, ayə: ۸“ [۵۳] -۱

## :ON BEŞİNCİ DƏRS

## DÜNYA VƏ AXİRƏTİN MÜQAYİSƏSİ

### DAVAMLI TƏFƏKKÜR

İstinad etdiyimiz Qur`an ayələrindən mə`lum oldu ki, insanın süqutunun əsas amili qəflətdir və bu qəflətin çarəsi özünə və Allaha diqqətli olmaqdır. O da qeyd edildi ki, diqqət Allah, doğru yol və axirətə diqqətdən ibarətdir. Özünü tanıyan insan Allahını da tanıyır. Öz insani şəxsiyyətinə diqqətsiz olan insanın Allahı tanıması mümkünsüzdür. İnsan qəflətdən qurtulmaq üçün qəfləti törədən amillərlə tanış olmalıdır. Deməк, bu amilləri aradan qaldır-maqla qəflətdən uzaqlaşmaq olar. Bu məqsədə nail olmaq üçün .proqram tərtib etmək zəruridir

İşarə edildi ki, diqqətli olmaq üçün Qur`an insanı düşüncəyə çağırır. İnsan gündəlik təfəkkür üçün proqram tərtib edərsə, öz diqqətini gücləndirə bilər. Rəvayətlərdə .buyurulur ki, bir saat təfəkkür bir ilin ibadətindən üstündür

Amma insanı öz şəxsiyyətinə diqqətli edən düşüncə yaranış və yaradıcı haqqında olan düşüncədir. Mə`nasız düşüncələr insanı nəinki diqqətli etmir, əksinə, onun diqqətini .həqiqətdən yayındırır

Digər mühüm bir nöqtə təfəkkürün davamlı olmasıdır. Allah, Onun sifətləri və fe`lləri kimi məsələlər bir anlıq düşüncə ilə həzm oluna bilməz. Hətta bu həqiqətləri qavradıqdan sonra onu unutmaq qorxusu da var. Dünyanın bər-bəzəyi, eyş-işrəti ilahi düşüncələrə qənim kəsilmiş təhlükələrdir. Dəyişkən təbiətli təfəkkürü zərərli düşüncələrdən qorumayan insan nə vaxtsa əqidəsində çaşa bilər. Belə təzahürlər dünyanın axır dövrləri üçün xüsusi ilə səciyyəvi bildirilmişdir. Rəvayətlərə görə həmin dövrün insanları sübhlər mö`min, gecələr isə kafir olarlar. Yə`ni mühit mö`min insanı bir neçə saat ərzində kafirə döndərmək gücünə malikdir. “Onlar mö`min halda sübhü açar və kafir halda gecəyə çatarlar.”(١)

Cinlər və şeytansifət insanlar gecə-gündüz pusquda durub insanın qəflət halını gözləyirlər. Ona görə də insan elə düşünməməlidir ki, bir dəfə düşünüb dini həqiqətləri anlamaqla iş bitir, yox, əsla! İnsan ömrünün son anı, son nəfəsinədək yanılmaq, büdrəmək təhlükəsi ilə üzbəüzdür. O, hər an inamını itirməkdən qorx-malı və ilahi düşüncəni fasiləsiz olaraq davam etdirməlidir.

### DÜNYA VƏ AXİRƏT HAQQINDA

Beləcə, insan təfəkkür mərhələsində bu nəticəyə gəlir ki, dünyanın yaranışı əbəs deyil. İnsanın yaranışında son məqsəd onun təkamül yolunu seçib, ilahi ne`mətlərə nail olmasıdır. Seçim insanın öz istək və iradəsindən asılı olduğu üçün o, azğınlıq yolunu seçib, ilahi qəzəbə də düçar ola bilər.

Araşdırılması mühüm olan mövzulardan biri “dünya və axirətin müqayisəsi” mövzusudur. Dünya həyatından sonra axirət həyatının mövcudluğunu qəbul etdikdən sonra dünya və axirət həyatı haqqında düşüncələr təkamüldən ötrü yardımçı vasitə ola bilər. “Bəqərə”



---

١- [٥۴] “Biharul-ənvar”, ٣٣-cü cild.

surəsinin ٢١٩-٢٢٠-ci ayələrində buyurulur: “Allah Öz ayələrini sizə bu cür açıqlayır ki, ”.bəlkə dünya və axirət haqqında düşünəsiniz

Həmin düşüncələrin əhəmiyyətini nəzərə alaraq dünya və axirət həyatını müqayisə edirik

Dünya məhdud, axirət isə əbədidir. Qur`ani-kərimdə qeyd olunur ki, insan öz maddi .١ varlığı-nın tə`siri altında maddi dünya həyatına meyl-lidir. Hansı ki, axirət həyatı bütün aspektlərdə dünya həyatından üstündür. “Ə`la” surəsinin ١۶-١٧-ci ayələrini oxuyuruq: “Amma siz dünya həyatını üstün tutursunuz. Halbuki, axirət daha xeyirli və əbədidir.” Ayədə göstərilir ki, axirət həyatı-nı dünya həyatından üstün edən ən mühüm cəhətlərdən biri onun davamlı olmasıdır. Münasib bir misal çəkək: Tutaq ki, bir insan yüz illik ömrünün əvvəlindən son gününədək hər gün bir-birinin ardınca ٩ rəqəmini müəyyən bir yerə qeyd etsin. Şübhəsiz ki, təsəvvürə sığmayacaq dərəcədə böyük bir rəqəm alınar. Amma bu rəqəm nəhayətsiz olmayacaq. Amma axirət həyatı !nəhayətsizdir. Başqa sözlə, axirətin sonuncu “٩”-u yoxdur

Görənsən, insandan soruşulsaydı ki, yüz illik, yoxsa sonsuz bir həyatı istəyirsən, nə cavab verərdi? Hətta bir il rahat yaşayışı yox, iki il narahat yaşayışı seçəcəyimizə heç bir şübhə yoxdur. E`tiraz etməyin. Bir il rahat yaşayışı seçmiş adamdan bir il sona çatdıqda soruşun: “Seçimindən peşiman deyilsən?” Onda e`tirazınızı geri götürərsiniz. Bəs necə olur ki, bir il artıq yaşamaq üçün rahatçılıqdan keçən insan əbədi həyata e’tina etmir? Bəlkə, o, heç bu barədə düşünmür? Yaxşı düşünənlərdən isə bu barədə .yeni qərarlar gözləmək olar

Dünya ləzzətləri ağrı-acısız olmur. Axirət ləzzətlərinin üstünlüyü ondadır ki, bu .٢ ləzzətlər-də zərrə qədər də olsa ağrı yoxdur. Amma dünya həyatında hər bir ləzzət bir ağrı-acı ilə müşayiət olunur. Dadlı bir

xörək hazırlamaq üçün insan hökmən əziyyət çəkməlidir. Əvvəlcə pul qazanmaq, sonra bazarlıq etmək, daha sonra bu xörəyi bişirmək lazımdır. Bəli, bir dadlı tikədən ötrü bir bu qədər əziyyət! Hələ siz bazardan aldığınız ərzaqların hansı çətinliklərlə hazırlandığına diqqət edin. Əkinçi, dəyirmançı, çörəkçi, qənnadçı, quşçu, maldar, qəssab bu ərzaqların başa gəlməsi yolunda nə qədər tər axıtmışlar! Bütün dünya ləzzətləri bu sayaq çətinliklə hasil olur. Hansısa bir sanatoriyada istirahət, elmi dərəcə ?almaq asanlıqla mümkün olurmu

Amma axirət ləzzətləri belə deyil. Onlar həqiqi və saf ləzzətlərdir. Bu ləzzətlərlə yanaşı heç bir əziyyət duyulmaz. Bu ləzzətlər insanı yormaz, bezikdirməz. Əgər dünya şərabı insanın əqlini əlindən alıb, onu heyvana çevirirsə, axirət içkilərindən heç bir mənfi tə`sir duyulmaz: "İçənlərə ləzzət verən şərabdan çaylar...!"(١) "O, nə baş ağrıdar, nə də ağlı aparar."(٢) "Hicr" surəsinin ٤٨-ci ayəsində buyurulur: "Orada heç bir əzab-əziyyət ".yoxdur

Dünya ne`mətləri nə zamansa insanın əlindən çıxır və sona yetir. Amma behiştdə ləzzətlər qoynunda olan insan narahat deyil ki, sabah nə olacaq. O, sabahından və (əbədi gələcəyindən arxayındır. "Həmişə orada qalarlar."(٣

səh:١٠٥

---

.Muhəmməd" surəsi, ayə: ١٥" [٥٥] -١

.Vaqiə" surəsi, ayə: ١٩" [٥۶] -٢

.Mücadilə" surəsi, ayə: ٢٣" [٥٧] -٣

Deyilənlər Qur`an ayələri çərçivəsində idi. Əgər rəvayətlərə müraciət etsək, axirət aləmində insanı gözləyən ne`mətlərə heyran qalarıq. Rəvayətlərdə buyurulur ki, behişt ağaclarındakı meyvələri dərmək üçün hətta hərəkət etmək lazım gəlmir. .İstənilən bir ne`məti zərrəcə əziyyət çəkmədən dadmaq olur

Bəli, yalnız Allah insan üçün hazırladığı behişti lazımınca tanıyır. Ona görə də buyurur: "Siz dünya həyatını seçirsiniz. Halbuki axirət daha xeyirli və əbədidir." (١) Doğrudan da, əbədi axirət ne`mətlərini qoyub, müvəqqəti dünya ne`mətlərinə uymaq uşaq işidir. Şokoladı hər şeydən çox istəyən uşağa gülürük. Hansı ki, dünya şirinliyinə uymaqla özümüz gülünc vəziyyətə düşmüşük. Belə bir yanlış seçim yalnız cəhalətdən doğur. ".“Əhzab” surəsinin ٧٢-ci ayəsin-də buyurulur: "Həqiqətən, o, özünə zülm edən cahildir

Dünya həyatı axirət həyatı ilə müqayisədə o qədər dəyərsizdir ki, müxtəlif Qur`an ayələrində "oyuncaq" adlandırılır. "Ali-İmran" surəsinin ١٨٥-ci ayəsində oxuyuruq: "Əslində dünya həyatı aldadıcı matahdan başqa bir şey deyil." İnsan dünyanın yalanlarına uymamaq üçün çox diqqətli olmalıdır. Başqa bir ayədə buyurulur: "Bu dünya həyatı oyun-oyuncaqdan və baş qatmaqdan başqa bir şey deyildir. Həqiqi yaşayış isə axirət aləmindədir. Ey kaş, bunu biləydilər." (٢) Həqiqi həyat axtaranlar axirət ardınca getməlidirlər. Axirət elə bir aləmdir ki, orada ne`mətlər hüdudsuzdur. Hansı əsasla əbədi ne`mətləri dərd-qəm dolu dünya həyatına dəyişmək olar? İnsan sadəcə eşitməklə yox, yalnız dərk etməklə bu həqiqətə çata bilər. Axirət həqiqətini yalnız peyğəmbər və mə`sum



---

.Ə`la" surəsi, ayə: ١۶-١٧" [٥٨] -١

.Ənkəbut" surəsi, ayə: ۶۴" [٥٩] -٢

imamlar tam dərk edə bilərlər. Adi insanlar isə tam dərk etməyə yalnız axirətə çatdıqda nail olur və həmin anda deyirlər: "Ey kaş bu həyatım haqqında düşünmüş olaydım."(١) Sözsüz ki, hansısa bir səviyyədə axirət həyatını dərk etmək olur. Amma bu o qədər çətindir ki, çoxları axirətə yetişməyincə onun dünya həyatından nə qədər üstün oluduğunu anlamayacaqlar. Bu fərqi yalnız kamala yetməklə tam hiss etmək .olur

## DÜNYANIN PUÇLUĞU

Yunis" surəsinin ٢۴-cü ayəsində byurulur: "Həqiqətən, dünya həyatının məsəli göydən" nazil etdiyimiz suya bənzər ki, insanların və heyvanların qidası olan bitkilər onunla cücərib. Nəhayət, yer üzü gözəlləşib bəzəndiyi və sakinlər istifadəyə qadir olduqlarını güman etdikləri vaxt bir gecə və ya bir gündüzdə ona fərmanımız gələr, dünəndən heç bir şey yoxmuş kimi onu kökündən qoparıl-mış vəziyyətə gətirərik. Biz düşünən qövm üçün ayələrimizi bu cür açıq bəyan edirik." Bəli, dünya həyatı öz təravəti ilə insanı cəzb edən çiçək kimidir. Amma çox qısa müddətdə puç olacaq bu gözəlliyə aldanmaq olmaz. "Kəhf" surəsinin ۴۵-ci ayəsində oxuyuruq: "Onlara dünya həyatının bizim göydən nazil etdiyimiz, yerin bitkisinin qarışıb yetişdiyi su kimi olduğunu misal çək." Bəli, dünya həyatı qısa bir müddətdə quruyub çör-çöpə dönən və küləklər qoynunda sovrulub yoxa çıxan bitkiyə bənzəyir. Bütün bu məsəllər insanın diqqətini axirət həyatına .yönəldir

Sual oluna bilər ki, axirətin dünyadan üstün oluduğunu anlayan insan nə etməlidir? Bütün işləri yarımçıq qoyub üzü qibləyə ölümümü gözləməliyik? Yoxsa dünya ne`mətlərindən imtina edib ömrün sonunadək dağlarda ibadətə məşğul olmaq ?lazımdır



---

.Fəcr" surəsi, ayə: ٢۴" [۶٠]-١

İstər keçmişdə, istərsə də indi, istər müsəlmanlar, istərsə də qeyri-müsəlmanlar arasında belə bir fikir mövcud olmuşdur ki, behiştə nail olmaq üçün dünya ne`mətlərindən imtina etmək lazımdır. Bir çox insanlar belə dünyagörüşüə müvafiq olaraq cəmiyyətdən uzaq-laşıb tənha yaşamışlar. Belə bir düşüncə tərzi sufilərdə də təsadüf olunur. Heç bir İslami mənbə`də tərki-dünyalıq göstərişi yoxdur və tənhalığı seçən müsəlmanlar, heç şübhəsiz ki, həqiqətdən uzaq düşmüşlər. İslam dini dünyadan uzaqlaşmağa yox, ona qul olmamağa çağırır. Qur`ani-kərim dünya ləzzətlərindən daha üstün olan axirət ləzzətlərini önə çəkir və dünyaya bağlılığı pisləyir. İnsanın .nəzərinə çatdırılır ki, dünya mö`minlik, təkamül, behiştə çatmaq üçün bir vasitədir

Sual oluna bilər ki, əgər dünya ləzzətləri faydalı deyilsə, bir bu qədər ne`mət nə üçün yaradılmışdır? “Ə`raf” surəsinin ٣٢-ci ayəsində buyurulur: “Allahın öz bəndələri üçün yarat-dığı zinəti və təmiz ruziləri kim haram etmişdir?!” Bəli, Allah özü buyurur ki, bu ne`mətlər insan üçün yaradılmışdır. Əgər yemək, içmək, evlənmək pis işlər olsaydı bu işlərlə behiştlə rastlaşmazdıq. Sadəcə olaraq, dünya ne`mətlərindən istifadədə hədd gözləmək lazımdır. “Maidə” surəsinin ٨٧-٨٨-ci ayələrində oxuyuruq: “Ey iman gətirənlər! Allahın sizə halal etdiyi pak şeyləri haram saymayın və həddi aşmayın. Həqiqətən, Allah həddi aşanları dost tutmaz. Allahın sizə ruzi etdiyi şeylərin halalını və təmizini yeyin və iman gətirdiyiniz Allahdan qorxun.” Demək, ilahi hədləri pozmadan dünya ne`mətlərindən istifadə etmək olar. Yalnız o ləzzətlər haram buyurulur ki, insanın təkamülü qarşısında maneə törədir. Amma eyni zamanda insanın axirət evinə əliboş, savabsız getməməsi üçün dünya həyatına da

ehtiyac var. İlahi hədləri pozmamaq şərtilə axirəti üçün savab qazanan insana dünya həyatı və dünya ne’mətləri faydalıdır. İbadət, təhsil, cihad və digər dini vəzifələri yerinə yetirmək üçün enerji və istirahətə ehtiyac var. Dünya ne`mətləri və dünya ləzzətləri zəruri enerjini əldə etmək və yorğunluğu aradan qaldırmaqdan ötrü bir .vasitədir

Əlbəttə ki, bə`zi dünya ne`mətlərindən imtina etmək lazım gəlir. Məsələn, üzüm gözəl və halal bir ne`mətdir. Amma şərab haqqında bu sözləri demək olmaz. Haram ləzzətlər ardınca gedənlər axirət əzabını unutmamalıdırlar. Əslində hər bir halal ne`mət və ləzzət insana Allahı xatırlatmalıdır. Susamış insan bir stəkan bulaq suyu .içərkən Allahı yada salıb, Ona şükr etməklə savab da qazana bilər

Dünyada maddi olmayan ləzzətlər də var. Məsələn, insan nəfsini tərbiyə etməklə ibadətdən böyük ləzzət ala bilər. Əslində, dünya ne`mətləri içərisində olan ən üstün ləzzət namazdan duyulan ləzzətdir. Allah bu ləzzəti yalnız saf bəndələrinə hədiyyə olaraq daddırır. “Səcdə” surəsinin ۱۷-ci ayəsində oxuyuruq: “Heç kəs bilməz ki, onlara etdikləri əməllərin əcri olaraq gözlərini işıqlandıracaq necə şeylər gizlədilmiş-dir.” Bəli, .ibadətdən aldığı bir anlıq ləzzəti bütün dünyaya dəyişməyən bəndələr var

!Ey Rəbbimiz, Öz tovfiqini biz günahkar bəndə-lərə nəsib et

## :ON ALTINCI DƏRS

## İSLAM NƏZƏRİNDƏ DÜNYA

### ÖTƏN MÖVZULARA BİR BAXIŞ

Qur`an ayələrindən mə`lum oldu ki, qəfləti aradan qaldırmaq yollarından biri təfəkkür, ilahi ayətlər və yaranışın məqsədi haqqında düşünməkdir. Təfəkkür üçünsə mühüm mövzulardan biri dünya ilə axirətin müqayisəsidir. Qur`ani-kərim axirəti .həqiqi həyat, dünyanı isə oyuncaq kimi tanıtdırır

Əgər insan ayrı-ayrılıqda dünya və axirətin xüsusiyyətlərinə nəzər salıb sonra onları müqayisə edərsə, axirət həyatının üstünlüyünə əmin olar. Maddi mövcud olan insanın maddi dünyaya meyl göstərməsi təbiidir. Dünyanın bər-bəzəyi insanı çox tez çaşdırır. Qəlb isə eyni zamanda iki mövzuya diqqətli ola bilməz. Dünyaya könül verən insan heç vəchlə axirət haqqında

düşünə bilməz. “Əhzab” surəsinin ۴-cü ayəsində buyurulur: “Allah heç kəsin daxilində ”.iki qəlb yaratmayıb

Qeyd edildi ki, axirətə çatmaq üçün dünya ləzzətlərindən imtina etmək yanlış fikirdir. Belə düşünən insanların dağlara, meşələrə çəkilib tənha yaşamaqdan başqa çarəsi yoxdur. Həzrət İsanın (ə) ardıcıllarının belə bir yol (“röhbaniyyət”) seçdiyi tarixdə məşhurdur. Onlar öz fikirlərini belə əsaslandırırdılar ki, cəmiyyətdən uzaqlaşan insan günah söz, günah səs, günah mənzərədən və günahkar insanlardan uzaqlaşır. .Tənhalıqda Allahı düşünmədən ötrü münasib şərait mövcuddur

Əlbəttə ki, belə bir baxış müsəlmanlar arasında da təsadüf edilir. Sufi firqələri düşüncələrini qeyri-ilahi xəyallardan uzaqlaş-dırmaq üçün cəmiyyətdən kənarlaşırlar. Onlar iddia edirlər ki, insan maddi həyatın rəngarəngliyindən uzqlaşdıqca Allaha yaxın-.laşır

,Bu gözün, bu könlün əlindən aman

.Bu göz gördüyünü qəlbə hopdurur

,Ey kaş ki, bir xəncər ola poladdan

.Çalam gözə, biləm qəlb azad durur

## İSLAM TƏRKİ-DÜNYALIĞA ZİDDİR

Əvvəlki söhbətlərdə qeyd olunuğu kimi, Qur`an və Əhli-beyt röhbaniyyəti, yə`ni cəmiyyətdən uzaqlaşıb ibadətə məşğul olmağı rədd edir. “Hədid” surəsinin ۲۷-ci ayəsində Həzrət İsanın (ə) röhbaniyyət yolunu seçmiş ardıcılları tənqid olunur: “Rahibliyi onlara Biz vacib etməmiş-dik. Lakin onlar Allahın razılığını qazanmalı olduqları halda rahibliyi icad etdilər.” Ayədən mə`lum olur ki, tərki-dünyalıq yanlış bir yoldur. Həzrət Peyğəmbər (s) buyurur: “Mənim

ümmətimdə röhbaniyyət yoxdur."(١) Rəvayətə görə Osman adlı birisi oğlunun ölümündən sarsılaraq evi tərk edib məscidə pənah gətimiş-di. Əhvalatı eşidən Peyğəmbər (s) Osmana dedi: "Allah-təala röhbaniyyəti bizə yazmamışdır. Mənim ümmətimin röhbaniyyəti Allah yolunda cihaddır."(٢)

Bə`ziləri din alimlərindən gileylənirlər ki, onların tərki-dünya olmadan dünyaya aldanmamaq göstərişi ziddiyyətlidir. Onların fikrincə cəmiyyətə çıxan insan hökmən dünya bər-bəzəyinin tə`siri altına düşür. Bəli, nəfsi qorumaq çətin bir işdir. Amma buna baxmayaraq dünyaya qul olmamaq şərti ilə onun ne`mətlərindən istifadə etmək ən doğru yoldur. Sadəcə, insan dünyaya onu kamilliyə aparcaq körpü kimi baxmalıdır.

### HƏZRƏT ƏLİNİN (Ə) DÜNYANI MƏZƏMMƏTİ

Həzrət Əli (ə) "Nəhcül-bəlağə" kitabında dünyanı o qədər məzəmmət edir ki, bu kitabı "dünyanı məzəmmət kitabı" adlandıran olsa təəc-cüb etməyə dəyməz. Bu kitabda çox az xütbələrdə bu məzəmmətlə rastlaşmırıq. Həzrət (ə) buyurur: "Dünya sizin nəzərinizdə "səlm" ağacının qurumuş yarpağından, qoyun qırxarkən yerə düşən zərrədən də kiçik və dəyərsiz olmalıdır." Başqa bir yerdə buyurur: "Ey Allahın bəndələri, sizə sizi atmış dünyadan uzaqlaşmağı vəsiyyət edirəm." Elə bu xütbənin davamında oxuyuruq: "Görmürsünüzmü ki, dünya əhli dəyişkən halda gündüzdən gecəyə, gecədən gündüzə çıxırlar? Biri üsündə yas qurmuş ölü, o biri baş sağlığı verilən kəs, digəri giriftarçılıq içində yıxılmış xəstə, bir başqası xəstə yoluxmağa gedən şəxs, kimi can verən adam, kimisi ölüm ardınca gəzən dünyagir, bə`zisi də Allahın yaddan çıxardığı qafil!"



---

١- [٦١] "Biharul-ənvar", ٧٠-ci cild.

٢- [٦٢] "Biharul-ənvar", ٨-ci cild.

Bəlkə də, Həzrətin (ə) bu mövzu barəsində buyurduğu ən maraqlı kəlam budur: “And olsun Allaha, sizin dünyanız mənim gözümdə cüzam xəstəliyinə tutulmuş insanın əlindəki donuz sümüyü tək alçaqdır!” Cüzam xəstəliyinə tutulmuş insan görmüsünüzmü? Onun sifəti o qədər çirkin olur ki, baxanlarda ikrah doğurur. İndi murdar donuzun ölüsünün sümüyünü əlində tutmuş cüzam xəstəni təsəvvür edin! Belə bir mənzərədə cazibədarlıq varmı? Həzrət (ə) dünyaya belə bir münasibətdə .olduğunu bildirir

### HƏZRƏT ƏLİNİN (Ə) BUYURDUQLARININ TƏFSİRİ

Dünya haqqında deyilən bu sözlərdən sonra necə edək ki, Allahın razılığını qazana .bilək? Bu suala elə “Nəhcül-bəlağə”nin özündən cavab tapmaq olar

Nəhcül-bəlağə”də nəql olunur ki, bir kişi Həzrət Əlinin (ə) hüzurunda dünya haqqında“ pis danışdı. Bu şəxs özü dünya əhli olduğu halda zahirdə dünyadan şikayətlənirdi. Həzrət Əlinin (ə) bu kişiyə cavabı çox maraqlıdır. O buyurur: “Həqiqətən, dünya onunla düz danışan üçün düzlük evi, onu düz anlayan üçün əmin-amanlıq yeri, ondan azuqə yığanlar üçün qüvvə mənbəyi, ibrət götürənlər üçün nəsihət sarayıdır. Dünya ilahi mərhəmət qazanılan və qazancı behişt olacaq ibadət və bəndəlik yeri, mələklərin namaz məkanı, ilahi vəhyin nüzul yeri və Allah dostlarının ticarət məkanıdır. Dünya insanları özündən uzaqlığa çağırıb özünü və əhlinin fəna olacağını xəbər verdiyi halda ”?onu kim qınaya bilər

Əgər dünya olmasaydı insanlar hansı savabla behiştə gedərdi? Dünya Allah dostlarının təkamül yeridir. Həzrət buyurur: “Dünya ona baxan insanı agah, onun zinətinə aldananı kor etdi.” Bəli, dünyaya bəsirət gözü ilə baxanlar ondan faydalanır, nəfsinə uyanlar isə zərərə

.düşür. Dünyadan dərs almayan insan, çətin ki, kamillik mərtəbəsinə ucala

## DÜNYAYA İKİLİ MÜNASİBƏT

Axirət ne`mətlərinə qovuşmaq istəyənlər üçün dünya həyatından başqa vasitə yoxdur. Həzrət Peyğəmbər (s) buyurur: "Hər kəs "la ilahə illəllah" desə, behiştdə onun üçün bir ağac əkilər."(۱) İnsanı behiştə aparacaq savablar bu dünyada qazanılır. Bu dünyada xeyir iş görməyən insan heç vəchlə behiştə nail ola bilməz. Behişti almaq üçün sərmayəni yalnız bu dünyada qazanmaq olar. İnsanın dünyadan başqa əkin yeri .yoxdur

Bəli, dünya axirəti qazanmaq vasitəsidir. Hər birimiz axirət azuqəsini məhz dünyada yığmalıyıq. Səhvimiz ondadır ki, bə`zən elə bu dünya üçün yarandığımızı zənn edirik. .Səhv dünyanı məqsəd bilməkdir

Dünyanı məqsəd bilmək odur ki, məsələn, insan maşınının şüşəsinə bir ləkə düşən kimi qaçaraq onu təmizləsin. Belə insan unudub ki, maşını nə üçün alıb. Maşın bizi məqsədə çatdırmaq üçün bir vasitədir. Maşına bu sayaq qulluq edən kəs maşının xidmətindən .istifadə etmək əvəzinə özü ona xidmətçi olub

Dünya belədir. İnsan dünyadan istifadə edib öz ilahi məqsədinə çatmalıdır. Əlbəttə ki, bütün diqqətini dünya ləzzətlərinə yönəldən insan axirəti unudacaqdır. Belə dünya həqiqətə çatmaq yolunda kömək yox, maneədir. Həzrət Əli (ə) buyurur: "Dünya qəlbi kor olan üçün son nöqtədir. Belə insan dünyadan uzağı görməz. Görən insanın baxışı isə dünyanı adlayır və bu insan bilir ki, dünyadan sonra həqiqi bir aləm var. Demək, görən kəs ondan nəzərini çəkir, qəlbi kor olan kəs isə aldanır. Görən kəs ondan azuqə ".götürür, qəlbi kor olan kəs onun üçün azuqə yığır



---

.Biharul-ənvar", ۸-ci cild" [۶۳] -۱

Beləcə, məzəmmət olunan dünya yox, dünyaya yanlış baxışdır. Dünya Allahın məxluqudur və ən gözəl şəkildə yaradılmışdır. “Səcdə” surəsinin ٧-ci ayəsində ”.oxuyuruq: “O, yaratdığı hər şeyi gözəl yaratmışdır

Dünya pis deyil. Onu pis edən ona qarşı olan yanlış münasibətdir. Qur`ani-kərim və “Nəhcül-bəlağə”də dünya ona görə məzəmmət olunur ki, o, aldadıcı və müvəqqəti olduğu halda insanlar ona aldanırlar. İlahi kəlamlar dünyanı məzəmmət etməklə insanları qəflətdən oyatmaq istəyir. Gördüyünə meyl salan insan Allahın və Onun .övliyalarının buyurdularından nəticə çıxarmalı, öz mə`nəviyyatını gücləndirməlidir

Dünyanı məzəmət edən sözlərdən insanların səhv nəticə çıxarmaması üçün Allah-təala buyurur: “De ki, Allahın öz bəndələri üçün yaratdığı zinəti və təmiz ruziləri kim haram etmişdir? Bunlar dünyada iman gətirənlər üçündür.”(١); “Ey iman gətirənlər, sizə verdiyimiz ruzilərin təmizindən yeyin.”(٢) İnsan dünya ləzzətlərinə meyl etdiyi .üçün onu dünyaya qarşı təşviq edən ayələr çəkindirən ayələrdən azdır

### ?DİNİ TƏ`LİMLƏR İNKİŞAFA MANEƏDİRMİ

İslam dininin dünya ilə əlaqədar buyurduqları haqqında bir çox yanlış fikirlər mövcuddur. Bə`zən iddia olunur ki, İslam iqtisadi inkişafa müxalifdir. Hətta özünü ziyalı adlandıran bə`zi müsəlmanların da bu fikrə dəstək verməsi təəssüf doğurur. Guya İslam dininə üz tutan millətlər iqtisadi cəhətdən tənəzzül edir. Onların fikrincə, “dünya oyuncaqdır” deyən din dünyəvi tərəqqidən geri qalır. Onlar din haqqında dərin mə`lumata malik olmayan insanları “ya din, ya da inkişaf” seçimi qarşısında qoyurlar. .Guya, dindar insan çalışqanlıq və zəhmətdən uzaq bir varlıqdır



---

.Ə`raf” surəsi, ayə: ٣٢“ [٦۴]-١

.Bəqərə” surəsi, ayə: ١٧٢“ [٦٥]-٢

Bu suallar və qınaqlar İslam dinindən xəbərsiz-likdən doğur. Bu din haqqında müəyyən qədər mə`lumatı olanlar gözəl bilirlər ki, İslam bəşəriyyəti zülmətdən nura də`vət edir. İslam dini dünyagirliyi, dünyaya qul olmağı pisləyir. Heç bir ayə və hədis iqtisadi .inkişafı qadağan etmir

Əmirəl-mö`minin Əli (ə) İslam dininin ən qabaqcıl nümayəndələrindəndir. Bəşər tarixində onun qədər siyasi, ictimai, iqtisadi və hərbi fəaliyyətə malik ikinci bir şəxs mə`lum deyil. İran, Ərəbistan, Misir, Yəmən, İraq və Suriya bu ilahi şəxsiyyətin hakimiyyəti altında olmuşdur. Belə geniş əraziyə malik dövləti idarə etməklə yanaşı özü şəxsən müharibələrdə iştirak etmiş, ölkənin iqtisadi dirçəlişində alın təri axıtmışdır. Həzrət Əlinin (ə) öz əlləri ilə ərsəyə gətirdiyi xurma bağları, öz əlləri ilə qazdığı saysız quyular əfsanə yox, həqiqətdir. Nə o Həzrət, nə də onun mə`sum övladları zəhmətdən çəkinməmiş və kimsəni çəkindirməmişlər. Əli (ə) o şəxsdir ki, gündüzlər günəşin yandırıcı istisi altında külüng çalar, gecələr öz əlinin bəhrəsini aclara paylayardı. O, yalnız və yalnız dünyaya qul olmamağı tapşırardı. İslam dini ifrat və təfriti qəbul etməyib, öz ardıcıllarını orta həddi gözləməyə çağırır. Bu baxış dünyaya münasibətdə !də özünü büruzə verir: nə dünyaya qul ol, nə də onu tərk et

Həzrət Əli (ə) buyurur: “Ey dünya! Mənə üz tutub, mənə tamah salmısan? Get, başqalarını aldat.” Amma unutmayaq ki, bu sözləri buyuran şəxs qızmar günəş altında quyudan su çəkib saldığı bağları suvarardı. Bu həmin Əlidir ki, gecələr fəqirlərə əl tutar, döyüşlərdə ön cərgədə dayanardı. Harada yazılıb ki, Əli (ə) gecə-gündüz səcdəyə !qapılıb ibadətdən ayrılmayıb

Bir daha qeyd edək ki, ən gözəl surətdə yaradılmış dünya məzəmmətə layiq deyil və məzəmmət olunan dünyaya əsir olmaqdır. İslam dini tərki-dünyalığı pisləyir və haram buyurur. Bəşəriyyəti İslam dini qədər

elmə, zəhmətə, paklığa, quruculuğa çağıran ikinci bir din yoxdur. Sadəcə olaraq, İslam .dünyaya məqsəd yox, vasitə kimi baxır

İslam dini dünyaya əsir olmamaqdan ötrü insanı nəfs-əmmarə ilə mübarizəyə çağırır. İsrafçılıqdan çəkinmək, doymamış süfrədən durmaq, barmaqla göstərilən libaslar geyməmək İslamın dünyaya ifrat məhəbbətin qarşısını alan tə'limlərindəndir. Ağılsız dünya sevgisini boğub aradan aparmaqdan ötrü çətinliklə əldə etdiyin, sevdiyin şeyləri bağışlamaq çox faydalıdır. "Ali-İmran" surəsinin ٩٢-ci ayəsində buyurulur: "Sevdiklərinizdən ehsan etməyincə xeyir əmələ (savaba) çatmayacaq-sınız." Əlbəttə ki, sevdiyini bağışlamaq çətindir. Amma bunu bacaran insan dünyanın qandallarından .azad olur

Gəlin, düyaya könül verməyək. Ona məqsəd yox, vasitə kimi baxaq. Əgər ona vasitə kimi baxsaq, dünyadan daha çox faydalanarıq. Əlbəttə ki, bu sözlərə əməl etmək çətindir. Zöhd, qənaət və sair bu kimi göstərişlərin məqsədi insanı aldanışdan qurtarmaqdır. İnsanı dünya ne`mətlə-rinə həvəsləndirməyə ehtiyac yoxdur. Onsuz da o, bu ləzzətlərə meyllidir. Əsas məsələ insanın diqqətini dünyanın müvəqqətiliyi və .axirətin əbədiliyinə yönəltməkdir

## QƏRBDƏ İQTİSADİ İNKİŞAFIN SƏBƏBİ

Dini iqtisadi inkişafa əngəl bilənlərin nəzərinə digər bir mühüm nöqtəni çatdırmaq lazım gəlir. Bir çox qərb alimləri Avropanın XVI–XVII əsrlərindən başlayaraq iqtisadi dirçəlişinin səbəbini protestanlıq əxlaqından görürlər. Protestanlıq üç məsihi məzhəbindən biridir. Bünövrəsi XVI əsrdə qoyulmuş bu məzhəb öz ardıcıllarını pərhizkarlığa və dünyaya bağlanmamağa çağırır. Məşhur alman alimi Maks Veber "Protestant əxlaqı və kapitalizm ruhu" kitabında iddia edir ki, qərb cəmiyyətindəki iqtisadi inkişaf protestanlıq məzhəbindən doğmuşdur. O, yalnız protestant məzhəbli

Avropa ölkələrinin əsaslı inkişafını öz müddəasına sübut gətirir. Onun nəzərincə, insanları dünyapərəstlikdən və israfçılıqdan çəkindirən bu məzhəb həqiqi inkişaf üçün şərait yaratmışdır. Bu məzhəbin ardıcılları qənaətcil olur və kapital toplamağa çalışırlar. Bu kiçik kapitallar hansısa mərhələdə bankların və böyük müəssisələrin .yaranmasına səbəb olur

Biz Maks Veberin dedikləri ilə tam şərik olmasaq da, onun haqqında danışmaqla nəzərinizə çatdırmaq istəyirik ki, hətta dini e`tiqadı olmayanlar da qənaəti iqtisadi inkişaf üçün amil bilirlər. Demək, qənaət etməyi bacaran millət-lərin iqtisadi qüdrətə çatmasında təəccüblü bir şey yoxdur. Digər bir tərəfdən, fikri–zikri dünya ləzzətləri dalınca qaçmaq olan insanlar öz israfçılıqları ilə bütün cəmiyyət üçün problem yaradırlar. Əyyaşların tə`birincə "yaxşı kef etmək üçün" böyük pullara ehtiyac var. Böyük pullar isə, adətən, oğurluq, rüşvət, sələmçilik, bir sözlə, cinayət yolu ilə ələ gəlir. Varlı bir əyyaş il ərzində ölkənin milli gəlirinə bərabər pulu eyş-işrətə xərcləməkdə çətinlik çəkmir. Əgər qərbin inkişafı əxlaqi inkişaf olsaydı SPİD və qorxulu zöhrəvi xəstəliklər həmin ölkələri bürüməzdi. Demək, əxlaqsızlığa və onun acı nəticələrinə külli .miqdarda pul xərcləyən iqtisadiyyatın əxlaq və qənaətlə heç bir əlaqəsi ola bilməz

Dini göstərişlərə əməl edən insanları dünya və axirət səadəti gözləyir. Pərhizkarlığı, qənaəti, zöhdü, təqvanı tənbəllik kimi başa düşmək olmaz. İnsanları kamillik zirvəsinə səsləyən bir din heç vəchlə tənbəlliyə səs verə bilməz. İslam pərhizkarlığa, qənaətə, Allaha təvəkkül etməyə çağırır, tənbəlliyə yox. Bir-birinə zidd olan bu iki məsələni qatışdırmaq insanların nöqsanı-dır. İnsanların nöqsanlı qavrayışı səbəbindən inkişafa .çağıran də`vətlər geriliyə çağırış kimi yozulub

İslamın şüarı budur: “Allah heç vaxt kafirlərə mö`minlərin əleyhinə olan bir yol göstərməz.”(١) Bu göstəriş hazırkı dövrdə elm və sənət sahələrində qüvvədədir. “Munafiqun” surəsinin ٨–ci ayəsində buyurulur: “İzzət, Allaha, Onun rəsuluna və mö`minlərə məxsusdur”. Bu gün iqtisadi cəhətdən geri qalmış müsəlmanları əziz hesab etmək olarmı? Yuxarıdakı iki ayədən belə nəticə çıxarmaq olar ki, müsəlmanlar gecə-gündüz çalışıb kafirlərə möhtaclıqdan qurtardıqdan sonra izzətə çata bilərlər. Əgər bir şəxs bu iki ayəni həyata keçirmək üçün elm və iqtisadiyyatda bir addım irəli atarsa bu iş həmin şəxs üçün ibadət hesab olunar. “Biharul-ənvar”da belə bir rəvayət nəql olunur: “İbadət on hissədir və onun doqquz hissəsi halal ruzi kəsb etməkdir”. Bu cür tə’limləri olan dini tənbəlliyə çağırışda ittiham etmək olarmı? İslam ailəsinin ehtiyac-larını ödəmək üçün zəhmət çəkib tər tökən insanı alqışlayır. Problem dində yox, bizim qavrayışı-mızdadır. İslamı düzgün analayıb onun göstərişlərinə əməl edən .insanı yalnız səadət gözləyir

səh:١١٩

---

.Nisa” surəsi, ayə: ١۴١“ [۶۶] -١

## :ON YEDDİNCİ DƏRS

## TƏKAMÜL YOLUNDA IMAN VƏ SALEH ƏMƏLIN ROLU

### ÖTƏN MÖVZULARA BİR BAXIŞ

Yada salaq ki, əsas mövzumuz nəfsin tərbiyəsidir. “Tərbiyə” kimi tərcümə etdiyimiz “təzkiyə” sözünü dəqiq tərcümə etmək çətindir. Amma ümumi şəkildə deyə bilərik ki, bu söz “çiçəklənmə”, “ucalma”, “paklanma”, “inkişaf” mə`nalarını daşıyır. Qur`ani-kərimdə bu sözün antonimi, yə`ni əksi kimi “tədsiyə” kəlməsi işlədilir. Bu kələmə ilə “Şəms” surəsinin ۹-۱۰-cu ayələrində rastlaşırıq: “Öz nəfsini təmizləyən (təzkiyə edən) kəs mütləq nicat tapmış, onu korlayıb-batıran (tədsiyə edən) isə mütləq ziyana uğrayacaqdır.” Ayədən belə mə`lum olur ki, insan öz nəfsini kamilləşdirə bildiyi kimi, onu süquta da uğrada bilər. Bu iki yoldan birini seçmək insanın öz ixtiyarındadır. Yə`ni kamillik iradə və istəkdən asılı olan bir işdir. Kamal insanın əsasını təşkil edən ruha aid olan bir xüsusiyyətdir. Ruhdan fərqli olaraq cism nə qədər inkişaf etsə də bir gün insanın ixtiyarından çıxacaqdır. “Nəhl” surəsinin ۷۰-ci ayəsində oxuyuruq: “Allah sizi yaratmış və bir zaman ruhunuzu alacaqdır. Sizdən bir qisminiz ömrün lap rəzil çağına çatdırılar ki, bildiklərin-dən heç bir şeyi xatırlamaz”. “Yasin” surəsinin ۶۸–ci ayəsində ,oxuyuruq: “Hər kəsə uzun ömür versək, nəhayət

onun xilqətini tərsinə çevirərik”. Bəli, insan cismi təbiətin bu cür qanunlarına tabedir. Amma ruhun inkişafı insanın öz ixtiyarındadır və bu hərəkət ömrün son anınadək .davam edir

Ruh və cism arasındakı başqa bir fərq fiziki inkişafın kəmiyyət, ruhi inkişafın bir növ keyfiyyətlə bağlı olmasıdır. İslam maarifi nəzərindən ruhi inkişafın ölçüsü Allaha yaxınlıqladır. Ruh kamilləşdikcə Allaha yaxınlaşır. Allahdan uzaqlaşma isə süqut əlamətidir. “Ələq” surəsinin ۱۹–cu ayəsində oxuyuruq: “Yox, Ona (Yolunu azana) itaət etmə, səcdə qıl və Allaha yaxınlaş”. Hətta müşriklər də bütlərə ibadət edərkən Allaha .yaxınlaşmaq məqsədi güdürlər

Allaha yaxınlaşma yolunda son məqam “Allahın yaxınlığıdır”. Fir`onun arvadı Asiya belə dua edir: “Ey Rəbbim, behiştdə öz yanında mənim üçün bir ev qərar ver”.(۱) Qur`ani–kərim nəfsi mütməinnə barəsində buyurur: “Ey mütməinnə (arxayın) nəfs, dön Rəbbinə-sən ondan, O da səndən razı olan halda. Bəndələrimin zümrə-sinə daxil (ol. Cənnətimə varid ol”.(۲

İnsanı Allaha yaxınlaşdıran saleh əməldir. Allahın razılığı məhz ondadır. Qur`ani–kərimə əsasən saleh əməl Allaha yaxınlaşma məqsədi ilə görülmüş xeyir əməldir. Bu əməl insana ilahilik bəxş edir və onun kamal dərəcəsini yüksəldir. İslam dinində bu əməl ibadət adlanır. Burada ibadət deyildikdə təkcə namaz, oruc və həcc nəzərdə tutulmur. Allahın razılığını qazanmaq məqsədi ilə görülmüş hər bir xeyir iş ibadətdir. “Cin və insanları yalnız ibadətdən ötrü xəlq etdik”.(۳) Yə`ni insan bütün əməllərində .Allahın razılığı-nı düşünməlidir



---

.Təhrim” surəsi ayə: ۱۱“ [۶۷] -۱

.Fəcr” surəsi, ayə: ۲۷-۳۰“ [۶۸] -۲

.Zariyat” surəsi ayə: ۵۶“ [۶۹] -۳

Demək, yaranışda məqsəd Allaha yaxınlıq və Allaha yaxınlaşmaqda maneə isə qəflətdir. Qafil o insandır ki, haradan gəldiyini, harada olduğunu və haraya gedəcəyini düşünmür. Allah, axirət və doğru yoldan xəbərsiz olanlar bə`zən heyvandan da alçaq .mərtəbəyə enirlər

Təkamül yolunda ilk addım qəflətdən qurtulmaqdır. Dünya ləzzətləri qarşısında diz çökmüş insan üçün belə bir qurtuluş qeyri-mümkündür. Heyvanlıq mərtəbəsində .çıxmaq üçün insan qəflət səddini aşmalıdır

Qəflətin ziddi diqqətdir. "Diqqət" Qur`ani-kərimdə "zikr" adlandırılmışdır. "Zikr" diqqəti Allaha yönəltməyə deyilir. Qeyd edildi ki, zikr iki növdür: dil zikri və qəlb zikri. Həqiqi zikr qəlb zikridir və dil zikri qəlb zikrinə çatmaq üçün bir yoldur. Ayə və rəvayətlərdən mə`lum oldu ki, dil zikrini bir dəfəlik atıb, yalnız qəlb zikrinə məşğul .olmaq düzgün yol deyil

İnsan hansı yolla diqqətli ola bilər? Zikr nədir? Bu suallara "Ali-İmran" surəsinin ١٩٠-١٩١-ci ayələri cavab verir: "Həqiqətən, göylərin və yerin yaradılmasında, gecə-gündüzün bir-birini əvəz etməsində ağıl sahibləri üçün qəti mütləq dəlillər vardır. Onlar ayaq üstündə olanda, oturanda, böyrü üstə uzananda Allahı zikr edər, yerin yaradılması barədə düşünər və deyərlər: ey Rəbbimiz, Sən bunları boş yerə "!yaratmamısan

## MÜNASİBƏTLƏR

İnsan qəflətdən qurtulub doğru yolu tanıdıqdan sonra məqsədə çatmaq üçün müəyyən işlər görməlidir. Bəs insan Allaha yaxınlaşmaq üçün nə etməlidir? Bu suala cavab verməzdən əvvəl insanın fəaliyyət istiqamətləri, başqa sözlə, münasibətdə olduğu şeylər müəyyənləşdirilməli-dir. İnsan əsasən üç istiqamətdə fəaliyyət :göstərməlidir

İnsanın şəxsi və yalnız özünə aid olan vəzifələri. Gördüyümüz işlərin bir qismi yalnız.١ özümüzə aiddir. Məsələn, yemək, içmək və bu kimi başqa işlərin özümüzdən başqa .kimsəyə aidiyyatı yoxdur

İnsanın Allah qarşısındakı vəzifəsi. İnsan müəyyən işləri yalnız Allahın razılığı üçün.٢ .yerinə yetirir. Məsələn, namaz yalnız Allaha aiddir

İnsanın cəmiyyət qarşısındakı vəzifəsi. Onun ailə, yaxınlar, dostlar, bir sözlə.٣ cəmiyyətlə saxladığı münasibətlər ümumi fəaliyyətin üçüncü istiqamətini təşkil edir. İnsan nəinki başqa insanlar, hətta heyvanlar və təbiət qarşısında da müəyyən .vəzifələr daşıyır

### ALLAHA YAXINLIĞIN ƏSASI İMAN VƏ SALEH ƏMƏLDİR

Kamillik və səadətə çatmaq üçün iman və saleh əməl əsas şərtlərdəndir. Qur`ani–kərimdə bu iki xüsusiyyət adətən paralel zikr olunur. “Bəqərə” surəsinin ٢٥–ci ayəsində buyurulur: “İman gətirən və saleh əməllər edən kəslərə müjdə ver ki, onlar üçün altından arxlar axan bağlar var”. “Nisa” surəsinin ١٢٤–cü ayəsində oxuyuruq: “Mö`min halda saleh əməl edən kişilər və qadınlar cənnətə daxil olarlar”. Başqa bir ayədə buyurulur: “İman gətirib saleh işlər görənlərin xoş halına!”(١) “Kəhf” surəsinin ٣٠–cu ayəsində oxuyuruq: “İman gətirib saleh əməl edənlər bilsinlər ki, biz yaxşı işlər görənlərin əcrini zay etmərik”. “Ənbiya” surəsinin ٩٤–cü ayəsində isə belə buyurulur: .”“Hər kəs mö`min olaraq saleh əməllər etsə onun əməli zay olmayacaq

.Bu ayələrdən mə`lum olur ki, insan iman və saleh əməl üçün ciddi cəhd göstərməlidir



---

.Rə`d” surəsi ayə: ٢٩“ [٧٠] –١

?İman nədir və Allaha iman gətirmək nə deməkdir

İlk əvvəl belə nəzərə çarpır ki, iman “inam” deməkdir və elm yolu ilə əldə edilir. İnsan Allahın varlığını dərk edirsə, bu, Allaha imandır. İman Allahın varlığını təsdiqd .etməkdən ibarətdir. Elə bu səbəbdən də bə`ziləri imanı elmlə bərabər bilmişlər

Amma Qur`ani-kərimə müraciət etdikdə mə`lum olur ki, bu baxış yanlışdır. Qur`an elm və imanı bərabər bilmir. Bir şeyin varlığın bilmək hələ ona iman gətirmək demək deyil. “Nəml” surəsinin ۱۴–cü ayəsində buyurulur: “Ürəkdən əmin olduq-ları halda zülm və təkəbbür səbəbindən inkar etdilər”. Ayədə bildiklərini inkar edənlərə işarə olunur. Fir`on tərəfdarları Allahın varlığını və Musanın (ə) peyğəmbərliyini bildikləri halda bu həqiqətləri inkar edirdilər. Həzrət Musa (ə) Fir`ona müraciətlə buyurur: “Sözsüz ki, sən bilirsən ki, bu dəlilləri göylərin və yerin Rəbbindən başqası nazil etməmişdir”.(۱) Bu həqiqətlərə yəqinliyi olan Fir`onun imanı vardımı? O, nəinki iman gətirməmişdi, hətta (küfr edirdi: “Ey qövmün böyükləri, mən sizin üçün özümdən başqa tanrı tanımıram”.(۲

Beləliklə, “elm varsa, iman var” demək olmaz. Amma imanın yaranması üçün hökmən elm və agahlığa ehtiyac var. İnsan tanımadığı bir şeyə iman gətirə bilməz. Son dövrlər müsəlman ziyalılar arasında belə bir fikir var ki, elm olan yerdə iman mümkün deyil və iman yalnız cəhalətdən doğru! Məsihi alimlər arasında mövcud olan nəzəriyyə nisbətən yumşaqdır. Onların fikrincə, insan bilib anlamadığı şeyə iman gətirə bilər. .”Məsihilər arasında belə bir şüar da var: “İman gətir ki, anlayasan



---

.İsra” surəsi ayə: ۱۰۲“ [۷۱] -۱
.Qəsəs” surəsi ayə: ۳۸“ [۷۲] -۲

Əlbəttə ki, bunlar yanlış fikirlərdir "elm varsa iman var əks təqdirdə yox" kimi fikirlər .həqiqətdən uzaqdır

### İSTƏK VƏ İRADƏNİN ROLU

İman elmdən əlavə insanın istək və iradəsindən asılı olan xüsusiyyətdir. İnsan bə`zən istəmədən elm qazana bilir. Amma istək olmayan yerdə imandan danışmağa dəyməz. İnsan təsadüfən elmi bir söhbəti eşitməklə bilik əldə edər. Amma iman belə deyil. "Nisa" surəsinin ١٧٠–ci ayəsində buyurulur: "Ey insanlar! Peyğəmbər Rəbbiniz tərəfindən haqqı gətirdi. İman gətirsəniz, bu sizin üçün daha yaxşıdır". Əgər iman .məcburi bir iş olsaydı Qur`ani–kərim insanı imana də`vət etməzdi

İnsanın imana münasibətdə malik olduğu ixtiyar insanın qəlbinə aiddir və ona tə`rif vermək çətindir. Ümumiyyətlə, ruhun hallarına tə`rif vermək asan iş deyil. Məsələn, qəlbin eşq adlı bir halı var. Hamı bilir ki, eşq nədir. Amma ona nöqsansız tə`rif verə .bilmirik

İman o zaman qəlbdə peyda olur ki, insan müəyyən həqiqətə ehtiyaclı olduğunu anlayır və ona yaxınlaşmaq qərarına gəlir. Bir həqiqəti bilib ona münasibətdə vəzifə .hiss etmiriksə bu, iman yox, sadəcə, elmdir

Məsələn, siqaretə vərdişkar olanlar onun nə qədər zərərli olduğunu bilirlər. Siqaret çəkdiyi üçün müxtəlif xəstəliklərdən əziyyət çəkənlər göz qabağındadır. Deməli, əksəriyyət bilir ki, siqaret insan orqanizmi üçün təhlükəlidir. Amma bütün bu biliklərdən mə`lumatlı olan insan yenə də müxtəlif bəhanələr gətirərək adəti üzrə siqaret çəkir. O, bir növ öz bildiyinin ziddinə hərəkət edir. Dini e`tiqada əsasən bu hal küfr adlanır. Küfrün ən yüksək dərəcəsi odur ki, Allahın varlığını elmi cəhətdən bilən insan onun qarşısında vəzifədən boyun qaçırmaq üçün bildiyini inkar edir. "Küfr" sözünün lüğət mə`nası "örtmək"dir. İnsan o zaman kafir adlanır ki, həqiqəti ört-bastır edir. Allahı inkar edən kafir anlayır ki, Allaha iman gətirərsə müəyyən şərtlərə

əməl etməlidir. Bu şərtlər isə ona ağır gəlir. “Qiyamət” surəsinin ٣-۶-cı ayələrində oxuyuruq: “Məgər insan elə güman edir ki, onun sümüklərini bir yerə yığa bilmərik? Bəli, biz onun barmaqlarının bəndlərini düzməyə qadirik. Amma o, bütün ömrü boyu ”?günah etmək istəyir və qiyamət gününün nə vaxt olacağını soruşur

Görəsən qiyamət gününü inkar edənlərin bir dəlili varmı? Əgər yoxdursa, nə üçün bu böyük həqiqəti inkar edirlər?! Səbəbi aydındır: o, azad olmaq, yaxşıya pisə məhəl qoymadan istədiyini etmək, çərçivədə olmamaq istəyir. Amma insanın istədiyi mütləq azadlıq həm imana ziddir, həm də imkansızdır. İmanlı insan Allahın qoyduğu hədləri gözləməli və Onun razılığından ləzzət almalıdır. Məsələn, yaşlı və zəif baba nəvəsini dalına mindirib dizi üstə at kimi yeriyir. Bu iş onun üçün əziyyət olsa da nəvəsinin razılığından sevinc duyur. Zəif də olsa bu misaldan aydın olur ki, insan üçün başqasının razılığı o qədər şirin ola bilər ki, bu yolda min bir əzaba qatlaşar. Mö`min insan Allahın .razılığını nəfsinin razılığından üstün tutur

Bir sözlə, iman odur ki, insan bildikdən sonra onun şərtlərinə əməl etsin. Demək, iman bilmək və bildiyinin tələblərinə uyğun olaraq ona əməl etməkdir. Ən azı, bə`zi şərtlərə əməl edilməlidir. Amma bildiyinə əməl etməmək küfr halına uyğun gəlir. “Qəlbləri əmin (olduğu halda inkar etdilər”.(١)



---

.Nəhl” surəsi ayə: ١۴“ [٧٣] -١

## :ON SƏKKİZİNCİ DƏRS

## İMANIN ÜNVANI VƏ MƏRTƏBƏLƏRI

### ÖTƏN MÖVZULARA BİR BAXIŞ

Ayə və rəvayətlərdən mə`lum oldu ki, insanın süqutunun əsl səbəbi qəflət, onun ziddi isə diqqətdir ki, insanı xoşbəxtliyə aparır. Qeyd edildi ki, söhbət hansısa qeyri–zəruri mövzudan yox, dinin əsasını təşkil edən tövhid, nübüvvət və məaddan xəbərsizlikdən gedir. İnsanın diqqət mərkəzində olmalı məsələlərin ən mühümü budur ki, varlıq aləmi müstəqildir, yoxsa öz yaradıcısından asılı vəziyyətdədir? Bu suala doğru cavab tapan insan üçün bir çox qaranlıq məsələlər öz-özünə işıqlanır. Mərhum Əllamə Təbatəbai və digər böyük alimlərin fikirincə bütün biliklər tövhiddən qaynaqlanır. Yaradıcı haqqında .düşünən insan hökmən bir Allahı qəbul edir

Əgər qəbul etsək ki, varlıq aləmi müstəqil deyil, onun başqa bir müstəqil zatdan asılılığını qəbul etməyə məcburuq. Belə bir zat, yə`ni başlanğıc bütün nöqsanlardan .uzaq və sonsuz kamala sahib olmalıdır

Başlanğıcı qəbul edən insan bu zatın sifətlərini tanımağa çalışmalıdır. Yaradıcının sifətlərini tanımaq mərhələsində rastlaşdığımız sifətlərdən biri hikmətdir. Allahın hikmət sahibi olması sübut edir ki, varlıq aləmi əbəs yerə yaradılmamışdır. Demək, insanın da yaranışı mə`na kəsb edir. Əgər yaradılış mə`nasız deyilsə insan öz yaranış məqsədini müəyyənləşdirməlidir. Amma insan yalnız ağlına istinad etməklə bu suala cavab tapa bilməz. Ona görə də Allah–təala vəhy yolu ilə insanı istiqamətləndirir. Bu .arıdıcıllıqla tövhid bəhsindən nübüvvət bəhsinə keçirik

Allahın digər bir sifəti ədl, yə`ni Allahın ədalət sahibi olmasıdır. Məhz bu ədalət səbəbindən mö`minlə kafirə, yaxşı ilə pisə fərq qoyulmalıdır. Doğru yolu seçənlər mükafata, azğınlıq yolunu seçənlər isə cəzaya çatmalıdır-lar. Bu məqamda məad məsələsi ortaya çıxır. Göründüyü kimi, bütün məsələlər tövhiddən qaynaqlanır. Bəli, .tövhid həyatın əsl mayasıdır

Din və İslam Allahı tanımaq, Ona pərəstişdən ibarətdir və pak-pakizə olan "la ilahə illəllah" kəlməsi ilə ifadə olunmuşdur. Allahı pərəstişə layiq bildikdən sonra belə bir sual ?yaranır ki, Ona necə pərəstiş etmək lazımdır

Bu sualın cavabı İslamın göstərişləridir. Bütün bu göstərişlər yalnız pərəstiş yolunu işıqlandırır. "Biharul-ənvarda" belə bir hədis var: "İslam təslim olmaqdır". (۶۸–ci cild). Bəli, insan pərəstişə layiq yeganə varlıq qarşısında təslim olmalıdır. İnsan çalışaraq elə bir nöqtəyə çatmalıdır ki, bu sözləri deyə bilsin: "Mən özümü Allaha təslim etdim".(۱) İnsan elə bir məqama çatmalıdır ki, nəzərləri yalnız varlıq aləminin yaradıcısına dikilsin. Elə bu səbəbdən də Qur`ani–kərim insanı təslim məqamı-na çatdıracaq iman və saleh



---

.Ali–İmran" surəsi ayə: ۲۰" [۷۴] -۱

əmələ çağırır. İlk öncə iman və saleh əməlin mahiyyətini araşdırmaq lazım gəlir

## MARKSİZM VƏ SİVİL DÜNYASI

Mühüm suallardan biri budur ki, insan nəyə iman gətirməlidir? Belə demək olar ki, hamı imanlıdır, amma baxır nəyə. Müşrkilər də öz bütlərinə iman gətirmişdilər. Öz növbəsində, materialistlər də materiyaya, yə`ni maddəyə imanlıdırlar. Qur`ani–kərimdə buyurulur: "İman gətirib saleh işlər görənləri tezliklə behiştə daxil edərik".(١) Görən, nəzərdə hansı iman tutulur? İslamla tanış olanlar üçün aydındır ki, söhbət hansı imandan gedir. Amma dinin ən əsas məsələlərinə şəkk–şübhələrlə yanaşılan bu .dövrdə iman haqqında təkrar danışmağımız lazım gəlir

Bir zaman materialistlik elə dəbə düşmüşdü ki, bu əqidə ziyalılığın zirvəsi hesab olunurudu. Hətta bə`zi ruhanilər də tə`sir altına düşərək marksizmi dəstəkləyirdilər. Şəhid Mütəhhərini şəhadətə yetirən "Fürqan" dəstəsinin başçısı həmin marksist baxışlı ruhani tələbələrdən idi. Bu insanlar Qur`anı öz bildikləri kimi təfsir edir və "iman" dedikdə "məqsədə imanı" nəzərdə tuturlar. Onların məqsədi isə tam bərabər cəmiyyət qurmaqdır. Onlar marksizmin bəyan etdiyi "təbəqəsiz cəmiyyət" ideyasına əsaslanırdılar. Amma bütün bu fikirlərə dini don geyindirilir-di. Marksizm nəzəriyyəsinin əsas müddəalarından biri ictimai təbəqələrin ləğv olunmasıdır. Bu ideyaya uyan ruhanilər möcud olacaq yeganə təbəqəni tövhidə bayrağı altında yaşayan cəmiyyət kimi yozurdular. Bəli, Marks və Engelsin vahid sosial təbəqəsinə "İslam tövhid"i donu geyindirilirdi. Onlar imanı məqsədə təkallahlı cəmiyyətinin təşkili, .bu cəmiyyəti isə bərabər təbəqəli cəmiyyət kimi tanıtdırırdılar



---

.Nisa" surəsi ayə ٥٧" [٧٥] -١

Həqiqi imanın ünvanını öyrənməyən insan gec-tez səhvə düçar olacaqdır. Həqiqi imanı tanımaq üçün Qur`an ayələrinə müraciət edək. "Bəqərə" surəsinin ١٧٧-ci ayəsində buyurulur: "Yaxşılıq təkcə üzünüzü gün çıxana və ya günbatana çevirməklə deyil. Yaxşı əməl odur ki, insan Allaha, axirət gününə, mələklərə, kitab və peyğəmbərlərə inanıb olanından Allah yolunda sərf etsin". Ayədən aydın görünür ki, insan hansı həqiqətlərə iman gətirməlidir. Amma iman üçün sadalanmış ünvanları bir adla da ifadə etmək olar: Allaha bütün sifətləri ilə birgə iman! Bəli, bütün İslam bilikləri tövhiddən qaynaqla-nır. Bütün imanların ruhu Allaha imandır. Digər həqiqətlərə iman Allaha imanın əsərləridir. Əlbəttə ki, Allaha iman gətirmiş insan Onun sifətlərinə də iman gətirməlidir. Bu sifətlərdən biri hikmətdir və Allahın hikməti peyğəmbərlərin göndərilməsini zəruri edir.

Beləcə Allaha imanın səh:١٣٠

ardınca peyğəmbərə iman gəlir. Peyğəmbərlərə iman onların Allah tərəfindən gətirdiyi kitablara iman doğurur. Bu məqamda mələklərə də iman gətirmək lazım gəlir. Bu .sadalananların nəticəsi olaraq məad və qiyamət gününə iman gətirmək vacib olur

Öz mühakiməsində ədalətə əsaslanan istənilən bir şəxs heç vaxt inkar etməz ki, Qur`ani-kərim iman dedikdə Allah, onun sifətləri və şərtlərinə imanı nəzərdə tutur. Qur`anda mövzudan asılı olaraq insan üçün müxtəlif ünvanlar göstərilir ki, bütün bu :ünvanlar tövhidd ətrafında cəmlənir. Nümunə olaraq bir neçə ayə göstərək

Peyğəmbər Rəbbi tərəfindən ona nazil edilənə iman gətirdi və bütün mö`minlər“ Allaha, mələklərə, kitablara və peyğəmbərlərə iman gətirdilər”.(۱) “Allaha və axirət gününə iman gətirib saleh əməllər edənlər üçün heç bir qorxu yoxdur”.(۲) “Allah və Onun rəsuluna iman gətirin”.(۳) “Bizim ayələrimizə iman gətirənlərə de ki, salam olsun (sizə”.(۴) “Allaha, Onun rəsuluna və göndərdiyimiz nura iman gətirin”.(۵

### İMANLA ELMİN FƏRQLƏRİ

Əvvəlki söhbətlərdən aydın oldu ki, iman insanın istək və iradəsindən asılıdır. Məhz bu cəhətə görə də iman elmdən fərqlənir. Qeyd edildi ki, elm iman üçün bir şərtdir. Amma “elm varsa, iman da var” demək olmaz. Fir`on haqqında danışan ayələrdən mə`lum (oldu ki, bə`zən insan varlığına əmin olduğu şeyi də inkar edə bilər.(۶



---

.Bəqərə” surəsi, ayə: ۲۸۵“ [۷۶] -۱

.Maidə” surəsi, ayə: ۶۹“ [۷۷] -۲

.Ə`raf” surəsi, ayə: ۱۵۸“ [۷۸] -۳

.Ən`am” surəsi, ayə: ۵۴“ [۷۹] -۴

.Təğabun” surəsi, ayə: ۸“ [۸۰] -۵

.Nəml” surəsi, ayə: ۱۴“ [۸۱] -۶

Deməkən, iman elmdən əlavə istək və iradə ilə də bağlıdır. İnsan elm yolu ilə əldə etdiyi həqiqəti qəlb vasitəsi ilə istəməlidir. Bu istək yoxdursa qəbul olunmuş həqiqətə münasibətdə inkar, küfr mövqei labüddür. İnsan bilməməzlik üzündən də inkar edə bilər. Bu küfrün aşağı dərəcəsidir. Amma küfrün ən yuxarı dərəcəsi insanın öz bildiyini .inkar etməsidir

İnsan Allahı Allah, peyğəmbəri peyğəmbər bilməklə xoşbəxt olmur. Yalnız bu həqiqətlərə qəlbən bağlanmış insan lazımi şərtləri yerinə yetirərək xoşbəxt ola bilər. Yalnız bildiyinə əməl edən insan iman qazanır. Hətta bir neçə əməli bilərəkdən inkar etmək küfr hesab olunur. Qur`ani-kərimdə bu barədə buyurulur: “Allaha və onun peyğəmbərlərinə kafir olanlar onlar arasında ayrılıq salmaq üçün dedilər: biz bə`zisinə inanırıq və bə`zisini inkar edir-ik”.(۱) “Bəqərə” surəsinin ۸۵-ci ayəsində buyurulur: “Siz kitabın bir hissəsinə iman gətirib o biri hissəsini inkarmı edirsiniz? Bu cür iş görənlərin cəzası dünyada rüsvayçılıq, qiya-mət günündə isə ağır əzabdır”. Ayələrdən mə`lum olur ki, peyğəmbər buyuruqlarının birini qəbul edib digərini inkar edənlər əsil kafirlərdir. Əgər bütün hökümlər Allah tərəfindən göndəri-libsə insan hansı əsasla bir hökmü qəbul, digərini inkar edə bilər. Allahın hökmünü öz xətalı ağlı ilə ölçən insan Allaha yox, öz nəfsinə pərəstiş edir. Qur`ani-kərimi qüsurlu hesab edən insan həqiqi kafirdir. Bu cür küfrün batini küfrdür, zahiri isə İslamla pərdələnmiş-dir. Zahirən müsəlmanlığa əməl edib batində həmin əməllərə inanmayan insan cəhənnəm əhlidir. Dildə şəhadət kələmələrini deyən insan zahirən müsəlman olur. Amma bu həqiqi müsəlmanlıq deyil. Əslində münafiq hesab edilən bu insanlar peyğəmbər dövründə də var idi və Həzrət Peyğəmbər (s) onlarla başqa



---

.Nisa” surəsi, ayə: ۱۵۰“ [۸۲] -۱

müsəlmanlar kimi rəftar edirdi. Hər halda açıq kafirlə gizli kafirə zahirən eyni .münasibət göstərmək olmaz

### İMANIN MƏRTƏBƏLƏRİ

İman mövzusunda diqqəti cəlb edən məsələlərdən biri onun mərtəbələridir. İmanın müxtəlif dərəcələri vardır. “Mö`min” adlandırılan insanların iman dərəcələri bir-:birindən fərqlənir. Bə`zi ayələrə nəzər salaq

Mö`minlər yalnız o şəxslərdir ki, Allahı yada saldıqda ürəkləri titrəyər, Allahın ayələri“ onlara oxunduqda imanları artar və öz Rəbblərinə təvəkkül edərlər”.(١);“Mö`minlərin imanlarının üstünə iman artırmaq üçün onların qəlblərinə arxayınlıq nazil edən Odur”.(٢); “Camaat onlara deyəndə ki, “sizə qar-şı bir yerə yığışmışlar, onlardan qorxun”, onların imanları artırıldı”.(٣) “Mö`minlər müşrik dəstələrini gördükdə dedilər: “Bu, Allah və Onun rəsulunun bizə verdiyi və`ddir. Allah və Onun rəsulu düz demişlər”. (Bu, yalnız onların iman və təslimçiliklərini artır-dı”.(۴

Bu ayələrlə tanış olduqdan sonra heç bir şübhə qalmır ki, imanın dərəcələri var və bu dərəcələr artıb–azala bilər. Bə`zi rəvayətlərdə bu dərəcələr haqqında danışılmışdır. İmam Sadiq (ə) buyurur: “İmanın on dərəcəsi var. Səlman onuncu, Əbuzər doqquzuncu və Miqdad səkkizinci iman dərəcəsindədirlər”.(۵) Digər bir rəvayətdə buyurulur: “Allah-təala imanı yeddi paya bölüb: yaxşılıq, düzgünlük, yəqinlik, razılıq, vəfadarlıq, elm və dözüm. Sonra onu xalq arasında bölüb. Kiminə bir, kiminə iki və ya daha çox pay düşüb ... Bir pay imana malik olan şəxsə iki pay imanı olan şəxsin



---

١- [٨٣] “Ənfal” surəsi, ayə: ٢.
٢- [٨۴] “Fəth” surəsi, ayə: ۴.
٣- [٨۵] “Ali-İmran” surəsi, ayə: ١٧٣.
۴- [٨۶] “Əhzab” surəsi, ayə: ٢٢.
۵- [٨٧] “Biharul-ənvar”, ۶٩-cu cild.

yükünü yükləməyin ... Onlar bu yükü daşıya bilməz”.(١) Sonsuzluğa uzanmış şüanı sonsuz parçalara ayırmaq mümkün olduğu kimi imanın da dərəcələrini sonsuzluğadək artırmaq olar. Əgər iman on dərəcəyə bölünübsə hər bir dərəcənin özünü də .dərəcələrə ayırmaq olar

## İMANIN MƏRTƏBƏLƏRİNDƏN ÖTRÜ ME’YAR

İmanın nə dərəcədə olduğunu müəyyən etmək üçün insanların əməlinə diqqət yetirmək lazımdır. Ən yüksək iman mərtəbəsinə çatmaq üçün istisnasız olaraq bütün dini göstərişlərə əməl etmək lazımdır. Əməl azaldıqca iman dərəcəsi də azalır. Amma hətta bir dini göstərişi qəlbən qəbul etməyən şəxs kafirdir. Yalnız bütün dini göstərişləri qəlbən qəbul edib bu göstərişlərə əməl etmək fikirində olan insan imanın birinci pilləsinə qədəm qoyur. Qəlbən qəbul etdiyi buyuruqlara qismən əməl edən insan öz əməlinə uyğun iman mərtəbəsində yer tutur. Diqqət edin, söhbət qismən qəbul etməkdən yox, qismən əməl etməkdən gedir. Yə`ni hansısa bir ilahi göstərişi qəlbən qəbul etməyən insanda iman axtarmağa dəyməz. Allahı qəbul edən insan Onun qarşısında tam təslim olur. Allah qarşısında qismən təslimçilik məqbul deyil. Amma bütün dini buyuruqları qəlbən qəbul etmiş insan bu buyuruqlara qismən əməl edirsə, o, kafir yox, günahkar mö`min sayılır. Kafirin nöqsanı inamında, günahkarın nöqsanı isə əməlindədir. Günahkar şəxs kafir şəxsdən fərqli olaraq bütün həqiqətləri qəbul edir, sadəcə, nəfsin vəsvəsələri ucbatından əmələ münasibətdə süstlük .göstərir

Nöqsansız inam və nöqsansız əməl sahibləri “mə`sum”, yə`ni günahsız adlanır. İslam dini yalnız on dörd nəfəri mə`sum hesab edir. On dörd mə`sum dedikdə Həzrət Peyğəmbər (s), qızı Fatimə (s) və on iki



---

.Biharul-ənvar”, ۶٩-cu cild“ [٨٨] -١

imam nəzərdə tutulur. Sözsüz ki, bu on dörd nəfərdən başqa da günahsız adamlar ola bilər. Məsələn Xanım Zeynəb (ə), Həzrət Əbülfəzl Əbbas (ə) kimi ilahi şəxsiyyətləri günahkar hesab etmək olmaz. On dörd mə`sumu digərlərindən fərqləndirən isə onların günahsızlığına zamin durulmasıdır. Bu on dörd nəfərin günah-sızlığına e`tiqad şiə məzhəbində əsas şərtlər-dəndir. Amma başqalarını günahsız qəbul etmək şərt .deyil

## İMANIN ALİ MƏRTƏBƏLƏRİNDƏN NÜMUNƏLƏR

Mərhum Seyyid Mürtəza və Mərhum Seyyid Rəzi böyük şiə alimlərindəndir. Bu iki qardaş mərhum Şeyx Müfidin şagirdiləri olmuşlar. Bir gün Şeyx Müfid yuxuda görür ki, Həzrət Fatimə (s) imam Həsən və imam Hüseynin əlindən tutub Şeyx Müfidin yanına gətirir və buyurur: "Ya Şeyx, bu uşaqlara fiqh öyrət". Şeyx bu yuxunun tə`sirində ikən sübh tezdən bir qadın iki uşaq gətirib Həzrət Zəhranın (ə) sözlərini təkrar edir: "Ya Şeyx, bu uşaqlara fiqh öyrət". Bu uşaqlar həmin Seyyid Mürtəza və Seyyid Rəzi idi. .Şeyx Müfid öz yuxusunu bu uşaqlara yozur

Bir gün bu iki böyük şəxsiyyət ikilikdə namaz qılmalı olurlar. Fiqhə əsasən cəmiyyət namazında daha təqvalı və pəhrizkar şəxs pişnamaz dayanmalıdır. Seyyid Mürtəza və Seyyid Rəzi hər ikisi bu hökümlə tanış idilər. Seyyid Mürtəza deyir: "Buyurun, heç bir günaha yol verməmiş insan pişnamaz durarsa daha yaxşıdır". Seyyid Rəzi belə cavab verir: "Siz buyurun, fikrindən günah keçməmiş insan pişnamaz durarsa daha yaxşı ."olar

Ayətullah Behcət buyurur: "Nəcəfdə təhsil aldığımız zaman Qacar nəslindən olan bir nəfərlə tanış idim. O, bir vaxt İranın İraqda konsulu vəzifəsində çalışmışdı. Bu pak insan konsulluğ işini bitirdikdən sonra Nəcəf

şəhə-rində həzrət Əlinin (ə) məqbərəsi yaxınlığında məskunlaşmışdı. Bu cüssəli, vüqarlı yerişə malik insanın daim təvazö ilə aşağı əyilmiş başı sanki, o pəhləvan cüssədən deyildi. Bu şəxs ehtizar halında, can verərkən belə deyirdi: “Pərvərdigara, özün bilirsən ki, yetkinliyə çatdığım gündən indiyədək bilərəkdən günah etməmişəm. Amma e`tiraf edirəm ki, hüzurunda əlim boşdur. Əgər mənə rəhm etməsən, heç bir mükafata haqqım yoxdur. Rəhm et mənə, ya Rəbb!”

Əqli və fəlsəfi baxımdan adi bir insanın kamilliyə çatması, imanını qoruyub günaha yol verməməsi mümkündür. Amma, əlbəttə ki, böyük əksəriyyətin imanı zəifdir. İnsan yıxılır, durur, bir gün müt`i, bir gün isə asi olur. İnsanın iman mərtəbəsi onun yol verdiyi günahların miqdarı ilə tə`yin olunur. Hər birimiz çalışmalıyıq ki, Allahın yardımı ilə günahdan uzaqlaşaq.

:ON DOQQUZUNCU DƏRS

İMANI GÜCLƏNDIRMƏK YOLLARI

ZAHİRİ İMAN VƏ BATİNİ KÜFR

Qeyd edildi ki, nəfsin tərbiyəsində ilkin mərhələ qəflətdən qurtulmaq və diqqətli olmaqdır. Növbəti mərhələdə insan öz istək və iradəsi ilə iman qazanmağa çalışmalıdır. Deyildi ki, iman məcburi iş deyil və ona çatmaqda insan iradəsi-nin rolu .var

O da mə`lum oldu ki, zikr və diqqət halının mərtəbələri olduğu kimi, imanın da mərtəbələri var və biz imanın dərəcələrini sübuta yetirən bə`zi ayələrə müraciət (etdik.(١

Batini küfrdən qurtulmuş və cəhənnəmdən xilas olmaq üçün imanın ilk mərtəbəsi Allah və Onun sifətlərinə iman gətirməkdir. Bu iman cəm şəkildədir. Yə`ni Allahı qəbul edib onun bir sifətini inkar etmək, bir peyğəmbəri doğurçu, o birini yalançı bilmək, dini qəbul edib onun hansısa bir hökmünə qarşı çıxmaq iman deyil. Həqiqət tam şəkildə qəbul edilməlidir. Məsələn, bütün dini hökümləri qəbul edib, hicab hökmünü inkar edən insanın ٩٩٩ hökmü qəbul etməsi



---

.Ənfal” surəsi, ayə: ٢; “Fəth” surəsi, ayə: ۴“ [٨٩] -١

.faydasızdır. “Nisa” surəsinin ١٥٠-١٥١–ci ayələri bu fikri təsdiqlədi

Demək, imanın ilk mərtəbəsi bütün ilahi göstərişlərin, bütün peyğəmbərlərin, bütün şəriət hökümlərinin istisnasız olaraq, tam şəkildə qəbul etmişdir. Hətta qəlbin bir küncündə hansısa ilahi bir hökmə cüz`i e`tiraz olarsa bu e`tiraz küfr hesab olunur. Qeyd edildi ki belə bir küfr zahiri İslamla bir araya sığır. Yə`ni belə bir şəxs öz e`tirazını gizlədiyi halda cəmiyyətdə müsəlman kimi qəbul olunur. Belələri dünya .həyatında müsəlmanlığın imtiyazlarından istifadə etsələr də, axirətdə əzab əhlidirlər

İmanın mərtəbələri haqqında danışarkən bu da aydın oldu ki, bu mərtəbələr sonsuz saydadır. Adi insanlarla övliyaların, övliyalarla Həzrət Əlinin (ə) iman dərəcələri arasında fərq olduqca böyükdür. Həzrət Əli (ə) buyurur: “Əgər (xaliqlə xilqət arasındakı) bütün pərdələr qaldırılarsa imanım bir zərrə də artırılmayacaq”. Adi insan-ların imanı övliyaların imanı ilə müqayisədə dərya müqabilində bir damla suyu .xatırladır

İman dərəcələri arasındakı fərqlər insanların ibadətində, yol verdikləri günahlarda üzə çıxır. İnsanın ilahi razılığı qazanmaq yolunda göstərdiyi çalışqanlıq onun iman .dərəcəsini göstərir

Dedik ki, insanın elm və biliyi onun imanının göstəricisi deyil. Cəmiyyət fədakar insanlara ehtiyaclı olduğu vaxt şahid oluruq ki, bir çox savadsız insanlar Allah yolunda canından keçir. Nə inki şəhidlər, hətta bu şəhidlərin ata-analarının, ailə-övladlarının ruhiyyəsinə qibtə etməmək olmur. Bəli, əsl mö`min Allahın razılığını qazanmaq üçün .canından belə keçməyə hazırdır

İnsanı heyvandan fərqləndirən xüsusiyyətlərdən biri budur ki, onun istəyi bitib tükənmir. İmam Rahil buyurur ki, insan ilk əvvəl Allahdan bir qarın çörək və altına girmək üçün dam istəyir. Bu istəyə çatdıqdan sonra yavanlıq və abırlı ev fikirinə düşür. Arzular o qədər uzanır ki, insan nəhayətdə yer üzünə hakim olmaq istəyir. Bu məqamda ona yer kürəsini versən də sakitləşən deyil. O, aya çıxıb ulduzlara tamah salacaq. Bu xüsusiyyət bütün insanlarda var. Sonsuz kamilliyə çatmaq istəyi də bu .xüsusiyyətin dəlilidir

Maraqlıdır ki, öz sə`ylərində hədd-hüdud tanımayan insan Allaha yaxınlaşmaqda, mə`nəviy-yatını kamilləşdirməkdə süstlük göstərir. Heç nəyə qane olmayan insan necə olur ki, imanın ən aşağı mərtəbəsi ilə kifayətlənir. Doğrudanmı, insan behiştə ən aşağı məqamı bəs bilir? Bu ziddiyyətin əsl səbəbi insanın ruhunda mövcud olan zəiflik və xəstəlikdir. Zökəm insan dadlı xörəklərdən imtina etdiyi kimi, ruhən sağlam olmayan insan da mə`nəvi ləzzətlərdən imtina edir. Sağlam insan sonsuzluğa meyllidir .və sonsuz kamilliyə biganəlik xəstəlik əlaməti hesab olunmalıdır

İstənilən hər birimiz əmin olsaq ki, cəhənnəm yox, behiştə düşəcəyik dərhal rahatlaşarıq. Bəli, insan öz behişt məqamını ucaltmaq əvəzində dünya işlərinə məşğul .olmağı üstün tutur. Bu münasibət iman zəifliyindən doğur

Ey Rəbbimiz, bizi sonsuz kamala çatmaq arzusunda olanlardan qərar ver. Mən də övliyaların çatdığı uca məqama çatmaq istəyirəm. Mənə kömək ol sən bu məqamı biz !insanlar üçün yaratmısan. Biz isə süstlük göstəririk. Bizi süstlükdən qurtar ya Rəbb

İmanı güclənirmək yollarından biri elm və biliyin artırılmasıdır. Dedik ki, imanın mərtəbələri var və insan öz imanını artıra bilər. İmanın yaranmasına kömək olan səbəblər gücləndirilərsə, iman da güclənər. Heç nə səbəbsiz yaranmır və imanın da yaranma səbəbi var. İnsan heç bir istəyə zəhmətsiz çata bilmir və bu zəhmət istəyin dəyərindən asılıdır. Yə`ni böyük məqsədlərə çatmaq üçün böyük çətinlikləri adlamaq .lazım gəlir. İman isə ən böyük məqsəd, ən dəyərli ne`mətdir

İmanı gücləndirmək üçün onun amillərini tanıyıb sadədən mürəkkəbə doğru bu amilləri gücləndirmək lazımdır. Qeyd etmişdik ki, imanın ən azı iki əsas amili var: elm və .istək. İman gücləndirmək üçün bu iki amilə diqqət yetirmək lazımdır

İmanın ilk iki şərtindən biri olan elm və mə`rifət əldə etmək üçün əsasən iki :istiqamətdə fəaliyyət göstərmək olar

Əvvəla, iman gətirdiyimiz həqiqətlərin hər biri üçün yetərli dəlillər toplayıb bu dəlilləri.۱ öyrənməliyik. Allahşünaslıq, axirətşünaslıq kimi elmlər imanı gücləndirən vasitələrdir. Məhz bu səbəbdən elm və alimə böyük qiymət verilmişdir. Bir daha qeyd edək ki, iman üçün elm mütləq şərt deyil. Çünki bir çox alimləri cəhənnəmə aparan onların elmi olur. Yalnız o elm faydalıdır ki, insanın mə`nəvi yüksəlişinə xidmət edir. Elm insanı şübhə .burulğanından keçirir və onun əqidəsini sabit edir

İkinci mühüm məsələ insanın əldə etdiyi elm və mə`rifəti ardıcıl şəkildə.۲ xatırlamasıdır. Əgər insan istəyirsə ki, qazandığı elm və mə`rifətdən bəhrə götürsün onları diri saxlamalıdır. Bir növ “sandıqda saxlanan” elm çətin anlarda insanın əlindən tuta bilmir. İnsan yalnız diqqət mərkəzində saxladığı elmlərdən faydalanır. İnsan “Əllahu əkbər” sözləri haq-qında

yalnız ilk dəfə eşitdiyi zaman maraqlanıb sonra ömür boyu bu sözü kor-koranə təkrar edərsə yetərincə faydalana bilməz. Amma hər dəfə "Əllahu əkbər" deyərkən Allahın böyüklüyü barədə düşünən insan öz imanını gücləndirir. Gün uzunu namazlarda bu .sözlərin deyilməsinin vacib buyurulması insanın təkamülü ilə əlaqədardır

İnsan zehni daimən dəyişkən haldadır. Zehnin qəbul etdiyi hər bir mə`lumat özündən əvvəlki mə`lumatı ikinci plana keçirir. Öz biliklərini təkrar etməyən insan həmin biliklərdən istifadə etmək gücündə deyil. Vacib buyurulmuş beş vaxt namazın fəlsəfəsi də daimi olaraq insana Allahı xatırlatmaqdır. Bir biliyin təkrarı həmin biliyin insan .zehnində daha fəal mövqe tutmağına səbəb olur

Ali-İmran" surəsinin ۱۹۱-ci ayəsində insan üçün mümkün olan üç hal zikr olunur. İnsan" ya oturur, ya durur, ya da uzanır. Ayədə insanın nəzərinə çatdırılır ki, insan bütün .vəziyyətlərdə Allahı zikr etməlidir

Demək, imanın ilk ünsürünü gücləndirmək üçün iki iş görmək lazımdır: yetərli dəlillərə malik olmaq və bu mə`rifəti diri saxlamaq. Şübhə bazarının gur olduğu dövrümüzdə elmi dəlillərin əhəmiyyəti çox böyükdür. Dünyada insanları dini əqidədən uzaqlaşdırmaq missiyası daşıyan nəhəng təşkilatlar fəaliyyət göstərir. Əqidəsi bünöv-rəsiz olan savadsız insanlar Allah eləməmiş bu təşkilatların hədəfinə çevrilərsə bir .anda imanını itirər. Yetərli dəlillərə malik olanlar üçün isə belə bir təhlükə yoxdur

**...İMAN VƏ İRADƏNİN QARŞILIQLI ƏLAQƏSİ VƏ**

## İMAN VƏ İRADƏNİN QARŞILIQLI ƏLAQƏSİ VƏ BU YOLLA İMANIN GÜCLƏNDİRİLMƏSİ

İmana mühüm tə`sir göstərən ikinci amil insanın istək və iradəsidir. İnsan həqiqəti tanıdıqdan sonra bu həqiqət qarşısında təslim olmazsa imana nail ola bilməz. Çox vaxt ,insan həqiqəti anlasa da onu inkar edir. Demək

imanı gücləndirməkdən ötrü ilk öncə onu qəbul etmək ruhiyyəsini gücləndirmək .lazımdır

Sual oluna bilər ki, insan bildiyi həqiqətə nə üçün boyun əyməməlidir? Çünki həqiqəti qəbul edən insan bir çox istəklərindən əl çəkməlidir. Həm nəfs, həm də həqiqət qarşısında eyni zamanda əyilmək qeyri-mümkündür. Elə buna görə də çoxları nəfs istəklərinə üstünlük verir. Həqiqəti ötəri həvəslərə qurban vermək ağılsızlıq olsa da insan bu yolu gedir. Qur`ani-kərim buna misal olaraq Fir`on ardıcıllarını göstərir.(۱) Əgər onlar Həzrət Musanın (ə) də`vətini qəbul edərdilərsə öz zül və sitəmlərindən əl .çəkməli olacaqdılar. Onlarınsa belə bir fikri yox idi

Həqiqət qarşısında təslim olmaq üçün istək və meyllər qarşısında məhdudiyyət qoymaq zəruridir. Bu həqiqətə zidd olan istəklərdən isə bir dəfəlik əl çəkmək lazımdır. Körpə uşağın qarşısında günah etməkdən çəkinən insan Allahın hüzurunda olduğunu dərk edərsə günaha necə yol verər? Bunun səbəbi günahdan gələn ləzzətin Allahı unutdur-masıdır. Rəvayətlərdə bildirilir ki, bə`zi günahlar insandan iman ruhunu alar və onu mö`minlər cərgəsindən çıxarar. Amma bir müddət sonra insan itaətsizlik halından çıxar və iman ruhu yenidən ona qayıdar.(۲) Deyilənlərdən belə mə`lum olur ki, günahla iman bir araya sığmır. İman dildə “Allah” demək yox, Allah qarşısında təslim olmaqdır. Allahın hüzurunda olduğuna inanan insan ən azı günaha cür`ət etməməlidir. Qiyamət sorğusuna əmin olan insan günaha yol verə bilməz. Günah edən insan ən azı .bu günah müddətində Allahı yadından çıxarır

İmanın birinci amili olan mə`rifəti güclən-dirmək üçün, qeyd edildi ki, elmlə məşğul olub həqiqəti anlamaq lazımdır. Bildiklərimizi unutmamaq üçün



---

.Nəml” surəsi, ayə: ۱۴“ [۹۰] -۱

.Biharul-ənvar” ۶۸-ci cild“ [۹۱] -۲

təkrar etməyimiz çox zəruridir. Amma bütün bunlar həqiqətlərin qəlbən qəbulu və təslimçilik üçün müqəddimədir. Əsas çətinlik məhz imanın ikinci amili olan təslimçilik ruhiyyəsini yaratmaqdır. Çoxları Allahın varlığın bilir, amma öz bəndəlik vəzifələrinə əməl etmir. Bilirik ki, namaz vacibdir və Allahın əmridir. Amma namaz qılmağa rəğbət-sizik. Qulağımıza Qur`an sədaları dəysə də bu sədalardan sevinc duymuruq. Əgər televizorun bir kanalında Qur`an tilavəti, o birində kinofilm göstərilirsə ikinciyə üstünlük veririk. Allahı sevən insan necə olur ki belə bir seçim edir? Bəlkə, heç belə bir məhəbbət mövcud deyil? "Zumər" surəsinin ۴۵-ci ayəsində buyurulur: "Allah bir olaraq xatırlandığı zaman axirətə iman gətirməyənlərin qəlbləri sıxılar". Bu ayəni diqqətlə təhlil etmək çox mühümdür. Nə üçün bə`ziləri Allahın adından ləzzət almır, hətta bə`ziləri bu adı eşidərkən qəzəblənirlər? Diqqət edin, buyurulur ki, bu insanların axirətə inamı yoxdur. Yə`ni insan Allahı yox, təkcə axirəti də inkar edə bilir. Deməli, nəfsin cilovunu yığıb, onun istədiyi istiqamətdə çapmağağının qarşısı alınmalıdır. Nəfsi cilovlamaq elə də asan iş deyil və bundan ötürü bə`zi hazırlıqlara ehtiyac var. Bu işdə sadədən mürəkkəbə doğru hərəkət etmək lazımdır. Nəfsi addım-addım itaətə gətirmək lazımdır. Ona birdən-birə ağır tələblər irəli sürülərsə qısa müddətdən sonra öz üsyankar vəziyyətinə qayıdacaqdır. Nəfsi Allahla ünsiyyət, zikr və Qur`ana sövq etmək üçün çox incə bir proqram hazırlamaq lazımdır. Ümid edək ki, Allah-təalanın yardımı, Qur`an və Əhli-beytin göstərişləri vasitəsi ilə belə proqram hazırlayacaq, təkamül yolunda bir addım qabağa gedə biləcəyik. Özünütərbiyə günbə-gün Allaha yaxınlaşmaqdan ibarətdir. Bu məqsədə nail olmaq üçün imanın ikinci ünsürü haqqında .ətraflı danışacağıq

## :İYİRMİNCİ DƏRS

## İMANI GÜCLƏNDIRMƏK YOLLARI

### ÖTƏN MÖVZULARA BIR BAXIŞ

İnsan həyatının üç əsas mərhələsi var: Başlanğıc, məad və başlanğıcla məad arasındakı yol. İnsan bilməlidir ki, varlıq aləminin yeganə yaradıcısı var və bu aləm başlanğıcdan sonadək həmin yaradıcının iradəsinə tabedir. Bunu da anlamaq lazımdır ki, insanın

həyatı gördüyümüz dünya ilə məhdudlaşmır və ölümdən sonra yenidən dirilmə, qiyamət sorğusu, əbədi axirət var. Nəhayət, insan unutmamalıdır ki, başlanğıcdan məadadək davam edən dünya həyatı üçün Allah–təala din adlı bir proqram göndərmişdir. Qeyd olunmuş üç məsələ birinci məsələdən, yə`ni tövhiddən .qaynaqlanır. Demək, bütün maarifin kökü tövhiddir

Aydın oldu ki, insaniyyət yuxarıda qeyd olunmuş üç məsələyə diqqət və bunlardan nə dərəcədə qafil olması ilə müəyyən edilir. Bu üç məsələdən qəflətdə olan insan heyvani istəklər ardınca getməklə öz şəxsiyyətinə son qoyacaqdır.(۱) "Bəqərə" surəsinin ۱۷۱-ci ayəsində bu üç məsələ haqqında düşünməyənlər barəsində buyurulur: "Kafirləri çığır-bağırdan başqa bir şey eşitməyən heyvana bənzər. Onlar kar, lal və kordurlar. Ona ."görə də dərk etməzlər

Amma bə`zi insanlar bu üç məsələyə diqqət yetirərək müəyyən araşdırmalar aparır və tövhid, məad, nübüvvət haqqında mə`lumatlanırlar. Bu tanışlıqdan sonra iki hal mümkündür. İnsan tanış olduğu həqiqətləri ya qəbul, ya da inkar etməlidir. Birinci hal imana ikinci hal isə küfrə aparır. İkinci hal o demək deyil ki, insan bu həqiqətlərə inanmır. Sadəcə olaraq o, anlayır ki, bu həqiqətləri qəbul edərsə müəyyən nəfs istəklərindən əl çəkməlidir. Fir`on və onun ardıcılları əmin olduqları həqiqətləri inkar .etdilər və bu inkarın səbəbi həmin həqiqətlərə zidd olan ləzzətləri itirmək qorxusu idi

### İNSAN İNANDIĞINI İNKAR EDƏ BİLİR

Həzrət Peyğəmbər (s) zamanında bir qurp məsihi Peyğəmbərlə (s) mübahisə üçün Mədinəyə gəldi. Onların öz vətənlərində böyük alimləri olduğundan elə təsəvvür edirdilər ki, həmin alimlərin kölgəsində İslam peyğəmbərinə qalib gələcəklər. Həzrət (Peyğəmbər (s



---

.Ə`raf" surəsi, ayə: ۱۷۹" [۹۲]-۱

məsihiləri qəbul etdi və onlar Həzrətə (s) məğlub oldular. İslam Peyğəmbərinin məntiqi qarşısında susmağa məcbur olan bu insanlar İslamı qəbul etmədilər. "Ali-İmran" surəsinin ۶۱-ci ayəsində buyurulur: "(Ya Məhəmməd) Sənə elm gəldikdən sonra onun barəsində səninlə mübahisə edən şəxsə de ki, gəlin, oğlanlarımızı və oğlanlarınızı, xanımlarımızı və xanımlarınızı, özümüzü və özünüzü çağıraq, sonra mübahilə (qarğış) edək və Allahın yalançılara lə`nət etməsini istəyək". Ayənin göstərişi ilə Həzrət Peyğəmbər (s) məsihiləri mübahiləyə çağırdı. Məsihilər razılaşdı və mübahilə üçün gün tə`yin olundu. Tə`yin olunmuş vaxt Həzrət Peyğəmbər (s) Həzrət Əli (ə), Həzrət Fatimə (s), İmam Həsən (ə) və İmam Hüseyn (ə) ilə birlikdə və`d olunmuş yerə gəldilər. Bu beş mə`sumu kənardan seyr edən məsihi alimləri öz ardıcıllarına dedilər: "Əgər bu insanlarla mübahilə etsəniz yer üzündə bir nəfər də məsihi qalmayacaq!" Bu sözləri yalnız həqiqəti görən adam deyə bilər. Amma həqiqətlə üz-üzə dayanmış məsihilər İslam dinini qəbul etməkdən boyun qaçırdılar. Burada maraqlı bir məqam var. Həzrət Peyğəmbər (s) məsihilərə buyurur: "Mənim peyğəmbərliyim və İslam həqiqəti sizə aşkar olduğu halda boyun qaçırmağınızın səbəbini bilirsinizmi? Siz İslamdan ona görə boyun qaçırırsınız ki, məsihilikdə şərab içib donuz əti yeməyə vərdiş etmisiniz. Bilirsiniz ki, İslamı qəbul etsəniz bu vərdişlərdən əl çəkməli olacaqsınız. Amma şərab və donuz ətinə elə bağlanmısınız ki, hətta onları itirməmək üçün aşkar həqiqətdən boyun qaçırırsınız". (۱)Burada psixoloji bir nöqtəyə işarə olunmuşdur. Bə`zən insan həqiqəti ona görə qəbul etmir ki, bu həqiqət onun istəklərinə zidd olur. İnsan bu ləzzətlərdən ayrılmamaq üçün hətta bildiyi həqiqəti inkar edir. İnsanın bildiyi



---

۱- [۹۳] "Biharul-ənvar" ۳۵–ci cild.

həqiqəti də inkar etməsi küfrün ən pis şəklidir və bu hal “cuhud” adlanır. Belə bir küfrə (batanın cəzası əbədi əzabdır.(١

## QUR`AN Və İMANI GÜCLƏNDİRMƏ AMİLLƏRİ

İnsanın həqiqəti tanıdıqdan sonra ona əməl etməməsi, hətta ilahi göstərişlərə qarşı çıxması onun üçün bir bəladır. Bu imanın zəifliyindən irəli gəlir. Belə insanlar doğru iş görmədiyini anlayır. İnsan ilahi hökmlərin doğruluğunu bilsə də imanı zəif olduğundan öz bildiyinə əməl etmir. Elə bir iman dərəcəsi var ki, bu dərəcəyə çatmış insan günah etmir. Mə`sumların və övliyaların günahdan uzaqlığı-nın səbəbi məhz güclü imandır. Bəs necə edək ki, imanımızı gücləndirməklə ilahi əmrlərə tabe olaq? Bu suala cavab vermək üçün əvvəlcə Qur`an ayələrinə müraciət edəcək, sonra isə əqli araşdırmalar .aparacağıq

## BİRİNCİ HAL

Ali-İmran” surəsinin ١٧٣-cü ayəsində buyuru-lur: “Onlara deyəndə ki, sizə qarşı cəm“ olublar, onlardan qorxun, bu söz onların imanını artırdı və dedi: Allah sizə yetər, O necə də gözəl vəkildir”. “Əhzab” surəsinin ٢٢-ci ayəsində oxuyuruq: “Mö`minlər müşriklərin ordu birləşmələrini gördükdə dedilər: Bu, Allahın və Onun rəsulunun verdiyi və`ddir, Allah və Onun rəsulu düz demişlər. Bu, təkcə onların imanlarını və itaətlərini artır-dı”. Bu ayə Əhzab döyüşü barəsində nazil olub. İslamın zühurundan sonra düşmənlər bu dini məhv etmək üçün bütün vasitələrdən istifadə edirdilər. Onların ən böyük fitnələrindən biri Əhzab döyüşünə rəvac verməleri oldu. Bu döyüşdə müşriklər, bütpərəstlər, yəhudilər, məsihilər, münafiqlər, bir sözlə bütün müxalif qüvvələr



---

.Nəml” surəsi, ayə: ١۴“[٩۴]-١

İslama qarşı bir araya gəlmişdilər. Onlar güclü hərbi hazırlıqdan əlavə, müsəlmanlara psixi tə’sir göstərməkdən ötrü müəyyən planlar da hazırlamışdılar. Onlar müsəlmanlarda ruh düşgünlüyü yaratmaq üçün şayiə yaymışdılar ki, bu dəfə düşmən qoşunu olduqca güclüdür və müsəlmanlar heç şübhəsiz məğlub olacaq. Bu üsuldan bu günkü dünyamızda daha ustalıqla və elmi şəkildə istifadə olunur. Hətta bu sahədə doktorluq adı alanlar da var. Nə isə ... Düşmənlərin şayiəsi ağızdan-ağıza dolandı, hay düşdü ki, tezliklə peyğəmbər öldürüləcək və İslam məhv olacaq. Bu şayiə zəif imanlı insanları asanlıqla süstləşdirdi. Amma elə mö`minlər də var idi ki, dağ tək əzəmətli dayanmışdılar. Hamı onlara düşmənin üstünlüyündən danışsa da, onlar həvəsdən düşmür, əksinə, daha da imanlı olurdular. Bu döyüşün nəticəsi haqqında “Ali–İmran” surəsinin ۱۷۴-cü ayəsində belə buyurulur: “Sonra da Allahın ne`mətləri və lütfü sayəsində özlərinə heç bir əziyyət toxunmadan döyüş meydanından geri qayıtdılar və Allahın razılığını qazanmış oldular. Allah, həqiqətən, böyük mərhəmət sahibidir.”

Bu cür fitnələrlə yaşadığımız dövrdə də tez-tez rastlaşırıq. İlahi dəyərlər uğrunda mübarizəyə qalxmış millətləri düşmənin gücü ilə qorxudurlar. Təbliğat maşınları gecə-gündüz işləyir, azadlıqsevərləri həvəsdən salacaq şayiələr uydururlar. Bu psixoloji mübarizədə Allahı qüdrətli tanıyıb Ona sığınanlar qalib çıxırlar.

Hər halda, Qur`ani-kərim Əhzab səhnələrini təsvir etməklə mö`minləri imana çağırır. Ayələr düşmənlə üz-üzə dayanmış və psixoloji hücum-lara mə`ruz qalmış müsəlmanlara ruh yüksəkliyi verir. Sözsüz ki, belə bir ruh yüksəkliyinə yalnız möhkəm iman sayəsində çatmaq olar.

Fəth” surəsinin ۴-cü ayəsini xatırlayaq: “Mö`minlərin imanlarının üstünə iman“ artırmaq üçün onların qəlblərinə arxayınlıq nazil edən Odur”. Bu ayəyə əsasən Allah-təala doğru imana malik olanların qəlblərinə aramlıq verməklə onların imanını daha da artırır. Artırılmış iman “səkinə” adlanır. Sevimli rəhbər öz sözlərinin birində səkinə məqamı haqqında maraqlı açıqlamalar vermişdir. “Səkinə” sözünün lüğəti mə`nası “sakitlik” deməkdir. Qur`ani-kərimdə buyurulur ki, Allah-təala bu halı bə`zi həqiqi bəndələrinə əta edir. Allah-təala torpağa yağış nazil etdiyi kimi mö`minlərin də qəlbinə böyük mə`nəvi ne`mət olan bu sakitliyi nazil edər. Bu ne`mətin necə nazil olması və onun mahiyyəti hamı tərəfindən dərk oluna bilməz. Allah-təala və`d verib ki, Ona tərəf bir addım atana O özü on addım yaxınlaşacaq. “Muhəmməd” surəsinin ۱۷-ci ayəsində buyurulur: “Allah hidayətə olunanların hidayətini artırar və onlara təqva əta edər”. Deyilənlər azğınlıq yolunu seçənlərə də aiddir. “Tövbə” surəsinin ۱۲۵-ci ayəsində oxuyuruq: “Qəlbində xəstəlik olanlara gəldikdə isə (hər bir surə) onların alçaqlığının üstünə alçaqlıq gətirər”. Bəli, elə insanlar var ki, Qur`an onları nəinki hidayət etmir, hətta azğınlıqlarını artırır. Allah-təala zəlalət yolunu seçənlərin süqutunu labüd etmişdir. “Səff” surəsinin ۵-ci ayəsində buyurulur: “Haqqdan döndükləri üzündən Allah da onların qəlblərini döndərdi. Allah itaətsiz qövmü hidayət etməz”. Unutmayaq ki, Allahın lütfündən kənarda qalmış insanı kimsə doğru yola yönəldə bilməz: “Allahın azdırdığı-na hidayət yoxdur.”(۱) Əlbəttə ki, bu məhrumiyyətin səbəbkarı yalnız insanın -özüdür. “İsra” surəsinin ۱۸-۱۹



---

.Zumər” surəsi, ayə: ۲۳“ [۹۵] -۱

cu ayələrində oxuyuruq: “Hər kəs fani dünyanı istəsə, orada olan istənilən ne’məti dilədiyimiz şəxsə verərik, sonra da onu cəhənnəmə göndərərik... Hər kəs mö`min olub axirəti istəsə onun üçün və sə`y göstərsə, bilsin ki, öz zəhmətinin əvəzinə alacaqdır.” Demək, Allah-təala hər iki dəstənin istəyinə yardım göstərir. Behişt istəyən behiştə, .cəhənnəm istəyən isə cəhənnəmə qovuşdurulur

Deyildi ki, Allah “səkinə” halını nazil etməklə bə`zi mö`minlərin qəlbində imanı gücləndirir. Əlbəttə ki, bu təsadüfi deyil və mö`minlərdən asılı olan bir işdir. “Səkinə” halına o insanlar layiq görülür ki, öz imanlarında sədaqət-lidirlər. Bu insanlar iman gətirdikdən sonra bütün varlıqları ilə dinə xidmət edirlər. Onların bu sədaqətinin əvəzi bütün insanların düçar olduğu iztirab və nigarançılıqdan amanda qalmalarıdır. Onlar zərrə qədər də olsun qorxu və tərəddüd duymadan Allah yolunda canlarında keçir. .Allahın yardımı olmadan belə bir ruhiyyə əldə etmək qeyri–mümkündür

## ÜÇÜNCÜ HAL

Ənfal” surəsinin ٢-ci ayəsində oxuyuruq: “Mö`minlər yalnız o şəxslərdir ki, Allahı“ xatırladıqları zaman ürəkləri titrəyər, Allahın ayələri oxunduqda imanları artar və öz Rəbblərinə təvəkkül edərlər”. Allahı yad edərkən qəlb nə üçün titrəməlidir? Məgər Allah qorxuludurmu? Xeyr, Allah qorxulu deyil. İnsan Allahdan yox öz günahlarından qorxur. Günahkar insan Allahı xatırlayarkən öz itaətsizliklərini yadına salıb həyəcan keçirir. Böyük imana malik şəxslər isə Allahın adı çəkilərkən Onun əzəmətindən riqqətə gəlirlər. İnsan böyük bir şəxsiyyətin qarşısında dayanarkən özünü itirir, dili topuq vurur. Bu həyacanı doğuran həmin şəxsin əzəmətidir. Yə`ni həmin şəxs tərəfindən heç bir qorxu

olmasa da Onun əzəməti qarşısında sakit dayanmaq olmur. Əgər insan insanın qabağında bu cür həyəcanlanırsa, Allahın qarşı-sında necə sakit dayana bilər? Əgər bu .həyacanı duymuruqsa, demək, imanımız zəifdir

Qur`ani-kərimdə həqiqi iman və həqiqi mö`minin bir çox xüsusiyyətləri sadalanır. Bu xüsusiyyətlərdən biri odur ki, Allahın ayələrini eşidərkən onların imanı artır. Mö`minlərin digər bir xüsusiyyəti Allaha təvəkkül etmələri-dir. Bütün bunlardan mə`lum olur ki, imanı gücləndirən amillərdən biri Qur`an ayələrini dinləməkdir. .Əlbəttə ki, bu ayələr həqiqət qarşısında təslim olmuş insanlara müsbət tə`sir göstərir

### İMANI GÜCLƏNDİRMƏ AMİLLƏRİNİN ƏLAQƏSİ

Əvvəlki mövzuda sadalanmış halların bir–biri ilə əlaqəsi varmı? Düşmənlərin hücumları qarşısında yaranan böhran, “səkinə” halı və Qur`anı dinləmək arasında hansı bağlılıq var? Bu suallara cavab tapmaq üçün iman məfhumunu anlamaq lazım gəlir. İmanın nə .olduğunu bilsək, onu gücləndirmə yollarını da tapa bilərik

Anladığı həqiqətə əməl etmək insanın fitri xüsusiyyətidir. İnsan zülmətə düşdükdə işıq axtarır, soyuq havada isti geyinir, istidə sərinləşdirici vasitələrdən istifadə edir. Ona görə də insanın öz dərk edib başa düşdüyü həqiqətə əməl etməsi təəccüblü deyil. Təəccüblü odur ki, insan bildiyinə əməl etməsin. Təəccüblü odur ki, insan Allahın varlığını bildiyi halda həya edib günahdan çəkinməsin. İnsan bilir ki, onun ibadət və itaətinə Allahın heç bir ehtiyacı yoxdur. Bütün ilahi göstərişlərin məhz özü üçün xeyirli olduğunu bilən insan yenə də itaətsizlik göstərir. Hamı gözəl anlayır ki, Allah yalnız .insan üçün zərərli işləri qadağan edir. Amma yenə də zərərə gedirik

Bütün bu müşküllərin həlli üçün yeganə yol insanın öz imanına qarşı diqqətli olmasıdır. İmana göstərilən diqqət onun tə`sirini daha da gücləndirir. Deyilənlərə aydınlıq :gətirmək üçün bir neçə misal çəkək

Xəstə insanın ağrıları, adətən, gecələr şiddətlənir. Əslində isə gündüzlər diqqəti müxtəlif işlərə cəlb olunan insan həmin ağrıları müəyyən qədər unudur. Demək, dəyişən ağrı yox, ağrıya yetirilən diqqətdir. Gecələr insanın diqqəti ətraf mühitdən .kəsildiyindən bütün diqqət ağrılara yönəlir və o, bu ağrıları daha çox hiss edir

İnsanın sevinci də belədir. Diqqəti müxtəlif işlərə cəlb olunmuş insan sevinci də o qədər dərindən hiss etmir. İnsan bir ne`mətə nə qədər diqqət yetirərsə, bu ne`mətdən bir o qədər də sevinc duyar. Qorxu da belədir. İnsan qorxduğu şey .haqqında nə qədər çox düşünərsə, bir o qədər də çox qorxar

Demək, insan Allah, onun sifətləri, elmi, hikməti, qüdrəti, mərhəməti haqqında nə qədər çox düşünərsə, imanı da bir o qədər güclənər. İnsanın diqqətini bu həqiqətlərə cəlb edən bütün şeylər imanı gücləndirir. Qur`an ayələri Allahın kəlamıdır. Ona görə də bu ayələri eşidən insan Allahı yada salır, Onun haqqında düşünür, nəticədə imanı artır.(١) Sözə diqqət söz sahibinə diqqətdir. Allahın kəlamına diqqət Allaha diqqətdir. Əlbəttə, bu o zaman baş verir ki, insan özü üçün uyğun şəraiti yaratsın. İtaətsizliyə vərdiş vermiş insana Qur`an kəlamının heç bir tə`siri yoxdur.(٢) Kar insanla üzbəüz danışsan da səni eşitməz. Ona yalnız işarə ilə nə isə başa salmaq olar. Amma bu kar şəxs arxasını sənə çevirsə, nə qədər qışqırsan, atılıb–düşsən faydası yoxdur. Bəli, Qur`an ayələrinə arxa çevirib, onu eşitmək istəməyənlər də var. Belə insanlara ayələrin heç



---

.Ənfal" surəsi, ayə: ٢" [٩۶] -١

.Nəml" surəsi, ayə: ٨٠" [٩٧] -٢

bir tə`siri yoxdur. Bəlkə də, bu ayələr həmin insanların əzabını ağırlaşdırır. “İsra” surəsinin ٨٢-ci ayəsində buyurulur: “Biz Qur`anda mö`minlər üçün şəfa və mərhəmət olan ayələr nazil edirik. O, zülmkarların isə yalnız ziyanını artırır”. “Fatir” surəsinin ۴٢-ci ayəsində oxuyuruq: “Var gücləri ilə Allaha and içdilər ki, əgər onlara bir xəbərdarlıq edən gəlsə, ümmətlərin içində ən doğru yolda olanlardan olacaqlar. Onlara xəbərdarlıq edən gəldikdə isə bu, onların ancaq nifrətlərini artırdı”. Onlar Qur`an ayələrini eşidərkən böyük bir xətərdən qaçırmış kimi qaçırlar. Onlar ayələri eşidərkən bu ayələrə istehza edirlər. “Muddəssir” surəsinin ٣١-ci ayəsində buyurulur: “Biz cəhənnəm gözətçilərini təkcə mələklərdən qərar vermişik. Onların sayını yalnız kafirlərin imtahana çəkilməsi üçün qərar verdik ki, özlərinə kitab verilənlər yəqin etsinlər, iman gətirənlərin imanı daha da çoxalsın, kitab verilənlər və mö`minlər şəkk-şübhəyə düşməsinlər, qəlblərində xəstəlik olan kafirlər desinlər ki, Allah bu məsəl ilə nə demək istəmişdir?” Gözətçi mələklərin sayının on doqquz nəfər olduğu bildirilir. Əvvəlki ilahi kitablarda da cəhənnəm mələkləri-nin sayı on doqquz nəfər göstərilmişdir. Həmin kitablardan xəbərdar olanlar Qur`anı oxuyarkən mələklərin sayından anlayırlar ki, Qur`an da Allah tərəfindən göndərilmiş kitablardandır. Nəticədə, Qur`an və peyğəmbərə iman artır. Amma bu söhbəti eşidən kafirlər və !?müşriklər istehza edərək deyirlər ki, onların sayını iyirmi etmək olmazdımı

Deməк, iman artırmaqdan ötrü qeyd olunan səbəblər hər bir insanın Allaha olan diqqətini artırır. Diqqət artdıqda isə insan Allahı daha çox dərk edir və Ona olan imanı artır. Bir daha qeyd edək ki, bu amillər yalnız Allah qarşısında təslim olanlar üçün tə`sirlidir. Unutmayaq ki, Allah ona tərəf bir addım atanlara on səh:١۵٣

(addım yaxınlaşmaqla cavab verir. “Xeyir iş görənə on qat artıq əvəz veriləcək.”(١

Ümid edirik ki, imanın şərtlərinə əməl etməklə günbəgün Allaha daha çox !yaxınlaşacağıq. Əlbəttə ki, Allahın yardımı ilə

## :İYİRMİ BİRİNCİ DƏRS

## İMAN VƏ ƏMƏLIN RABITƏSI

### ÖTƏN MÖVZULARA BİR BAXIŞ

Ayə və hədislərdən mə`lum oldu ki, insan üçün yeganə səadət yolu Allaha, itaət iman və saleh əməldir. İmanın mərtəbələri var və o, dəyişgəndir. İmanın güclü və ya zəif olması əməldə üzə çıxır. Dini vəzifələrinə əməl edib, saleh işlər görənlərin imanı da güclüdür. Güclü imana malik insanlar günahdan çəkinir, hətta şübhəli işlərə də yol .vermirlər

Demək, insanı təkamülə aparan, onu həqiqi insan edən, onun insanlıq mərtəbəsini .ucaldan yalnız imandır



---

.Ən`am” surəsi, ayə: ١۶٠“ [٩٨] -١

İman nə qədər kamil olarsa kamillik də bir o qədər yuxarı olar. İnsanı süquta yetirən isə küfrdür. Küfrün də mərtəbələri var. O da əməldə zahir olur. Bə`zi insanlar cəhənnəmin dərin qatlarına quyusuna salınacaq qədər küfrə batırlar.(١) İnsan imanla küfrün arasında da ola bilər. O, dayandığı nöqtədən bir addım irəli atarsa mö`min, bir addım geri atarsa kafir olar. Peyğəmbər və övliyaların işi özləri ilə yanaşı başqalarını da iman yolunda irəli aparmaqdır. Peyğəmbər yolunu seçənlər öz imanlarını artır-maqla insani kamilliklərini artırmaq fikrində olanlardırlar. Bu kamilliyə Allaha .yaxınlaşmaq-la nail olmaq mümkündür

Bəs imanı necə gücləndirmək olar? İmanın aşağı mərtəbəsində dayanmaq ona görə qorxuludur ki, insan bu nöqtədən çox asanlıqla küfr mərtəbəsinə enə bilər. Çünki imanın aşağı mərtəbəsi küfr sərhəddinin lap yaxınlığında-dır. İmanın yuxarı mərtəbəsi isə belə deyil. Bütün dünya yuxarı mərtəbədə durmuş insana hücum etsə, onun məqamını iynə ucu qədər dəyişə bilməz. Həzrət Əli (ə) imanın ən ali mərtəbəsi haqqında belə buyurur: “Əgər bütün pərdələr qaldırılsa, mənim yəqinliyim zərrə qədər də artırmaz”.(٢) Əlbəttə, belə bir ali mərtəbəyə az adamlar ucala bilir. Əgər peyğəmbər göstərən yolla getsək, bu yol bizi həmin zirvəyə aparar. Amma o zirvəyə nə qədər .yaxınlaşmaq öz iradəmizdən asılıdır

## İMANI GÜCLƏNDİRMƏNİN İKİ AMİLİ

Bəs iman zirvəsinə yaxınlaşmaq üçün nə etməliyik? Qeyd etdik ki, iman iki amildən yaranır. Elm və istək. Yə`ni Allahı tanıyıb, Onun göstərişlərinə əməl edən insan iman qazanır. Deməkb imanı gücləndirmək üçün bu iki amili gücləndirmək lazımdır. İnsan çalışmalıdır



---

.Nisa” surəsi, ayə: ١۴۵“ [٩٩] -١

.Biharul-ənvar” ۶٩-cu cild“ [١٠٠] -٢

ki, öz elmini artırmaqla Allahı, Onun sifət və fe`llərini daha dərindən tanısın. Əlbəttə ki, peyğəmbər və mə`sum imamları tanımaq da Allahı tanımanın davamıdır. İnsan bir övliyadan kəramət gördükdə onun qəlbi işıqlanır. İmanın nümunəsi ilə qarşılaşan .insanın da imanı artır, saleh işlərə meyli çoxalır

İmanı gücləndirmənin ikinci amili istəyin gücləndirilməsidir. İradə təkcə elm və mə`rifət yolu ilə yaranmır. İradə qazanmaq üçün ərəblərin "riyazət" adlandırdıqları təkrara ehtiyac var. İnsan öz mə`nəvi yönümünü gücləndirmək üçün bir sıra təkrarları yerinə yetirməlidir. Vacib namazın beş vaxt tə`yin olunmasının fəlsəfəsi də budur. Gün uzunu ibadətin təkrar olunması insanın iradəsini gücləndirir. İldə bir ay oruc tutmağın vacib olması müəyyən səbəblərlə bağlıdır. Məsələn, oruc insanın iradəsini gücləndirir. Bütün ibadətlərdəki təkrarlar mə`nəvi hərəkət iradəsini gücləndirmək üçündür. İnsanın daxilində baş verən tədrici dəyişiklik mə`nəvi hərəkət hesab olunur. Allaha yaxınlaşmaq qərarına gəlmiş insanın ruhu hərəkətə gəlir. "Mən, həqiqətən, hənif (müvəhhid) olaraq üzümü göyləri və yeri yaradan kəsə tutmuşam".(١) Bəli, insan öz .mə`nəvi dünyasını hərəkətə gətirmək qərarına gələ bilər

Peyğəmbərlərin gəlişində məqsəd insanlara insanlıq yolunu göstərməkdir. Təkamül yolunu keçmək üçün üzümüzü Allaha tutmalıyıq. Peyğəmbərlər belə nəsihət edir: "Tam inamla dinə tərəf üz tut. Həmin fitrət ki, Allah insanları bu fitrət əsasında yaratmışdır".(٢) Üzünü Allaha tutan insan qədəm-qədəm Ona yaxınlaşır. Həzrət İbrahim (ə) məhz belə hərəkət etdi: "Mən ixlas və pak qəlblə üzümü o kəsə tutmuşam ki, göyləri və



---

.Ən`am" surəsi, ayə: ٧٩" [١٠١] -١

.Rum" surəsi, ayə: ٣٠" [١٠٢] -٢

yeri yaratmışdır”.(١) Həzrət Məhəmmədə (s) göstəriş verilir: “(De ki) həqiqətən, mənim namazım, ibadətim, həyatım və ölümüm aləmlərin Rəbbi Allah üçündür”.(٢) Üzü Allaha dayanmış insanın təkcə ibadəti yox, bütün hərəkətləri Allah üçündür. Əlbəttə ki, söhbət gördüyümüz üz yox, mə`nəviyyat üzündən gedir. Belə insanın bütün həyatı .təkamüldən ibarətdir

Amma Allah-təala insanı azad yaratmışdır. Uzun müddət Allaha doğru gedən etmiş insan bir anda öz istək və iradəsinə əsasən öz istiqamətini dəyişə bilər. Bəli, Allaha üz tutmuş insan Ondan çevrilib, şeytana da üz tuta bilər. Təkamül yolundan süquta uğramaq bir anlıq işdir. Buna görə də insan varlıq aləmindəki mövqeyini tanımalı, qarşısında bir-birinə zidd iki yolun mövcudluğunu unutmamalıdır. Belə olsa, insan .süquta uğramamaq üçün ehtiyatlı olar

İmam Sadiq (ə) bir rəvayətdə təqva haqqında belə buyurur: “Çör-çöp, tikan, ilan və əqrəblə dolu bir biyaban təsəvvür et. Əgər qaranlıq bir gecədə bu biyabandan keçəsi olsan necə yeriyərsən? Aydındır ki, çox ehtiyatlı addım atarsan ki, ilan və əqrəbə, tikana ilişməyəsən. Təqva budur!” Bəli təqva odur ki, ilan və əqrəblə dolu dünya .həyatında bütün diqqətini toplayıb xətərlərdən sovuşasan

Demək təkamül yolunda hərəkət etmək üçün hər şeydən əvvəl istiqaməti müəyyənləşdirmək lazımdır. Bu seçimdə azad olan insan ya xeyir, ya da şər yolunu seçməlidir. Yə`ni insanın qarşısında yalnız iki yol var: Allah yolu və şeytan yolu. Bir yol behiştə və nura, digər yol cəhənnəm və qaranlığa aparır. “Muzzəmmil” surəsinin ١٩-cu .”ayəsində oxuyuruq: “Hər kəs istəsə Allahına doğru yol seçsin



---

.Ən`am” surəsi, ayə: ٧٩“ [١٠٣]-١

.Ən`am” surəsi, ayə: ١٦٢“ [١٠۴]-٢

Necə olur ki, saleh əməllər imanı gücləndirir? Sədəqə vermək, namaz qılmaq, məzluma arxa durmaqla iman necə artır? Saleh əməl adlandırı-lan bütün işlərin əsas dəyəri xüsusi ruha malik olmasıdır. Saleh əməl zamanı diqqət Allaha yönəlir demək .saleh əməlin ruhu Allaha diqqətdir və bu diqqət səbəbindən iman güclənir

Maddi dünyada yaşadığımızdan mə`nəvi məsələlər haqqında danışarkən maddi məfhum-lardan istifadə etməli oluruq. Məsələn, "əliyy" sözünün anlaşılması üçün "böyük" kələməsindən istifadə edirik. Hansı ki, "əliyy" maddi yox, mə`nəvi böyüklükdür. Allah haqqında "əliyy" desək də, təsəvvürümüzdə maddi böyüklük canlanır. Təkamül yolu haqqında danışarkən də mə`nəvi hərəkətləri maddi ölçülərlə təsvir etmək məcburiyyətində qalırıq. "Bəqərə" surəsinin ٢٥٧-ci ayəsində oxuyuruq: "Allah mö`minlərin vəlisidir. Onları qaranlıqdan işığa çıxa-rır. Kafirlərin dostu isə tağutdur və onları işıqdan qaranlığa sürükləyir". Allah-təala insanlara nurdan olan bir aləm təsvir edir. Bə`zi insanlar zülmət dünyadan həmin nur aləminə yol tapar, bə`ziləri isə nur aləmindən zülmət aləminə düşərlər. Zülmət dünyasından nur dünyasına qədəm qoyan insan qaranlıq gecədə işıq görən insan kimidir. O, bu işığı gördükdə ümidi artır və həmin işığa doğru hərəkətə başlayır. İnsan bu işığa .yaxınlaşdıqca o böyüyür. Nəhayət insan işığın mənbəyinə çatır

İşığın hərəkətinə nəzər salsaq görərik ki, işıq öz mənbəyindən uzaqlaşdıqca kiçilib nöqtəyə çevrilir. Nur dünyasına qədəm qoyan insan əvvəlcə bu nöqtəni görür. Nöqtəyə yaxınlaşdıqca o, böyüyür və güclənir. Fəzanın geniş bir hissəsini işıqlandıran günəşi təsəvvür edin. Yerlə günəş arasındakı məsafə ١٤٤ milyon km-dir. Günəş on qat artıq məsafəni işıqlandırsa da, hansısa bir nöqtədə bu işıq tükənir. İndi işığı bitib-tükənməyən bir

işıq mənbəyi təsəvvür edin. Qur`ani-kərimdə Allah-təala belə sonsuz nur mənbəyi kimi tanıtdırılır: “Allah göylərin və yerin nurudur”.(١) Biz Allahın müqəddəs zatından şüalanan nura doğru hərəkət edərək kamala çatmalıyıq. Arxamızda isə zülmət dəryası dayanıb. Bu dəryaya düşmüş kafirlər nə qədər çırpınsalar da zülmətdən qurtula bilmirlər. Zülmət dalğaları onları qoynuna alıb daha da dərinliyə aparır. “Nur” surəsinin ۴٠-cı ayəsində oxuyuruq: “(Kafirlərin əməlləri) Dalğalı dəryanın qaranlıqlarına bənzər ki, bir dalğa onu bürüdükdə üsütündən bir dalğa da gələr, onun üsütündə də bir bulud durar. Bu qaranlıqların bə`zisi bə`zisinin üstündədir. Əlini bayıra çıxaran onu görməz. Allahın işıq vermədiyi kəsə işıq yoxdur”. Amma Allahın zülmətdən nura çıxardığı mö`min bu nurda irəli gedə bilər. Bu nur sonsuzdur və mö`min üçün dayanacaq yoxdur. İnsan heç zaman bu nurun mənbəsinə çata bilmir. Amma bilməliyik ki, bu nur dünyada hiss etdiyimiz nur deyil. Təkamül yolunun başlanğıcındakı nur nöqtəsi imanın ilk mərtəbəyinə, nur mənbəsi isə Allah-təalaya işarədir. Allah bu yolda insana yardımçıdır. İnsan qəlbinə imanın ilk mərtəbəsi daxil olanda artıq o, hidayət olunur: “Hər kəs Allaha iman gətirsə, Allah onun qəlbini hidayət edər”.(٢) Bəli, Allah ölü qəlbi iman nuru ilə dirildir. Kafir isə ətrafına zülmətdən çəpər çəkdiyindən belə bir diqqətdən məhrum olur. “Ən`am” surəsinin ١٢٢-ci ayəsində oxuyuruq: “Ölü ikən diriltdiyimiz və insanlar arasında gəzə bil-məsi üçün işıq verdiyimiz şəxs qaranlıqda qalıb oradan çıxa bilməyən şəxslə birdirmi?”

Nur aləmi ilə zülmət aləmi qarşı-qarşıyadır. Nəfs istəkləri və şeytana tabe olan insan nurdan uzaqlaşıb



---

١- [١٠۵] “Nur” surəsi, ayə: ٣۵.

٢- [١٠۶] “Təğabun” surəsi, ayə: ١١.

zülmətə qərq olur. Zülmətdən çıxmaq üçün insana iman gərəkdir.(١) Allah o insanların hidayətini öhdəyə alır ki, onlar iman gətirsinlər. Küfr isə insanı zülmətə qərq edib .Allahdan uzaqlaşdırır

Nur aləmində irəli getmək üçün saleh əməl lazımdır. Saleh əməl iman ruhu üfürülmüş əməldir və o, imandan doğur. Bu ruh gücləndikcə saleh əməl də güclənir və insanın nuru artır. "Fatir" surəsinin ١٠-cu ayəsində oxuyuruq: "Pak söz ona doğru yüksələr, saleh əməl isə onu (insanı) ucaldar". Mərhum Əllamə Təbatəbai bu ayənin təfsirində buyurur: "Bu ayə əməlin imana tə`sirini aydınlaşdırır və mə`lum olur ki, saleh əməl imanı gücləndirir..." İnsanı Allaha tərəf ucaldan və onu təkamülə sövq edən əslində insanı hərəkətə gətirən iradədir. Ayədə zikr olunan pak söz ("kəlmeyi təyyibə") "la ilahə illəllah", yə`ni tövhid kəlmələridir. Tövhidə iman insanı Allaha yaxınlaşdırır. Nə üçün saleh əməl imanı gücləndirir? Çünki saleh əməlin cövhəri iman-dandır. Bu cövhər Allaha diqqətdən ibarətdir. Əlbəttə ki, bu diqqətin dərəcələri var. Diqqətin yuxarı dərəcəsində insan Allahdan başqa heç nəyə diqqət yetirmir. Mə`sum imamların (ə) namazla-rında belə bir diqqət vardı. Onlar namaz zamanı yalnız Allahı düşünərdilər. Belə saleh əməl insanı bir anda çox yüksəklərə qaldıra bilər. Namaz ən xeyirli əməldir. .Bəli, əgər iki rək`ət həqiqi namaz qıla bilsək, ilahi ucalıqları seyr edə bilərik



---

١-[١٠٧] "Bəqərə" surəsi, ayə: ١۵٧.

Saleh əməl imanı gücləndirdiyi kimi, günah da öz növbəsində imanı puça çıxarır. İnsan üzünü Allahdan döndərən kimi doğru yoldan çıxır. Hər bir günah insanı imandan bir addım uzaqlaşdırıb küfrə yaxınlaşdırır. Adət şəklini almış günah insanı cəhənnəmə sürükləyir. İnsanı belə bir zəlalətdən yalnız həqiqi tövbə xilas edə bilər. İnsan birdən–birə kafir olmur. Onun tədricən batdığı günahlar küfr üçün şərait yaradır. Tövbə surəsinin ٧٧–ci ayəsində oxuyuruq: "Allaha verdikləri və`dəyə xilaf çıxdıqlarına və yalan danışdıqları–na görə Allah da onların qəlbinə Ona qovuşacaqları günə qədər nifaq saldı". Digər bir ayədə buyurulur: "Sonra da Allahın ayələrini yalan hesab edib onları məsxərəyə qoymaqla pislik edənlərin aqibəti daha da pis oldu".(١) Bəli, günahın nəticəsi küfürdür. Günah üstündən günaha yol verən insan nəinki Allahdan üz döndərir, hətta ona qarşı qiyam qaldırır. Süquta uğramaq astanasında olan insan üçün iki rək`ət namaz qılmaq dağ tək ağır gəlir. Saatlarla mə`nasız söhbətlərə, kinofilmlərə həvəslə vaxt sərf edən insan namaz üçün iki dəqiqə vaxt ayıra bilmir. "Bəqərə" surəsinin ۴۵–ci ayəsində oxuyu–ruq: "Doğrudan da bu iş (namaz) Allaha itaət edənlərdən başqa hamıya ağır gələr". Bu hal insanın yol verdiyi günahlardan yaranır. Bir çox mö`minlər məhz günah səbəbindən imanını əldən verir. Zahirən imanlı görünən bir çox günahkarlar Allaha üz tutmağa güc tapmırlar. Bəli, elə insanlar var ki, gündə min dəfə ətrafındakılara boyun əydiyi halda bir dəfə Allaha boyun əyməyi özünə sığışdırmır. Bütün bu hallar günahdan doğur. Elə bilməyək ki, insan üçün ən alçaq mərtəbə Allah adını eşidərkən qəzəblənməkdir. Bundan da alçaq mərtəbə var. ,Bə`zi insanlar o qədər alçalır ki



---

.Rum" surəsi, ayə: ١٠" [١٠٨]–١

hətta Allahı “simvolik bir məfhum” hesab etməkdən belə çəkinmir. Allahı inkar etdiyi halda Qur`anın gözəlliyindən dəm vuranlar da var. Bu ziddiyyətli fikirləri doğuran həmin insanların yol verdikləri günahlardır. İnsan günaha batdıqca onun qəlbini qaranlıq bürüyür, nəhayət elə bir an çatır ki, qəlbdə iman nurundan zərrə qədər də olsun nişanə qalmır. Belə zülmətə düşmüş insa-nın həqiqəti görməsi qeyri-insani-.mümkündür

.Pərvərdigara, qəlbimizi iman nuru ilə işıqlandır və bizə günah qaranlığından nicat ver

**:İYİRMİ İKİNCİ DƏRS**

**GÜNAH INSANI SÜQUTA APARIR**

KAFİRİN ƏMƏLİ FAYDASIZDIR

Əvvəlki söhbətlərdə qeyd etdik ki, insan səadətinin əsas amili Allaha imandır. Yalnız iman yolu ilə Allahın

geniş mərhəməti və əbədi ne`mətlərə çatmaq olar. Küfr isə insanı əbədi bədbəxtçiliyə aparır. İmanın mərtəbələri çoxdur və hər bir mərtəbəyə çatmaq üçün saleh əməllərə ehtiyac var. İnsanın təkamülü onun öz iman dərəcəsini artırmaqdan ibarətdir. İman və saleh əməl arasında olan münasibət küfr və günah arasında da mövcuddur. Saleh əməl insanı imana, günah isə küfrə yaxınlaşdırır. Bə`zən imanlı insan günahlarının səbəbindən o qədər alçalır ki, küfrün bir addımlığında dayanır. Bu məqam imanla .küfrün sərhəddidir

Mə`lum oldu ki, iman olmayan yerdə saleh əməlin faydası yoxdur. Küfr tufanı bütün əməlləri göyə sovurur. "İbrahim" surəsinin ١٨-ci ayəsində buyurulur: "Rəbblərini inkar edənlərin əməl-ləri fırtınalı bir gündə tünd yelin sovurub apardığı külə bənzər və onlar etdikləri əməldən heç bir fayda qazana bilməzlər". İman-dan məhrum insanlar xalqın nəzərində gözəl olan xeyir işlər görsələr də bu işlərdən faydalana bilməzlər. Belə əməllərə görə dünya həyatında müəyyən faydalara sahib olsalar da əbədi axirət ne`mətlərindən məhrum olarlar. Ayədə bu əməllər külə oxşadılır. Əgər küldən bir dağ düzəlsə, güclü tufan bu dağı bir anda göyə sovurar. Kafirlərin xeyir əməlləri qiyamət tufanında kül tək göyə sovurular. "Nur" surəsinin ٣٩-cu ayəsində buyurulur: "Kafirlərin əməlləri düzənlikdə ilğıma bənzər. Onu su hesab edən susuz gəlib çatdığı zaman orada bir şey tapa bilməz". Xeyir əməllərinə və xalqın tə`riflərinə uyan kafirlər qiyamət səhnəsində əliboş qalacaqlar. Əlbəttə ki, onlar bir gün Allaha möhtac olacaqlarını təsəvvür etsəydilər aldanmazdılar. Qiyamət günü onları qəfil bir görüş gözləyir. Onlar gözləmədikləri bir kəslə qarşılaşar və görərlər ki, Allahdan başqa .sığınacaq yoxdur

Furqan" surəsinin ٢٣-cü ayəsində buyurulur: "Biz onların əməllərini dağınıq zərrələrə" ."döndərərik

Bəli, qiyamət tufanında göyə sovrulan zərrələrə! Sözsüz ki, Allah kimsəyə zülm etməz. Kafirlər özləri özlərinə zülm edirlər. Allah xeyir işi puça çıxarmır. Sadəcə tə`rif, afərin üçün görülən iş, əslində, puçdur. Qiyamət günü kafirlər öz əməllərinin puç olduğunu .anlayarlar

## ƏN ZİYANKAR KƏSLƏR

Ayə və rəvayətlərə nəzər saldıqda aydın olur ki, axirət xoşbəxtliyi yalnız iman və imandan doğmuş əməl sayəsində əldə edilə bilər. Küfr isə insanı əbədi bədbəxtçiliyə aparır. Əlbəttə ki, düşüncə nöqteyi-nəzərindən "müstəz`əf", yə`ni zəif hesab olunanlara münasibət ayrıdır. O insan müstəz`əf hesab olunur ki, həqiqətdən xəbəri olmadığına görə heç bir təqsiri yoxdur. Amma həqiqəti anlamağa gücü çatdığı halda buna cəhd etməyənlər təqsirlidir. Həqiqəti bilərəkdən inkar edənlər hökmən cəzaya çatacaqlar. Onların öz əməllərinə güvənməsi əsassızdır. Bə`zən insan öz nəfsinin və şeytanın tə`siri altında bilə-bilə şər işlərə qurşanır, sonra isə peşman olur. Amma elələri də var ki, özünü yaxşı insan hesab etdiyi halda bir də ayılır ki, cəhənnəmdədir. Ən ziyankar kəslər beləlğəridir: "De ki, sizə əməlləri baxımından daha çox ziyana düşən kəslərdən xəbər verimmi? Onlar yaxşı iş gördüklərini güman etdikləri halda dünyadakı sə`yləri boşa çıxan kimsələrdir. Onlar Rəbblərinin ayələrini və Onunla görüşəcək-lərini inkar etmələrinin nəticəsində əməl-ləri heç olanlardır".(١) Bəli, ən ziyankar o kəslərdir ki, əslində puç dünya əməllərinə arxayın olublar. Bir daha qeyd edək ki, cəhalət səbəbindən iman gətirməyənlərin hesabı ayrıdır və onlar düşüncə zəifliyinə görə .bağışlana bilər. "Ən ziyankar" sinfinə isə düşüncəli şəkildə küfr edənlər daxildir



---

.Kəhf" surəsi, ayə: ١٠٣-١٠۵" [١٠٩] -١

Maraqlıdır ki, gördüyü işlərin pisliyini bildiyi halda onları davam etdirənlər “ziyankar”, pis işi yaxşı güman edərək davam etdirənlər isə “ən ziyankar” adlandırılmışdır. Bu sualın cavabında ilahi bir qanunauyğunluğu incələmək lazım gəlir. İnsan bə`zən o qədər günaha yol verir ki, yaxşını pisdən seçmək qabiliyyətini itirir. Belə insana elm və biliyin də köməyi olmur. “Casiyə” surəsinin ٢٣-cü ayəsini yada salaq: “Nəfsini özünə tanrı edən və Allahın bilərəkdən yoldan çıxartdığı, qulağını və qəlbini möhürlədiyi, gözünə də pərdə çəkdiyi kimsəni gördünmü?” Nəfsə itaət elə bir dərəcəyə çatır ki, insan öz bildiyinə qarşı kor olur. “Nəhl” surəsinin ١٠٨-ci ayəsində buyurulur: “Bun-lar o kəslərdir ki, Allah onların qəlblərini, qulaqlarını və gözlərini möhürləmişdir. Doğurdan da onlar qəflətdədirlər”. Başqa bir ayədə oxuyuruq: “Doğurdan da kafirləri qorxut-san da, qorxutmasan da, fərq etməz, onlar inanmayacaqlar; Allah onların ürəklərinə və qulaqlarına möhür vurmuşdur, gözləri önündə isə pərdə vardır”.(١) Belə insanların qəlbinin ilahi nurdan məhrum olmasının səbəbi öz günahlarıdır. İnsan üçün ən böyük əzab onun yaxşını pisdən ayıra bilməməsidir. Bir daha qeyd edək ki, belə bir hal insanın günahlarının qanuni nəticəsidir. “Səff” surəsinin ٥-ci ayəsin-də buyurulur: “Allah .”həqiqətdən üz döndərənlər-in qəlbini döndərdi. Allah günahkar qövmü hidayət etməz

Bu qayda elmlə məşğul olan insanlar üçün çox mühüm xəbərdarlıqdır. Unutmamalıyıq ki, öz bildiklərimizə əməl etməsək bu qaydaya uyğun olaraq yaxşını pisdən seçmək qabiliyyətini itirərik. Qur`ani-kərimdə bu mövzuya aid çox nümunələr var. Elminə



---

.Bəqərə” surəsi ayə: ۶-٧“ [١١٠] -١

əməl etməyən alim haqqında “Ə`raf” surəsinin ۱۷۵-۱۷۶-cı ayələrində buyuru-lur: “Onlara ayələrimizi verdiyimiz şəxsin xəbərini də söylə. O, (ayələrimizi inkar edib) inmandan döndü. Şeytan onu özünə tabe etdi və o, azğınlardan oldu. Əgər istəsəydik onu ayələri-mizlə ucaldardıq. Lakin o, yerə (dünyaya) meyl edib nəfsinin istəklərinə .”uydu

## GÜNAHIN AXIRI KÜFÜRDÜR

Qeyd etdik ki qarşımızda iki yol var: küfr və iman. Küfr şeytana itaətdir və insanı cəhənnəmə doğru çəkir. İman isə Allaha itaətdir və insanı behiştə aparır. Bəs iman yolunu seçib, bu yolda iman dərəcəsini artırmaq üçün nə etməliyik? Eləcə də küfrə .aparan səbəbləri öyrənib, ehtiyatlı olmağımız lazım gəlir

Qeyd etdik ki, insanı imandan uzaqlaşdırıb küfrə sürükləyən səbəb günahdır. Bu günahla küfr arasında hansı əlaqə var? Əxlaq alimləri belə hesab edirlər ki, insanı günaha sövq edən şəhvət və qəzəbdir. İnsan bu hisslərin tə`siri altında ilk dəfə günah etdikdə bir müddət sonra şəhvət və qəzəb sönür və insan adi halına qayıdır. Adi hala qayıtmış insan peşman olur və gördüyü işə görə özünü danlayır. Belə insanlar, adətən, tövbə edir, Allah da onları bağışlayır. Rəvayətlərdə buyuru-lur ki, mö`min günah etdikdə Allah bu günahı qeyd edən mələkləri yeddi saat yubatmaqla mö`mindən tövbə gözləyir. Allah-təala istəmir ki, mö`minin əməl dəftərinə günah yazılsın. Bu müddət ərzində peşman olub səmimi qəlbdən tövbə edən insan günah etməmiş (kimidir.(۱

Amma birinci günahdan sonra tövbə edilməsə şeytan insanı təkrar–təkrar bu günaha qaytarır. Günah təkrarlandıqca adət şəklini alır və peşmanlıq hissi ləzzət hissinə çevrilir. Bu zaman nəfsdə ziddiyyət yaranır və



---

.Biharul-ənvar” ۶-cı cild“ [۱۱۱]-۱

insanın daxilində çarpışma gedir. Yol verdiyi günahın haramlığını bilən insan Allaha qarşı çıxdığını anlasa da adət səbəbindən günahdan uzaqlaşa bilmir. Özünü inam və əməlin mübarizə meydanında görən insan "doğrudanmı, mən pis insanam?" deyə düşünür. Sonra anlayır ki, inandığı həqiqətlərə əməl etməyib. Özünə belə cavab verir: "Bəli, mən pis insanam ki, bu qədər günaha yol vermişəm". Amma insan xaraktercə özünüsevən olduğundan pis insan olmasını asanlıqla qəbul etmir. Əksər günahkarlar pis iş gördüklərini anlasalar da bunu e`tiraf etməkdən çəkinirlər. Hər halda imanlı insanın günah etməsi ziddiyyətli məsələ olsa da, həqiqətdir. Belə insan ruhi narahatlığını aradan qaldırmaq üçün çalışır. Bu zaman şeytan üçün fürsət yaranır və o, meydana girib insanın qulağına pıçıldayır: "Haradan bilirsən ki, gördüyün işlər günahdır?" Şeytanın vəsvəsəsinə əql və fitrət cavab verir ki, Qur`an bu əməlləri günah sayır. Şeytan şübhə toxumu səpməkdə davam edir: "Əvvəla, Qur`an Allah sözü yox, peyğəmbər sözüdür. Peyğəmbər isə adi bəşərdir və səhv edə bilər. Lap elə tutaq ki, Qur`an Allah sözüdür. Məgər Allah səhv edə bilməz?!" Bəli, şeytan bu sözləri deməyə qadirdir. Bu gün insanlar arasında özünü ziyalı adlan-dıran, əslində zülmətə bələnmiş adamlar var ki, şeytanın bu sözlərini təkrarlayırlar. Belə şeytansifət hiyləgərlərdən !Allah pənah aparaq

Bəli, günah insanı tədricən küfrə aparır. İnsanın daxilində yaranmış mübarizəni öz xeyrinə həll etmək üçün şeytan min bir üsula əl atır. İnsanı bu vəziyyətə gətirən isə təkrar-təkrar günaha yol verməsidir. Əbədi əzabdan qorxan insan günahdan qaçır. Günaha getmək küfrə getməkdir. Günaha tələsən insan küfrə tez çatar. Əlbəttə, ola bilər ki, günahkar insan Allahın lütfü ilə hansısa bir nəsihətdən ayılıb tövbə edərək .imana qayıtsın

Günahın küfrlə nəticələnməsi barədə danış-dıq. Bəs günaha batmamaq üçün nə etmək lazımdır? Nə edək ki, imanımız güclənsin və küfr təhlükəsindən amanda qalaq? Peyğəmbərlərin övliyaların mə`sum imamların əxlaq alimlərinin ən mühüm .vəzifələrindən biri bu suallara cavab verməkdir

İnsan istək və iradə cəhətdən azad olan bir mövcuddur. Xeyir yolunu o özü seçməlidir. Hər bir əməl insanın iradəsi ilə həyata keçir. Əlbəttə ki, istək və iradənin də dərəcələri var. İnsan birdən-birə övliyaların yolunu getmək istəsə, bu iş onun üçün üzücü olar. Günah girdabına yuvarlanmış insanın övliyaların dözdüyü ibadət çətinlik-lərinə dözməsi olduqca çətindir. Adət olunmuş günahdan çəkinmək üçün böyük səbr və .dözümə ehtiyac var

Əxlaq alimləri günahdan xilas olmaq istəyən insanlara daha asan üsullar göstərirlər. İlk addımda ən asan işlərdən başlamaq lazımdır. İnsan birdən-birə ağır çəkili daş qaldıra bilməz. Amma yüngül daşlarla məşq etməklə hətta dünya çempionu adını qazanmaq olar. Bu işdə məşqçiyə ehtiyac olduğu kimi mə`nəvi tərbiyədə də əxlaq müəllliminə ehtiyac var. Əxlaq müəllimi insanın əlindən tutub onu addım–addım .qabağa aparır. O, insanı tədricən günahdan çəkindirir

Demək, günahı tərk edib və imana yaxınlaşmaq üçün ağır proqramlardan çəkinmək lazımdır. Bu proqramların hazırlanmasında ən e`tibarlı mənbə peyğəmbər və övliya göstərişləridir. İnsan bu göstərişləri nəzərə alarsa adət etdiyi günahlardan daha asan :xilas ola bilər. Bə`zi əməli göstərişlərə nəzər salaq

Günaha təhrik edən mühit və şəraitdən çəkinmək .١

İnsan günahdan uzaq olmaq üçün günaha şərait yaradan mühitdən uzaq olmalıdır. Əgər bir yolda

təhlükə gözlənilirsə bu yoldan kənarlaşmaq lazımdır. Bə`zən magistral yollarda sürücünü qarşıdakı təhlükədən xəbərdar edən lövhələr asılır. Tufanlı günlərdə mütəxəssislər dənizə çıxmamağı məsləhət görür insanı günaha batıra biləcək şəraitlər də bu sayaq qorxuludur və insan günah ehtimalı olan mühitdən qaçmalıdır. Çünki belə mühitlərdə tüğyan etmiş qəzəb və şəhvəti cilovlamaq çətin olur. Ən yaxşısı günah .mühitinə düşməməkdir

Ümumiyyətlə, günah mühitinə yaxınlaşmamaq ümumi dini göstərişlərdən biridir. Günah doğuran səhnələrdən, musiqilərdən, sözlərdən, baxışlardan çəkinən insanın .günaha batma ehtimalı çox azdır

Qarınquluquluqdan uzaqlıq .۲

Adətən, insanı günaha batıran heyvani istəklərə itaətdir. Ən güclü heyvani istəklərdən biri çox yeməkdir. Günahdan uzaq olmaq istəyənlər öz yeməklərinə nəzarət etməlidirlər. Allah-təalanın orucdan ötrü verdiyi əmri təsadüfi deyil. İlin on bir ayını yeməkdə azad olan insan özünün yeməyə olan meylini cilovlamalıdır. "Bəqərə" surəsinin ۱۸۳-cü ayəsində oxuyuruq: "Ey iman gətirənlər! Oruc tutmaq sizdən əvvəlki ümmətlərə vacib olduğu kimi, sizə də vacib edildi. Olsun ki, təqvalı olasınız." Orucluq ayından başqa vaxtlarda da az yemək olduqca faydalıdır. Sözsüz ki, söhbət zəifliyə .səbəb olacaq qədər az yeməkdən getmir

Pis dostlardan uzaqlaşmaq .۳

İmanı qorumaqda ən əsas iş pis dostlardan uzaqlaşmaqdır. Xüsusi ilə gənclər çox asanlıqla dostun tə`siri altına düşüb, onun xasiyyətini götürürlər. Valideyn və tərbiyəçi özlərinin himayəsi altında olan cavanlara yaxşı dost seçməyi tövsiyə etməlidirlər. İnsan dostun tə`siri ilə həm behişt, həm də cəhənnəmə gedə bilər. Əgər öz müsbət xüsusiyyətlərimiz haqqında yaxşıca düşünsək, bu xüsusiyyətləri kimdən 

qazandığımızı yada sala bilərik. İnsanı namaza, məscidə sövq edən də dostdur, əyri yola çəkən də. Yaxşı dost səni məscidə də`vət edən zaman sənin bəhanələrinə baxmadan israr edir. Onun tə`siri altında saleh əməl səndə xasiyyətə çevrilir. Əksinə, pis dost insanda pis adətlər, çirkin xasiyyətlər doğurur. Aparılan sorğular göstərir ki, narkotik maddələrə qurşanmış gənclərin əksəriyyəti bu yola pis dostun təhriki ilə düşmüşlər. Əvvəlcədən yaxşı dost seçmək, eləcə də pis dostdan uzaqlaşmaq çətin deyil amma dostun tə`siri altında pis vərdişlər qazandıqdan sonra bu dostdan asanlıqla ayrılmaq olmur. İnsan dosta öyrəşir və ondan asanlıqla ayrıla bilmir. Dostun danışıq tərzinə, yerişinə, geyiminə və digər xüsusiyyətlərinə adət edən şəxs onun tə`sirindən çıxmaqda çətinlik çəkir. Dostun danışdığı xüsusi lətifələrdən ləzzət alan insan çox vaxt hiss etmir ki, bu lətifələr onu günaha çəkir. Pis dostun verdiyi kitabların, .audio və video kasetlərin tə`siri altında azğınlığa düçar olanlar az deyil

Diqqətli olun! Dost seçərkən onun xüsusiyyət-lərini diqqətlə nəzərdən keçirin. Unutmayın ki, pis dost sizi cəhənnəmə apara bilər. Görün dostun tə`siri altında cəhənnəmə düşənlər nə deyir: “Vay olsun mənə! Ey kaş filan kəsi özümə dost (tutmayaydım”.(١



---

.Fürqan” surəsi, ayə: ٢٨“ [١١٢]-١

## :İYİRMİ ÜÇÜNCÜ DƏRS

## NAMAZ TƏKAMÜLÜN SIRRIDIR

### BU SİRR GİZLİ DEYİL

Qeyd etdik ki, insanın təkamülünə mühüm tə’sir göstərən amilləri, əsasən, üç bölmədə qruplaş-dırmaq olar: Allah-təalaya aid olan işlər, insanın özünə aid olan işlər, cəmiyyətə aid olan işlər. Əlbəttə ki, ikinci və üçüncü qrupa aid olan vəzifələr birincidən, yə`ni Allah qarşısındakı vəzifələrdən qaynaqlanır. Çünki insanın təkamülü Allaha yaxınlaşmaqdan başqa bir şey deyil. Sadalanan vəzifələr də insanı Allaha yaxınlaşdırdığı üçün əhəmiyyətli hesab olunur. Ona görə də insanı kamilləşdirən .istənilən müəyyən bir iş insanın Allahla bağlılığını gücləndirir

Deyilənlərə əsasən, söhbətimizi bir başa Allah ilə əlaqəli olan vəzifələrin üzərində qurduq. Qeyd etdik ki, bütün dəyərlər Allaha imandan irəli gəlir. Allaha imandan sonra .növbə Allahla bağlı vəzifələrə çatır

Bir başa Allaha aid olan işlərin ən faydalısı namazdır. Təəssüf ki, çoxlarımız namaza lazımi əhəmiyyəti vermirik. Kamillik arzusunda olan insanlar arasında yanlış bir təsəvvür formalaşıb. Onlar güman edirlər ki, kamala çatmaq üçün elə sirrlər var ki, adi insanlar üçün bu sirrlər əlçatmazdır. Bu fikri doğuran heç şühbhəsiz ki, şeytandır. Necə ola bilər ki, insanın kamala çatması üçün kitablar, peyğəmbər-lər göndərən Allah bu yolda hansısa sirlərlə maneələr yaratsın?! İnsanı kamillikdən ötrü yaradan Allah onun üçün probelmlər icad edərmi?! Bu, mümkün olacaq iş deyil. Allah öz bəndəsinə həqiqət yolunu göstərərək ona yardım edir. İnsanın vəzifəsi onu səadətə çatdıracaq .göstərişlərə diqqət yetirməkdir

### QUR`ANDA NAMAZ HAQQINDA

Hal-hazırda yeganə mö`təbər ilahi kitab olan Qur`ani-kərimə müraciət etsək görərik ki, insan üçün ən

əhəmiyyətli vəzifə namazdır. Namaz haqqında yüzdən çox ayə nazil olmuşdur. Bu ayələrə əsasən namaz bütün şəriətlərdə vacib buyurulmuş ibadətdir. "İbrahim" surəsinin ۴۰-cı ayəsində oxuyuruq: "Pərvərdigara, məni də, nəslimdən olanları da namaz qılan et". Bu dua Həzrət İbrahimə (ə) məxsusdur. Həzrət Musaya (ə) nazil olmuş ilk vəhydə belə buyurulur: "Mənəm, Mənəm o Allah ki, Məndən qeyri tanrı yoxdur. Mənə ibadət et və Məni yat etməkdən ötrü namaz qıl".(۱)

Həzrət İsa (ə) hələ beşikdə ikən deyir: "O, harada oluramsa olum, məni mübarək etdi və mənə diri olduğum müddətdə namaz qılıb zəkat verməyi tapşırdı."(۲) "Loğman" surəsinin ۱۷-ci ayəsində Həzrət Loğman (ə) öz oğluna belə tapşırır: "Ey oğlum, namaz qıl, (insanlara) yaxşı işlər görməyi əmr et, pis işləri qadağan elə"

İslam Peyğəmbərinə (s) belə xitab olunur: "Kitabdan sənə vəhy olunanları oxu və namaz qıl. Həqiqətən, namaz (insanı) pis və çirkin işlərdən çəkindirər".(۳)

### NAMAZ BARƏSİNDƏ OLAN RƏVAYƏTLƏR

Dini rəvayətlərdə namazın əhəmiyyəti və faydala-rı haqqında kifayət qədər danışılmışdır. Hər birimizin eşitdiyi məşhur bir rəvayətdə İslam Peyğəmbəri (s) buyurur: "Namaz dinin sütunudur".(۴) Ərəblər çadır qurarkən onun ortasında qaldırdıqları sütuna "əmud" deyirdilər. "Sütun" kimi tərcümə etdiyimiz söz hədisdə



---

۱- [۱۱۳] "Taha" surəsi, ayə: ۱۴.
۲- [۱۱۴] "Məryəm" surəsi, ayə: ۳۱.
۳- [۱۱۵] "Ənkəbut" surəsi, ayə: ۴۵.
۴- [۱۱۶] "Biharul-ənvar" ۸۲-ci cild.

əmud” kimi işlənilmişdir. Əgər çadırın ortasından əmud götürülərsə, çadır yerə çökər.“ Hədisdən mə`lum olur ki, əgər namaz hökmü dindən çıxarılarsa bu din məhv olar. Həmin hədisin davamında Həzrət Peyğəmbər (s) buyurur: “Əgər çadırın əmudu möhkəm olarsa, çadır da möhkəm olar. Əmud möhkəm olmazsa, iplər və mıxlar çadırı .”saxlaya bilməz

Həm İmam Baqir (ə) və həm də İmam Sadiqin (ə) buyurduğu bir hədis var: “Qiyamət günündə bəndədən soruşulacaq ilkin şey namazdır. Əgər namaz qəbul olarsa, digər (əməllər də qəbul olar, əgər namaz qəbul olmazsa digər əməllər də qəbul olmaz”.(١

Digər bir məşhur rəvayətdə İmam Sadiq (ə) buyurur: “Hər kəs namaza yüngül (yanaşarsa, bizim şəfaətimizə nail olmaz”.(٢

Ayə və rəvayətlərdən mə`lum oldu ki, insanı Allaha yaxınlaşdıran ən mühüm əməl namazdır. Hər birimiz gün uzunu dəfələrlə namazda bu sözləri təkrar edirik: “Tələsin ən xeyirli işə”. Təəssüf ki, çoxumuz dediyimiz sözlərin mə`nasına varmırıq bir ömür bu sözləri təkrar edən insan dediyi sözlərə e’tina etmir. Namazda təkrar etdiyimiz “tələsin nicat tapmaq” sözləri barədə düşünürükmü? Bəli, lazımı qədər əhəmiyyət .vermədiyimiz namaz insan üçün ən böyük xilas yoludur

Tarixdə xoşgəlməz münasibətlərlə də qarşıla-şırıq. “Tələsin ən xeyirli işə” cümləsini azan və iqamədən çıxaran ikinci xəlifənin fikirincə bu şüar insanları cihad kimi bir işdən yayındırır. Olduqca yanlış fikirdir. Bəsirət gözü açıq olanlar gözəl bilir ki, insanı cihad səhnəsində canından keçməyə hazır edən məhz namazdır. Namaza biganə insan .cihada əsla ciddi yanaşa bilməz

səh:١٧٣

---

.Biharul-ənvar” ٨٢–ci cild“ [١١٧]-١

.Biharul-ənvar” ٨٢-ci cild“ [١١٨]-٢

Hər halda, milyonlarla insan namaz zamanı “tələsin ən xeyirli işə” şüarını təkrarlayırlar. Əsas problem namaza ciddi yanaşmamağımızdadır. Əgər namazda qəlb iştirak etmirsə bu namazın ruhu yoxdur və ruhsuz bir işdən lazımınca faydalanmaq qeyri-.insani-mümkündür

### ƏN XEYİRLİ ƏMƏL

Nə üçün namaz ən xeyirli əməl hesab olunur? Başqa əməllərlə müqayisədə daha sadə və daha asan olan namaz nə üçün daha əhəmiyyətli hesab olunur? Diqqət etsək görərik ki, cihadla müqayisədə namaz olduqca asandır. Cihadda aclıq, susuzluq, yorğun-luq, yaralanma, hətta ölüm kimi məhrumiyyətlər var. Bununla belə, bir sıra söz .və hərəkətdən ibarət olan namaz cihaddan xeyirli bilinir

Həqiqi ibadət odur ki, insan öz yaradanı qarşısında bütün varlığı ilə təslim olsun. Bizim təkamülümüzə mane olan əsas səbəb Allah qarşısında özümüzü ixtiyar sahibi kimi aparmağımızdır. Biz bunu dilimizlə izhar etməsək də, hərəkətlərimizdə bu yanlış xüsusiyyət özünü göstərir. Biz özümüzü qüdrət, iste`dad, sərvət sahibi kimi aparırıq. Böyük vəzifəyə çatmış insanlarda bu xüsusiyyət özünü daha çox biruzə verir. Elə bu səbəbdən də bə`zən nəfsimizin razılığını Allahın razılığından üstün tuturuq. “Casiyə” surəsinin ۲۹-cu ayəsində buyurulur: “Nəfsini özünə tanrı edən gördün-mü?” Bəli, çoxlarımız Allah pərəstlik əvəzində özünə pərəstişə məşğuluq. Çox az insanları çıxmaq şərti ilə hər birimizdə hansısa dərəcədə özünəpərəstişi müşahidə edirik. “Yusuf” surəsinin ۱۰۶-cı ayəsində oxuyuruq: “Onların çoxu Allaha şərik qoşmaqla iman gətirmir-lər”. Əksər insanlarda şirk əlaməti var, Allahpərəstlik özünəpərəstişlə .çulğaşmışdır

Namazın əsas fəlsəfəsi budur ki, özünəpərəs-tişliyi bir kənara qoyub bütün .varlığımızla Allaha təslim olaq

Bəli, namaz Allah qarşısında təvazökarlıqla dayanmaq üçün vasitədir. Namaz varlığı Allaha təslim etmək üçün tə'lim meydanıdır. "Ən`am" surəsinin ۱۶۲-ci ayəsində oxuyuruq: "De ki, həqiqətən, namazlarım, ibadət-lərim, diriliyim və ölümüm aləmlərin .Rəbbi olan Allah üçündür". Bəli namaz təslim olma tə'limidir

İnsan öz varlığını, bütün iste`dad və qüvvələrini Allahın ixtiyarında olduğunu bilərsə namazda hal tapar. Namaz insanda bu halı gücləndirir və onu həm zahiri və həm də batini cəhətdən Allaha qarşı diqqətli edir. Elə bu səbəbdən də insana üzünü qibləyə tutmaq tapşırılır. Namazın əksər hərəkətləri bəndəlik göstəricisidir. Səbrlə qiyam halında durmaq, tə`zim, səcdə hər biri bəndəlik nişanələridir. Namazın əksər sözləri bəndənin öz ağası qarşısında özünün acizliyinin izharından ibarətdir. Namazdakı bütün hərəkətlər və zikrlər Allah qarşısında müt'i olmanı bariz şəkildə izhar edir. Əlbəttə ki, .namazın batini keyfiyyətləri də olmalıdır

Demək, namaza böyük əhəmiyyət verilməsinin sirri yaranış məqsədinin, yə`ni eqoizmin aradan qaldırılması və insanda bəndəlik ruhiyyəsinin yaradılmasında oynadığı mühüm rolla bağlıdır. Allahın həqiqi malikiyyətini və insan vücudunda bəndəliyin izharı üçün namaz ən tə`sirli vasitədir. Belə geniş tutum başqa ibadətlərdə yoxdur. Oruc da ibadətdir. Amma oruc yalnız bir sıra əməl və rəftarların tərkindən ibarətdir. Namazda olan zikrlər, bəndəliyin izharı başqa heç bir ibadətdə yoxdur. Namaz insanın bütün vücudunu bəndəliyə sövq edən kompleks ibadətdir. Bu ibadətdə bədənin əksər üzvləri, eləcə də, düşüncə və qəlb iştirak edir. Sadalanan səbəb-lərə .görə namaz "ən xeyirli əməl" hesab olunur

### HALSIZ NAMAZ

Əgər namaz ən xeyirli əməldirsə və insanın mə`nəvi təkamülündə böyük tə`sirə malikdirsə, nə üçün namaz

qılan müsəlmanlarda bu tə`sir bir o qədər də müşahidə olunmur? Rəvayətlərdə buyurulur ki, “namaz mö`minin me`racıdır”.(١) Nə üçün uzun illər namaz qılmış şəxs bir dəfə də olsa bu me`racı hiss etmir? “Ənkəbut” surəsinin ۴۵-ci ayəsini xatırlayaq: “Namaz (insanları) pis və çirkin işlərdən uzaqlaşdırır”. Bəs nə üçün bir ömür namaz qılan insan yenə də günaha yol verir? Ayə və rəvayətlərdə zikr olunmuş bir çox .xüsusiyyətlərin namaz qılanlarda müşahidə edilməməsi sual doğurur

Cavab budur ki, bizim qıldığımız namaz əsl namazın zahiri formasının oxşarıdır. Çoxumuz yalnız namazın son cümləsində xatırlayırıq ki, namaz qılırmışıq. Çox vaxt yadımıza düşməyən işlər namazda yadımıza düşür və namaz boyu bu işləri götür-qoy edirik. Məsələn, namazdan sonra dərsimiz varsa, namazda dərs mütaliə edirik. Ticarətlə məşğul olanlar namaz zamanı alacaq-ları və verəcəkləri haqqında düşünür. !?Namaz adlandırdığımız bu əməli namaz hesab etmək olarmı

Bəli, bu sayaq namazlardan əslində tövbə etmək lazımdır. Günahlar bir yana dursun, yerinə yetirdiyimiz naqis ibadətlərdən tövbə etməyin yeri var. Əgər bir şəxs fikri tamam başqa yerdə olduğu halda sizə tə`rif və təşəkkür edərsə bu diqqətsizlik sizə xoş gələrmi? Biri ilə danışarkən yan-yörəyə baxıb, başqa şey haqqında düşünmək hörmətsizlik deyilmi? Əgər diqqətsiz-liyi hörmətsizlik hesab ediriksə, qıldığımız namazlar ibadətdir yoxsa istehza?! Həzrət Peyğəmbər (s) bir rəvayətdə buyurur ki, (namazı diqqətsiz qılan şəxs Allahın onu ulağa çevirməyindən qorxmurmu?(٢

Allahu əkbər” deyən şəxs şəhadət verir ki, Allahdan böyük olan yoxdur. Dildə bu“ sözləri deyərkən qəlbdə bir başqasına ümid etməyin mə`nası odur ki, insan üçün Allahdan da böyük kimsə var. Dildə bir söz deyib



---

.Biharul-ənvar” ۸۲-ci cild“ [۱۱۹] -۱

.Biharul-ənvar” ۸۴-cü cild“ [۱۲۰] -۲

qəlbdə başqa bir şey fikirləşmək Allahı məsxərə etmək deyilmi? Əgər bir şəxs bizi tə`riflədiyi halda qəlbən tamam başqa münasibətdədirsə və əsl münasibətdən xəbərdarıqsa bu sözləri özümüz üçün məsxərə hesab etmirikmi? Allah namaz qılan şəxsin qəlbindən xəbərdardır. Üzü Allaha, qəlbi isə dünyaya tərəf durmuş insan öz hərəkətindən nə gözləyə bilər? Adi insanla danışarkən diqqətsizliyi qəbahət biliriksə, hansı cür`ətlə namazda diqqətsiz olu-ruq? Doğrudan da belə diqqətsizliklə qılınmış namazlara tövbə etmək lazımdır. "Nisa" surəsinin ۴۳-cü ayəsində buyurulur: "Ey iman gətirənlər! Nə dediyinizi başa düşəsiniz deyə məst halda namaz qılmayın". Məstlikdən ağlı düz işləməyən insanın sözləri puç və mə`nasızdır. Belə insanın tə`rif və təşəkkürünü dəyərli hesab etmək olmaz. Ayədə yalnız şərabdan məst olanlar nəzərdə tutulmur. İstənilən bir səbəbdən qəflət halında olan insana namaza durmamaq tapşırılır. Çünki məst insan nə danışdığını bilmir. Qəflətdə olan insanlar da öz dediklərinə diqqətsiz olurlar. Bəli, namazdan bəhrələnməməyimizin əsl səbəbi həqiqi namaz qılmamağımızdır. Biz sadəcə öhdəmizə düşən vəzifəni yerinə yetirib, qəbr və qiyamət əzabından xilas olmaq istəyirik. Böyük əksəriyyət belə düşünür ki, həqiqi mö`min olmaq üçün təcvid qaydalarına əməl edib, namazı gözəl avazla qılmaq lazımdır. Guya mö`minlik ərəb hərflərini düzgün tələffüz etməkdən ibarət imiş. Hansı ki, namazın zahiri göstəricilərinin onun ruhuna heç bir dəxli yoxdur. İnsanı Allaha yaxınlaşdıran qəlb halətidir. Zahiri gözəllik yalnız batini gözəlliyi tamamlamaq üçündür. .Namazın ruhu isə qəlbin iştirakından ibarətdir

Namaz kimi dəyərli bir gövhər ixtiyarımızda-dır. Namazı lazımınca dəyərləndirməməyimiz təəssüf doğurur. Kamilləşmək istəyənlərin çoxu qapı-qapı düşüb kamillik sirrini axtarırlar. Hansı ki, kamilliyə

çatmaq üçün namazdan tə`sirli bir əməl olsaydı, Allah o əməli gizləməzdi. Axı aləmlərə rəhmət olan Qur`ani-kərimdən başqa çarə nə ola bilər? Əgər namazdan tə`sirli bir vasitə olsaydı hökmən Qur`anda bu barədə mə`lumat verilərdi. Nə üçün Həzrət Əli (ə) namaza daha çox əhəmiyyət verirdi? Yoxsa o nədənsə xəbərsiz idi? Həzrət (ə) gündə min rək`ət namaz qılırdı. Əgər namazdan tə`sirli ikinci bir əməl var idisə, nə üçün müttəqilər ağası Əli (ə) məhz namaza bu qədər vaxt sərf edirdi? Həzrət (ə) yol gedərkən, şum vurarkən, quyu qazarkən Allahın zikrindən ayrılmazdı. Vacib namazda olan bir çox şərtlər müstəhəb namazda yoxdur. Mümkündür ki, Həzrət Əli (ə) gün uzunu müstəhəb namazlardan ayrılma-mışdır. Müəllif özü böyük alimlərin yol gedərkən namaz qılmasının şahidi olub. Mərhum Əllamə Təbatəbai yol boyu nafilə namazlarını qılardı. Mərhum Şeyx Qulamriza evdən məscidə, məsciddən evə yol boyu .müstəhəb namaza məşğul olardı

Xülasə, əgər namazın əhəmiyyətini bilsəydik, namaza ciddi yanaşar və onun faydalarından məh-rum olmazdıq. Həqiqi namazqılanlar bu ibadətin dünya və axirət .faydalarını gözəl tanıyır

.Pərvərdigara, bizi həqiqi namazqılanlardan buyur

## :İYİRMİ DÖRDÜNCÜ DƏRS

## NIYYƏTIN ROLU

### NAMAZA ÜÇ YANAŞMA

Ayə və rəvayətlərdən mə`lum oldu ki, insanın Allah qarşısında ən böyük vəzifəsi namazdır. Bütün səmavi dinlərdə namaz var və hər bir dində bu ibarətə böyük əhəmiyyət verilir. Buna səbəb namazın insanın xoşbəxtliyində oynadığı əsaslı roludur. Namaza aid olan bəhslərdən biri onun fiqhi məsələləridir. Zahirən çox sadə görünən və cəmi bir neçə dəqiqə vaxt aparan namazın fiqhdə yüzlərlə hökmü var. Bu hökmləri öyrənib onlara riayət etmək çox mühümdür. Namazın fiqhi hökmlərinə e'tinasızlıq uzun illərin namazını batil edə bilər. Məsələn, qüsulu düzgün yerinə yetirməyən insanın namazı, orucu, həcci və sair ibadətləri batil ola bilər. Qırx il namaz qıldıqdan sonra namazın qiraətində (oxunuşunda) səhvə yol verdiyini anlayan şəxs bütün namazlarını təzələməlidir. Göründüyü kimi, namazın fiqhi hökmlərinə e'tinasız yanaşma böyük çətinliklər yarada bilər. Ona görə də böyük əziyyət və vaxt tələb etməyən bu biliklərə .yiyələn-mək lazımdır

Qeyd etdiyimiz üç mövzudan ikincisi ümumi ibadətlər mövzusudur. Namaz da bir ibadət kimi bu bəhsə daxildir. Üçüncü mövzuda isə namazın xüsusiyyətlərindən .danışılır

### İBADƏTDƏ NİYYƏTİN ƏHƏMİYYƏTİ

İbadətdə çox mühüm məsələlərdən biri niyyətdir. Niyyət hər bir ibadətin ruhu hesab olunur. İbadətin dəyəri niyyətdən asılıdır. Hər hansı bir ibadətdə insanın niyyəti qüsurludursa bu ibadət səmərəsizdir. Gündəlik həyatımızda da insanların niyyətə çox fikir verdiklərini görürük. Əgər bir şəxs sizə saf niyyətlə mehribanlıq göstərirsə, onu yüksək dəyərləndirir-siniz. Əksinə, səh:١٧٩

müəyyən məqsədlərlə göstərilən mehribançılıq insana xoş gəlmir. Çünki sizi bu mehribançılıqla aldadıb, hansısa məqsədə çatmaq istəyirlər. Saxta məhəbbət təkrarlandıqca daha çox cansıxıcı olur. Deməki, zahirən eyni görünən əməllər müxtəlif niyyətlərlə icra oluna bilər. Sizə ehtiram göstərən iki nəfərin niyyətləri müxtəlif ola bilər. "Necəsən" kəlməsi həmişə məhəbbəti ifadə etmir. Bə`zən bir insanı məsxərəyə qoymaq üçün onun əhvalını soruşurlar. Əgər məsxərə məqsədi ilə sizdən hal-əhval tuturlarsa, xoşlanırsınızmı? Mə`lumdur ki, yox. Demək, hər hansı bir əməli qiymətə .mindirən onun zahiri yox batini, yə`ni bu işdə güdülən məqsəddir

Ötən söhbətdə namazın fəzilətindən danışan bə`zi ayə və rəvayətlərə nəzər saldıq. Namaz insanı təsəvvür olunmayan bir mərtəbəyə qaldıra bilər. Övliyaları ali məqama qaldıran da məhz namazdır. Rəvayətdə "namaz mö`minin me`racıdır" buyurulur. Namaz sayəsində hasil olan me`racın mərtəbələri sonsuzdur. Onu da qeyd etməliyik ki, insanı kamal zirvəsinə qaldıran namaz elə səviyyədə qılına bilər ki, insanı cəhənnəmə aparar. Eyni bir əməldə mövcud olan bu iki xüsusiyyət nə üçün bu qədər ziddiyyətlidir? Cavab aydındır: Əgər namazda ilahi niyyət yoxdursa bu namaz faciədir. Həzrət Peyğəmbərdən (s) nəql olunmuş rəvayətdə buyurulur: "İki nəfər məscidə daxil olub namaz qılır. Onlardan biri öz namazı ilə cəhənnəmə, digəri isə behiştə gedir. Cəhənnəmə gedən şəxs namaz qılması ilə qürrələnir və başqalarının diqqətini cəlb etmək üçün namazın rüku, səcdə və başqa əməllərini daha yaxşı yerinə yetirir. Bu niyyətinə görə həm namazını batil edir, həm də riyakarlıq səbəbindən cəhənnəmlik olur. İkinci şəxs isə namazda xəcalət hissi keçirir və daim düşünür ki, qıldığı namaz qəbuldur yoxsa yox. Namaz zamanı ona tövbə halı gəlir və bir

(daha günah etməyəcəyinə söz verir. Belə namaz insanı behiştə aparır”.(١)

Niyyət əməlin dəyərini müəyyənləşdirən ən mühüm amildir. İbadətlərin me’yarı niyyətdir və ibadətin hansı məqsədlə yerinə yetirilməsi çox mühümdür.

### RİYA NAMAZI PUÇA ÇIXARIR

Riyakarlıq eqoistlik kimi mənfi xüsusiyyətlər ibadəti puça çıxarır bu sayaq qatqıları olan ibadət nəinki faydasızdır, hətta insanı tənəzzülə uğradır. İbadət üçün zərərli olan ən mühüm amillərdən biri riyakarlıq, özününümayişdir. Riyakar insan ibadət zamanı ətrafdakıların diqqətini cəlb etmək və özü haqqında tə`riflər eşitmək istəyir. O, bu təriflərdən ləzzət alır. Bu niyyətlə ibadət edən insan Allahın yox insanların razılığı üçün çalışır. Namazda riya haqqında Qur`ani-kərimdə iki ayə var: “Vay olsun o namaz qılanların halına ki, öz namazlarından qəflətdədirlər, o kəslər ki, riyakarlıq edir-lər”(٢); “Münafiqlər Allaha hiylə gəlmək istə-yirlər, halbuki, Allah onların hiylələrini qaytaracaq. Namaza duranda tənbəlliklə qalxar, xalqa riyakarlıq edər və Allahı çox az xatırlayarlar”.(٣)

İstər qədim, istərsə də müasir münafiqlər heç vaxt açıq deməzlər ki, dini qəbul etmirik. Kafiri münafiqdən fərqləndirən də budur. Dini açıq inkar edən şəxs kafir, qəlbində inkar edən şəxs isə münafiqdir. Peyğəmbər dövründə münafiqlər xalqın nəzərini cəlb etmək üçün məscidə gəlib namaz qılardılar. Ayələrdən mə`lum olur ki, onların qəlbinə süstlük hökmran imiş və xalqın diqqətini cəlb etmək üçün qıldıqları namaz onların əzabını artırdı.



---

١- [١٢١] “Biharul-ənvar” ٧٢-ci cild.

٢- [١٢٢] “Maun” surəsi, ayə: ٤-٦.

٣- [١٢٣] “Nisa” surəsi, ayə: ١٤٢.

Qur`ani-kərimdə infaq, zəkat cihad kimi ibarətlərdəki riyakarlığa da işarə olunur. “Nisa” surəsinin ٣٨-ci ayəsində buyurulur: “Öz mallarını camaata göstərmək üçün infaq edən, Allaha və axirət gününə inanmayan kəslər ...” Cihadda riya haqqında isə belə buyurulur: “Yurdlarından təkəbbürlə, özlərini camaata göstərmək üçün çıxanlar kimi olmayın”.(١) Deməк, riya təkcə namaza aid deyil və onunla hər bir ibadətdə rastlaşmaq .olar

Riyanın antonimi, yə`ni ziddi ixlasdır. İxlas odur ki, insan öz əməlində yalnız Allahın razılığını düşünsün. İxlaslı insan Allahdan qeyri bir kəsin razılığı intizarında deyil. İxlaslı insanın bə`zən başqalarının qarşısın-da ibadət etməsi müstəhəb olur. “İbrahim” surəsinin ٣١-ci ayəsində oxuyuruq: “Onlara verdiyimiz ruzidən gizlində və aşkarda infaq etsinlər”. Gizli verilən sədəqənin, infaqın üstünlüyü barədə rəvayət çoxdur. Hətta bir rəvayətdə buyurulur ki, sağ əllə edilən infaqdan sol əl xəbərsiz qalsın. Amma bə`zən infaqın açıq şəkildə verilməsi tələb olunur. Çünki açıq infaq cəmiyyətə xeyirxahlığı təbliğ edir. Başqalarının gözü qarşısında sədəqə verən insanın niyyəti həm saf həm də riya ola bilər. Əgər o, öz hərəkəti ilə başqalarını da sədəqə verməyə həvəsləndirmək istəyirsə, bu yaxşı niyyətdir. Yox əgər bu işi “bəh–bəhə” xatir edirsə, .gördüyü iş puçdur

### NİYYƏT İKİ AĞIZLI QILINCDIR

Niyyətdən asılı olaraq beş dəqiqəlik bir namaz insanı həm behişt, həm də cəhənnəmə apara bilər. Ona görə də insan öz niyyətinə qarşı çox həssas olmalıdır. İnsanın öz qıldığı namazlardan razı qalıb qürrələnməsi çox pis haldır. Qiyamət günü bir çoxlarına deyilər ki, sən namazı filankəslə-rin razılığına xatir qılmısan get



---

.Ənfal” surəsi, ayə: ۴٧“ [١٢۴] -١

əvəzini onlardan al! Rəvayətlərdə buyurulduğuna görə, riyakarlıq bə`zən o qədər məxfi olur ki, mələklərin də nəzərindən qaçır. Riyakarlığı yalnız Allah-təala özü qeydə alır. İnsanın hər bir əməli bir neçə dəfə süzgəcdən keçirilir. Bəndənin əməli yuxarı qalxıb birinci səmaya çatır. Bu səmadakı mələklər onu qəbul etsələr, əməl ikinci səmaya qalxır. İkinci səmada da təftişçi mələklər var. Yalnız bu mələklərin təsdiqindən sonra əməl üçüncü səmaya qalxa bilər. Beləcə, yeddinci səmayadək təftiş gedir. Yeddinci təftişdən keçən əməl Allahın hüzuruna göndərilir. Bə`zən yeddi səmada qəbul olunmuş əməl haqqında Allah-taala buyurur: "Bu əməl mənim razılığım üçün (görülməyib..."(١)

Belə rəvayətlər çoxdur. Bu rəvayətləri eşidib, ümidi itirmək yox, niyyətə qarşı diqqətli .olmaq lazımdır. Bu məsələyə diqqətsiz yanaşan insan riyakarlığa düçar olacaqdır

Əməldə niyyətin rolu o qədər böyükdür ki, saf niyyətli insanın bütün əməlləri ibadət hesab oluna bilər. Bəli, yemək, içmək, yatmaq, istirahət ibadət səviyyəsinə ucala bilər. İnsan bütün bu əməllərdə Allahın razılığını gözləyərsə, ötən hər an üçün ibadət savabı yazılar. Allahın razılığına səbəb olan hər bir əməl ibadətdir. Xüsusi ibadətlərin digər əməllərdən fərqi odur ki, namaz və oruc kimi xüsusi ibadətlərdə riyakarlıq olarsa, bu .əməllər insanı cəhənnəmə aparar

Namazın niyyətinə xüsusi ilə həssas olmaq lazımdır. Namazın niyyəti düz olarsa onun dəyəri çox-çox yüksəyə qalxar. Amma riyakarlıq namazı bir hala salar ki, insan bu .ibadətdən zərərdən başqa bir şey görməz

.Pərvərdigara bütün ibadətlərdə, xüsusən namazda bizə ixlas nəsib et



---

.Biharul-ənvar" ٧٠-ci cild" [١٢٥]-١

## :İYİRMİ BEŞİNCİ DƏRS

## RIYA

### NİYYƏT ƏSAS ŞƏRTDİR

Əvvəlki söhbətlərdə niyyətin əhəmiyyəti haqqın-da danışdıq. Qeyd etdik ki, ilahi niyyət bütün əməllərə ibadət rəngi verə bilər. Amma elə xüsusi ibadətlər var ki, bu ibadətlərdə ilahi niyyət olmasa insan cəhənnəm əzabına düçar olar. Yə`ni bu əməllərdə əməlin qəbul olmasından ötrü niyyət çox mühüm şərtdir. Namazdan əlavə .bir çox ibadətlər də var ki, onlarda da riyakarlıq olarsa həmin əməl batil olar

Allahın razılığını qazanmaq niyyəti ilə yerinə yetiriləcək ibadətlər iki qismdir: yalnız Allahın qarşısında bəndəliyin izharı üçün yerinə yetirilən oruc və namaz kimi ibadətlər .və Allaha yaxınlaşmağa səbəb olan xums və zəkat kimi ibadətlər

Birinci qism ibadətlərdə niyyət ibadətin əsas şərtidir. Yə`ni niyyət düzgün deyilsə, ibadət qəbul deyil. Riya bu ibadətləri puça çıxarır. Amma infaq kimi ikinci qism əməllərdə ilahi niyyət yoxdursa nə savab var nə də cəza. Yə`ni başqalarına görə namaz qılan günah qazanırsa, başqalarına görə də sədəqə verən, bir növ, pulunu çölə

tökür. Sədəqə, zəkat kimi əməllər yalnız o zaman faydalı olur ki, Allahın razılığını .qazanmaq məqsədi ilə yerinə yetirilsin

## RİYA VƏ ONUN NİŞANƏLƏRİ

Əməllərini ibadətə çevirmək istəyən insan bu əməlləri riyasız, xalis niyyətlə yerinə yetirməli-dir. Hədisi-qüdsidə belə buyurulur: "Hər hansı müştərək işdə çalışan hər insanın qazancdan öz payı var. Allah-təala buyurur ki, mən ən yaxşı şərikəm, çünki bütün payımı şəriklərimə verirəm. Əgər qıldığımız namazın doxsan doqquz faizi mənə, bir faizi camaata görə olubsa, mən öz payımdan keçirəm".(١) Burada Allahın öz .payından imtina etməsi əməlin batil olmasına işarədir

Xalis niyyət birdən–birə ortaya çıxmır və belə bir niyyətə nail olmaq üçün mə`rifət, iman, diqqət kimi ilkin hazırlıqlara ehtiyac var. Niyyətin xalis olub–olmadığını tə`yin etmək üçün müxtəlif yollar var. İnsan diqqətli olsa, xalis niyyəti tanıya bilər. Məsələn, Allahın razılığı-nı qazanmaq üçün xəstəxana tikən insana fərqi yoxdur ki, bu xəstəxananın qapısı üstə onun adı yazılacaq, yoxsa yox. Təəssüf ki, bə`ziləri tikdiyi məscidin divarına öz adını həkk edir. Belə insanların niyyəti xalis deyil və onlar xalqdan .təşəkkür gözləyir

Bə`zən insan öz əməlindəki riyanı hiss etmir və elə düşünür ki, niyyəti xalisdir. Əxlaq alimləri insanların diqqətini öz nöqsanlarına yönəldir və onlara gizli riyakarlığı tanıtdırır. Sizin evdə və ya məsciddə və yaxud da məsciddə başqaları olanda və ya olmayanda qıldığınız namazların sizin üçün fərqi varmı? Əgər fərqi varsa, bu fərqi doğuran riyadır. Əgər məscidə daxil olarkən həmişə namaz qıldığınız yerdə başqası-nı görüb, kənarda namaz qıldığınız zaman narahat olursunuzsa niyyətiniz xalis deyil. Mərhum Hacı Mirza



---

.Üsuli–kafi" ٢-ci cild, ٢۵٩-cu səhifə" [١٢۶] -١

Cavad Ağa Məlıki Təbrizi “Namazın sirri” kitabında belə bir əhvalat nəql edir: “Tanınmış insanlardan biri böyük alimlərdən birinin pişnamaz olduğu cəmiyyət namazında iştirak edər və həmişə birinci cərgədə eyni yerdə dayanardı. Bir dəfə məscidə daxil olarkən birinci cərgə dolduğundan ikinci cərgədə durmağ ona ağır gəlir və xəcalət çəkir. Az sonra anlayır ki, bu günə qədər qıldığı namazlarda camaatın .”nəzərini güdüb və ötən otuz ilin namazını yenidən qılır

Əgər pişnamaz namazda səhvə yol verərkən xəcalət çəkərsə, bilsin ki niyyəti xalis deyil. Çünki bu xəcaləti doğuran xalqın nəzəridir. Əgər məscidə daim dostu ilə gedən kəs dostu olmayanda məscidə getmirsə, mə`lum olur ki, bu vaxta qədər məscidə xalis .niyyətlə getməyib

Namazın sirri” kitabında növbəti qəziyyədə nəql olunur: “Məhərrəm günlərində hər“ gün eyni bir məclisdə iştirak edən şəxs bir gün özünə sual verir ki, əgər mən Allahın razılığı üçün imam Hüseynə (ə) ağlayıramsa nə üçün onun adına qurulan məclislər arasında fərq qoyuram? Sonra bu şəxs yalnız öz nəfsinə xoş gəlməyən əzadarlıq .məclislərində iştirak etməyə başlayır

## GÖZƏ GÖRÜNMƏZ RİYA

Xalis ibadət o qədər dəyərlidir ki, bə`zən mələklər də onun qiymətini tə`yin edə bilmirlər. Amma əməlin niyyəti xalis deyilsə, bu əməl zəhərli qida tək öldürücüdür. İslam hökümlərinə görə bir damla qan bir qab şərbəti murdarlayır. İbadət də belədir. Bir damla riya min bir zəhmətlə yerinə yetirilmiş ibadəti puça çıxarır. Allah mələklərə göstəriş verir ki, bu əməli sahibinə qaytarın. Ona görə də ibadətin düzlüyündən əlavə, onun niyyətinin xalisliyinə də diqqətli olmaq lazımdır. Bu məsləyə biganəlik göstərsək .ömrümüzün sonunda ibadət baxımından əliboş qala bilərik

Həzrət Peyğəmbər (s) bir rəvayətdə riyanı şirk adlandırdıqdan sonra belə buyurur: “Şirk qaran-lıq gecənin dərinliyində qara daş üzərində olan qarışqadan da məxfidir”.(١) İslam Peyğəmbəri (s) şirki elə bir şeylə müqayisə edir ki, bunun nə səsi eşidilər, nə də özü görünər. İnsanın qəlbindəki şirk bundan da məxfidir. Riya da şirkin bir növü olduğundan insan bə`zən özündəki riyakarlığı hiss etmir. İnsan həm Allahdan istəməli, .həm də özü çalışmalıdır ki, etdiyi ibadətdə şirk və riya olmasın

### HİDAYƏT VƏ RİYAKAR TƏBLİĞ

Bə`zi ibadətlərdə riyanı tanımaq asan olur. Dinin təbliği, minbərdən moizə xalqın hidayə-tinə yönəlmiş böyük ibadətlərdəndir. İslam Peyğəmbəri (s) Həzrət Əliyə (ə) belə buyurur: “Əgər Allah sənin əlinlə bir nəfəri hidayət edərsə, bu sənin üçün günəşin işıqlandırdığı (zülmətdən qurtardığı) şeydən daha üstündür”.(٢) Hədisdən göründüyü kimi xalqın hidayəti təsəvvürə sığmaz savablara malikdir. Amma bu işdə də ilkin şərt .niyyətdir. Bu savablar yalnız təbliğ və minbəri Allahın razılığı üçün olan insanlara aiddir

Bəs bu işdə riyanı necə tanımaq olar? Əgər bir təbliğçi başqa bir təbliğçinin tə`siri nəticə-sində bir nəfərin hidayət olmasından sevinirsə, demək, o, Allahın razılığını düşünür. Əgər təbliğçinin əsas məqsədi minbərdən kimin danışmağı yox, insanların tərbiyəsidirsə, bu məqsəd riyadan uzaqdır. Əgər təbliğçi minbərdən başqası danışarkən narahat olursa ortada riya var. Xalis niyyətli insan anlayır ki, onun tikdiyi xəstəxananın qapısı üstünə başqasının adı yazılsa da, savab ona çatır. Fikiri–zikri .Allahın razılığını qazanmaq olan insanı bu razılıqdan başqa heç nə maraqlandırmır



---

١- [١٢٧] “Vəsailuş–şiə” ١۶–cı cild, səh. ٢۵۴.

٢- [١٢٨] “Biharul-ənvar” ٣٢–ci cild.

Əlbəttə ki, belə bir niyyət asanlıqla ələ gəlmir. Xalis niyyətli əməllə riya niyyətli əməl arasında yerdən göyə qədər fərq var. Yalnız Allahın razılı-ğını qazanmaq məqsədi ilə .görülmüş kiçik bir iş insana nicat verdiyi halda, yüz illərin saxta ibadəti faydasız olur

### RİYA VƏ İXLAS HAQQINDA BİR HEKAYƏT

Mərhum Əllamə Məclisi din və məzhəbə çox böyük xidmətlər göstərmiş şəxsiyyətdir. Alimin vəfatından sonra yaxınlarından biri onu yuxuda görüb soruşur ki, köməyinizə hansı əməl çatdı? Əllamə Məclisi belə cavab verir: "Əməllərimin heç biri gözlədiyim nəticəni vermədi. Sorğu zamanı mə`lum oldu ki, bütün əməllərim nöqsanlıdır. Amma bir iş karıma gəldi. Bir gün əlimdə alma küçədən keçərkən qucağında körpə uşaq bir qadınla üz–üzə gəldim. Qadın mənim bərabərimə çatanda uşaq əlini almaya uzatdı. Ana dərhal uşağının əlindən tutub çəkdi. Mən uşağı sevindirmək üçün almanı ona verdim ... Bir ömür gördüyüm işlər arasında yalnız bu iş xalis çıxdı. Bu işə görə aldığım savab bütün savabları üstələdi. Yazdığım kitabların nöqsanı bu oldu ki, kitabların üstündə adım yazılmışdı. Bu adı görənlər ünvanıma tə`rif yağdırmışdı-lar. Amma doğrudan da almanı uşağa verəndə yalnız Allaha xatir onun qəlbini sevindirmək ."istəmişdim

Bəli, Allah qarşısında ən qiymətli şey ixlas, saf niyyətdir. Allah öz bəndələrini riyakar, saxtakar görmək istəmir. Allah yalnız saf niyyətli əməlləri qəbul edir və yarı Ona, yarı başqasına görə olan əməldə öz payını qaytarır. Allah əməlin böyük–kiçikliyinə yox, hansı niyyətlə yerinə yetirildiyinə baxır. Əməlin ruhu niyyətdir. İnsan heç zaman öz ibadətləri və digər saleh işləri ilə öyünməməlidir. Çünki bu əməllərdə gizli riya olarsa, !nəticədə əlimiz boş qala bilər

## :İYİRMİ ALTINCI DƏRS

### NIYYƏT VƏ ONUN MƏRTƏBƏLƏRI

### ALLAHA GÖRƏ GÖRÜLƏN İŞİN MƏFHUMU

Sözbətimizin mövzusu ibadətin niyyəti idi. Qeyd etdik ki, bütün əməllərin dəyəri niyyətdən asılıdır. Namaz kimi bir sıra xüsusi ibadətlər-də niyyət saf

olmazsa, bu əməllər nəinki fayda verməz, hətta əzaba səbəb olar. Riyanın əlamətlə-rindən danışdıq və dedik ki, əməlin faydalı olması üçün riyadan çəkinmək lazımdır. Riyanın ziddi ixlasdır. Bəs ixlas nədir? Məgər Allahın ehtiyacı varmı ki, biz bütün işləri onun razılığı üçün görək? "İnsan" surəsinin ٩-cu ayəsində buyurulur: "(Müxlis bəndələr deyər:) Biz sizi yalnız məhz Allah rizasından ötrü yedirdirik. Biz sizdən (bu ehsan müqabilində) nə bir əvəz və nə də bir təşəkkür istəyirik." Burada incə bir nöqtəyə toxunmaq lazım gəlir. Əksər fəqihlərin fikrincə ibadət Allaha itaət məqsədi ilə yerinə yetirilməlidir. Bunun digər bir ifadə vasitəsi "Allaha yaxınlaşmadır" yə`ni ibadətdə məqsəd bəndənin Allaha yaxınlaşması-dır. Qarşıdakı söhbətlərdə çalışacağıq ki, "Allaha görə əməl" ifadəsini bir qədər də aydınlaşdıraq.

### NİYYƏTİN NÖVLƏRİ

İbadətdə niyyətin bir mə`nası da budur ki, insan əməl zamanı bu əməlin ilahi mahiyyətinə diqqət yetirsin. Bəs necə ola bilər ki, müəyyən bir əməl niyyətsiz yerinə yetirilsin? Əlbəttə, normal insan niyyətsiz iş görmür. Amma müəyyən hallarda insanın fikri yayına bilər. Məsələn, yuxulu insan gördüyü işə bir o qədər də fikir vermir. Bu halda qılınan namazı da düzgün saymaq olmaz. Çünki yuxulu insan hansı niyyətlə iş gördüyündən xəbərsiz olur. Niyyətsiz namaz isə batildir.

İnsan dünyəvi məqsədlərinə çatmaq üçün də ibadət edə bilər. Peyğəmbər dövründəki münafiq-lər məhz bu niyyətlə namaz qılırdılar. Onlar öz canlarını, mallarını qorumaq üçün dinin zahiri hökümlərini yerinə yetirirdilər. Əlbəttə ki, bu məqsədlə qılınan namazlar batil olur.

Aydın olur ki, hər hansı bir işdə insanın niyyəti fayda götürmək və zərərdən qaçmaqdır. Amma fayda və

zərəri hərə bir şeydə görür. Bəşəriyyətin bir hissəsi dini faydalı hesab edirsə, digər bir hissəsi zərərli olmasından danışır. Deməli, insanları firqələrə bölən də onların xeyir və şər barəsində yürütdükləri nəzəriyyələrdir. Amma insan nəyin xeyir, nəyin şər olduğunu Allahdan öyrənməlidir. Allahın buyuruqları isə yalnız iman gətirənlər üçün əhəmiyyət daşıyır. Demək, mö`minlər ibadəti faydalı bilir və bu istiqamətdə çalışırlar. Əlbəttə ki, bu istiqamətdə də niyyətlər fərqlənir. Bə`ziləri ibadət edərkən axirət dünyasını fikirləşirlərsə, bir başqaları ibadət vasitəsi ilə dünya səadətinə çatmaq istəyirlər. Namaz qılmaqla bərəkətə, sədəqə verməklə bəladan uzaqlaşmağa çalışanlar var. Beləcə, əksər namaz qılanlar Allahın əmrinə itaət etməklə yanaşı behişt arzusunda olur, cəhənnəm əzabından nicat tapmaq istəyirlər. Əgər cəhənnəm olmasaydı, şəksiz ki, çoxları namaz qılmazdı. Qur`ani-kərimdə buyurulur: "Vay olsun öz namazından qəflətdə olan namaz qılanlara"(۱); "Günahkar-lardan soruşarlar ki, sizi oda salan nə oldu? Cavab verər ki, biz namaz qılanlardan deyildik".(۲) Bu ayələr insanı namaza sövq edir. Bəli, Allahın əzabı olmasaydı, çoxları namazdan çəkinərdi. Görən, ?bu niyyətlə qılınan namaz qəbuldurmu

Bə`ziləri isə behişt ne`mətlərinə görə namaz qılır. Onlar bilirlər ki, Allah–təala Ona ibadət edən bəndələri üçün misilsiz ne`mətlər hazırlamışdır. Onlar bu ne`mətlərdən məhrum olmamaq üçün namaz qılırlar. Bu sayaq ibadəti düzgün saymaq olarmı? ?Sadalanan bu məqsədlər namazın niyyətinə tə`sir etmirmi

Əlbəttə övliyaların ibadəti adi insanların ibadətindən fərqlənir. Övliyalar Allaha behişt .və cəhənnəmə görə yox, Onu ibadətə layiq bildikləri üçün ibadət edirlər



---

.Maun" surəsi, ayə: ۴-۵" [۱۲۹]-۱

.Muddəssir" surəsi, ayə: ۴۰-۴۳" [۱۳۰]-۲

Mə`sumlar (ə) Allaha belə dua edirlər: "Pərvərdigara, başımı-za bəla yağdırsan da Sənə ibadətdən əl çəkməyəcəyik!" Biz də Allahdan istəməliyik ki, bu sayaq ibadəti bizə .də nəsib etsin

### DÜZGÜN NİYYƏT

Bə`zi rəvayətlərə görə ibadətlər üç qismə bölünür. Bu rəvayətlərə görə ibadətin bir növü "qulların ibadətidir". Ağasından qorxduğu üçün ona itaət edən qul kimi bə`ziləri Allaha cəhənnəm əzabı qorxusundan itaət edərlər. İkinci növ ibadət "tacirlərin ibadətidir". Tacir qazanc üçün çalışdığı kimi bir qrup insan da behişt ne`mətlərini əldə etmək üçün sə`y göstərərlər. Bu insanların namazı, orucu, cihadı, hər bir əməli qazanc üçündür. "Səf" surəsinin ١٠-١١-ci ayələ-rində oxuyuruq: "Ey iman gətirənlər! Sizi ağrılı əzabdan qurtara bilən bir ticarət göstərimmi? Allaha və onun peyğəmbərinə iman gətirərsiz, malınızla və canınızla Allah yolunda cihad edərsiz. Əgər bilsəniz, bu sizə daha xeyirlidir." "Tövbə" surəsinin ١١١-ci ayəsində isə belə buyurulur: "Şübhəsiz ki, Allah mö`minlərin canlarını və mallarını haqq olaraq və`d edilmiş cənnət qiymətinə almış-dır". Bu ayələrdən mə`lum olur ki, behişt tamahı və cəhənnəm qorxusu ilə yerinə yetirilən ibadətlər ali ibadət olmasa da qəbuldur. Əlbəttə ki, yalnız axirətə inanan insan behişt tamahı, cəhənnəm qorxusuna görə sədəqə verər, oruc tutar, cihada gedər. Əlbəttə insan imanının bu mərtəbəsi ilə kifayətlənməməlidir. İnsan elə bir məqama nail olmalıdır ki, Allahı ibadətə layiq bilərək itaət etsin. Belə bir itaət ən .üstün itaətdir

Qəribəliklərlə dolu dövrümüzdə əslində e`tiqadı nöqsanlı olan müəyyən insanlar behişt və cəhənnəmə görə ibadəti əxlaqa zidd hesab edirlər. Bəs bu təbəqənin Allahı ibadətə layiq bilib Ona ibadət edən övliyalarla fərqi nədir? Övliyalar özləri behişt və cəhənnəmə xatir

ibadət etməsələr də, behişt və cəhənnəmə xatir ibadəti məqbul bilirlər. Cəhənnəmdən qorxub qeybət etməmək üçün böyük iman lazımdır. Əgər behişt istəyi və cəhənnəm qorxusu insanı xeyirxahlığa, ədalətə, fədakarlığa sövq edirsə, bunun nəyi pisdir? Deməl, süfrəsində Allahın haram buyurduğu şərabla dolu badələr düzüldüyü halda "qorxudan və tamahdan qaynaqlanan" ibadəti əxlaqsızlıq adlandıranların özlərində axirət e`tiqadı yoxdur. Axirətə inamsız insanın isə Allahı olduğu kimi tanıyıb, Ona e`tiqad etməsi qeyri-insani-mümkündür. Deyilənlərə sübut olaraq məşhur bir hədisə müraciət edirik. Həzrət Əli (ə) buyurur: "Bir dəstə insan hədiyyə ümidi ilə Allaha pərəstiş edir–bu, tacirlərin ibadətidir. Başqa bir dəstə Allaha qorxudan ibadət edir–bu, qulların ibadətidir. Digər bir dəstə isə Allaha təşəkkür üçün ibadət edir–bu, azadların ibadətidir".(۱)

Hədisdə "hürr" adlandırılan bu insanlar cəhənnəm qorxusu və behişt tamahından azad olanlardır. Bu insanları hər şeydən əvvəl Allahın razılığı maraqlandırır. Onlar bu razılığı qazanmaq üçün hər cür əzab-əziyyətə dözməyə hazırdırlar. İmam Səccad (ə) bir münacatda belə buyurur: "And olsun izzət və cəlalına, əgər Sənin razılığın mənim tikə-tikə doğranıb, ən çətin halda ölməyimdə olsa, yenə də, Sənin razılığını daha əziz tutaram".(۲)Bu sözlərə əməl etmək olduqca çətindir. İmam Sadiqin (ə) bu buyuruğunu bir saat işgəncə altında qalan insan dərk edər. "Kumeyl" duasında oxuyuruq: "Pərvərdigara, tutalım, Sənin əzabına səbr etdim, bəs Səndən uzaqlığa necə dözərəm?" Şe`rdə bu sözləri işlətmək daha asandır. Amma oxuduqlarımız şe`r yox, mə`sumların (ə) dilindən qopmuş həqiqətdir. İmam Səccad (ə), Həzrət Əli (ə) kimi mə`sumlar daim



---

۱- [۱۳۱] "Nəhcül-bəlağə".

۲- [۱۳۲] "Biharul-ənvar" ۷۷-ci cild.

Allaha yaxın olduqların-dan Ondan uzaqlığı özləri üçün əzab hesab edirlər. Amma bu yaxınlığı duymamış adi insanlar üçün Allahdan uzaqlıq da bir o qədər əzabverici görünmür. Vüsalı dadmayan fərağı dərk etməz. Amma Mə`sum İmamlarımız (ə) öz ardıcıl-larına belə bir məqamın mövcudluğu haqqında mə`lumat vermişlər ki, onlar da bu məqama çatmaq üçün sə`y göstərsinlər və yalnız dünyəvi ləzzətlər sorağında olmasınlar. İnsan təkcə axirət ne`mətləri barədə düşünməklə kifayətlənməməli, Allahın razılığını qazanmaq üçün sə`y göstərməlidir.

Dünyəvi eşqə mübtəla olanlar mə`şuqun razılı-ğının necə dəyərli olduğunu gözəl bilirlər. Aşiq bir anlıq mə`şuqun çöhrəsini görmək üçün gecəni sübhədək qışın şaxtasında ayaqyalın buz üstə durmağa hazır olur. O, öz məhbubunu görərkən bütün ağrılarını unudur. Övliyalar üçün Allahla yaxınlıq bu dəyərə malikdir. Onlar Allahın razılığını qazanmaq üçün bütün ağrı-acılara dözməyə hazırdırlar, hətta cəhənnəm əzabı olsa belə!

### NİYYƏTİN ALİ MƏRTƏBƏSİ

İnsan elə bir məqama çata bilər ki, Allaha nə behişt tamahı üçün, nə də cəhənnəm qorxusundan ötrü, bəlkə, onu ibadətə layiq bildiyi üçün ibadət edər. Amma bu məqamın da müxtəlif mərtəbələri vardır.

Həzrət Əli (ə) buyurur ki, bir qism insan Allaha təşəkkür üçün ibadət edirlər. Onları rükuya, səcdəyə gətirən nə behişt istəyidir, nə də cəhənnəm qorxusu. Bu insanlar Allahın ne`mət-ləri müqabilində şükr edirlər. Bu, “haqqı itirməmək” ruhiyyəsidir. Onların vicdanı ilahi ne`mətlərin şükrünü yerinə yetirməyi hökm edir. İnsanın yaxşılıq müqabilində təşəkkür etmək istəyi onun fitrətində var. “Loğman” surəsinin ۱۴-cü ayəsində buyurulur: “Biz insana ata–anasını tapşırdıq. Anası onu getdikcə artan zəifliklə daşıdı və süddən kəsilməsi iki il çəkdi. Mənə və ata–anana şükr et.

Axır dönüş Mənə sarıdır”. İnsan ata-ananın zəhmətini daha tez hiss edir. O, ananın yuxusuz gecələrini, atanın zəhmətlərini daha asan dərk edir. Ona görə də insan ata–ananın qarşısında özünü borclu bilir. Bu hiss illər ötdükcə güclənir və xarakter halına çevrilir. İnsan bütün yaxşılıqlara təşəkkürlə cavab verməyə başlayır. Bütün ne`mətlərin Allah tərəfindən əta olunduğunu anlayan insan Allaha təşəkkür etməyi özünə borc, vəzifə bilir. Bu məqamı bəyan edən digər bir tə`bir məhəbbətdir. Əgər iki nəfər arasında həqiqi məhəbbət olarsa, onlar bir-birlərinin yolunda istənilən əzaba qatlaşar və bu əzaba görə heç bir qarşılıq istəməzlər. Xalis məhəbbət olan qəlbə müxtəlif meyllər daxil ola bilməz. Bütün diqqətin məhbuba yönəldiyi könüldə behişt, huri istəyi müşahidə edilməz. Həzrət Əli (ə) buyurur: “Pərvərdigara, mən Sənə behişt həvəsi, cəhənnəm qorxusuna görə ibadət etmədim. Səni pərəstişə layiq bildiyim üçün ibadət etdim. Səndən başqa pərəstişə layiq olan kəs tapmadım. Sənə pərəstiş etməyim, kimə edim? Sənə könül verməyim, kimə verim?”(١)

#### NİYYƏTİN TƏDRİCƏN SAFLAŞDIRILMASI

Müxtəlif qavrayış səviyyələrinə malik olan insanlar üçün niyyətin müxtəlif mərtəbələrinin olması bəyan olundu. Hər bir şəxs aşağı mərtəbədən başlayıb tədricən yuxarı mərtəbələrə qalxmalıdır. İlkin mərtəbə cəhənnəm qorxusudur. Mə`sum İmamların (ə) bir çox münacatları bu ruhiyyədədir. İmam Səccad (ə) belə dua edir: “Əgər bu halda qəbrə qoyulsam, məndən pis vəziyyətdə olan tanılarmı? Axı bu qəbri yatmaq üçün hazırlama-mış, ora saleh əməldən xalı döşəməmişəm! Başıma gələcək işləri bilmirəmsə, necə ağlamayım?! Nə üçün ağlamayım? Bədənimdən ruhun çıxması, qəbrimin qaranlığına görə ağlayıram. Nəkir və Münkərin sual verəcəyi anın səh:١٩٥

---

١-[١٣٣] “Biharul-ənvar” ٧٠-ci cild.

qorxusun-dan ağlayıram. Məhşərdə qəbirdən üryan çıxacağım, günah yükümün ağırlıq edəcəyi saata görə ağlayıram!"

Əgər insan qəbirdən, qiyamətdən, əzablardan həqiqətən qorxarsa, daim Allahı xatırlayar, günaha yol verməz. Qur`ani-kərimdə bu əzablar təkrar–təkrar insana xatırladılır: "Onu tutub bağlayın, sonra cəhənnəmə atın, sonra onu uzunluğu yetmiş zər` olan zəncirlə bağlayın!"(١) Odun istisindən təşnə olana içməyə nə verilir? "...Ona irinli sudan içirdiləcəkdir".(٢)

Biz bu məsələlərə ciddi yanaşmalı, bu barədə ətraflı düşünməliyik. "Biharul-ənvar"ın ٨-ci cildində nəql olunmuş bir rəvayətə görə cəhənnəm içkisindən bir damla bu dünyaya düşərsə, onun üfunətindən bütün canlılar məhv olar. Əksinə, behişt içkilərindən bir damlası dünya sularına qatılsa, bütün sular ətirli olar. İnsan dünya əzablarını yox, axirət əzablarını daim düşün-məli və axirət qorxusunun insana göstərdiyi tə'sirindən faydalanmalıdır.

## ALİ NİYYƏT VƏ İBADƏTİN BƏ`Zİ NÜMUNƏLƏRİ

Böyük alimlərin həyatını əks etdirən söhbətlər insana olduqca müsbət tə'sir göstərir. Nəql edirlər ki, bir gün mərhum Şeyx Ənsari dərsdən evə qayıdırdı. Həmin vaxt Nəcəfdə istilik ٥٠–yə çatırdı. Mərhum Şeyx susayır və bir evdən içmək üçün su istəyir. O zaman hələ soyuducu yox idi və suyu sərin saxlamaq üçün kuzələri xüsusi quyulara sallayırdılar. Su gətirməyə gedən şəxs bir qədər yubanır və geri qayıtdıqda görür ki, Şeyx namaz qılır!



---

١- [١٣۴] "Haqqə" surəsi, ayə: ٣٠-٢٢.

٢- [١٣۵] "İbrahim" surəsi, ayə: ١۶.

Bəli, böyük şəxsiyyətlər vaxtın qədrini bilmiş, ondan daim səmərəli istifadə etmişlər. Dövrü-müzdə mə`nasız əyləncələrə, krassvord doldurmağa nə qədər vaxt sərf edilir?! Kimi susuzluqdan ciyərləri yanan halda namaz qılır, kimi də kondisionerli otaqda oturub krassvord doldurur! Namaza məşğul olan Şeyxə su gəlir, günün istisində qızır. Şeyx namazını bitirib həmin isti suyu içir və yoluna davam edir. Bəli, namazdan aldığı ləzzət Şeyxə susuzluğu unutdurur!

Belə söhbətlərdən aydın olur ki, imanın bizə mə`lum olmayan ali mərtəbələri vardır. Hər bir insan dua və zəhmətlər sayəsində bu mərtəbələri seyr edə bilər. Hər halda tamah və qorxudan ibadət olan aşağı mərtəbə ilə kifayətlənmək olmaz.

İrəli getmək üçün, məsələn, gündə "Allahı ibadətə layiq bilmək" niyyəti ilə iki rək`ət namaz qılmaq olar. Çalışaq ki, bu iki rək`ət namazda behişt tamahından, cəhənnəm qorxusundan uzaq olaq.

Həzrət Musa (ə) Tur dağına gedib, münacat və dua üçün orada ۴۰ gün qalır. "Ə`raf" surəsinin ۱۴۲-ci ayəsində buyurulur: "Musa ilə otuz gecə və`dələş-dik və bu vaxtı daha on gecə ilə tamamladıq. Beləliklə, Rəbbinin müəyyən etdiyi vaxt qırx gecədə başa çatdı". Bu qırx gün Zil-qə`də ayının birindən Zil-həccə ayının onunadək olan vaxta təsadüf edir və "ərbəini–kəlimiyyə" adlanır. Bu dövrdə "la ilahə illəllah" deməyin böyük savabı var. Heç bir əvəz ummadan bu zikri təkrarlamağın çox faydası var. Bəli, məhz belə aşağı mərtəbələrdən başlayıb ali mərtəbəyə doğru hərəkət etmək lazımdır.

## İYİRMİ YEDDİNCİ DƏRS:

### NAMAZ RUHİYYƏSİ AXTARIŞINDA (۱)

### HƏQİQİ NAMAZ

Son söhbətimiz namaz haqqında oldu. İslam mənbələrindən mə`lum oldu ki, Allaha yaxınlaşmaq

üçün ən mühüm əməl namazdır. Həqiqi namazın səciyyəvi xüsusiyyətləri sadalandı. Bəli, hər gün beş dəfə azan və iqamədə təkrar etdiyimiz kimi, namaz ən xeyirli əməldir. ."“Namaz mö`minin me`racıdır

Təəssüf ki, qılıdığımız namazlardan lazımın-ca bəhrələnə bilmirik. Çoxlarımız namazdan ləzzət duymur, özümüzdə namazın tə`sirini hiss etmirik. Namaz, adətən, bizə ağır, çətin gəlir. Namazı qılıb qurtardıqda sanki çiynimizdən ağır bir yük götürülür. Ən uzağı on dəqiqə davam edən namaz bizim üçün sanki uzun saatlara başa gəlir. Namazı qurtaranda qəfəsdən azadlığa çıxmış quş tək rahatlanırıq. Namazın son cümləsini deyib qurtaran kimi tələsik dünya işlərinin ardınca qaçırıq. “Bəqərə” surəsinin ۴۵–ci ayəsində buyurulur: “Doğrudan da Allahdan qorxanlar istisna olmaqla, namaz hamı üçün çətindir”. Sözsüz ki, dəyərsiz də olsa, namaz qılmaq qılmamaqdan üstündür. İnsan məs`uliyyət hiss edərək günün müəyyən vaxtını Allah hüzurunda namaz üçün dayanırsa, bu böyük işdir. Amma insan bilməlidir ki, qaydasınca qılınan namaz ən xeyirli əməldir. Həqiqi namazla bizim namazımız arasında olduqca böyük fərq var. Namazın faydalarından məhrum olmağımızın əsas səbəbi onun zahiri ilə kifayətlənib, ruhundan xəbərsiz qalmağımızdır. Əgər namaz qılan dediyi sözlərin, etdiyi hərəkətlərin mahiyyətinə varmırsa, namaz-dan ləzzət duya bilməz. Kor-koranə icra olunan namaz me`rac hesab edilə bilməz. Bəli, bir sıra sözlərin və hərəkətlərin .nümayişindən ibarət olan bir əməl həqiqi namaz deyil

Namazın uzun çəkməsi vacib deyil. Qəlbin iştirakı ilə qılınan qısa namaz mö`cüzələr yarada bilər. İnsan belə namazın tə`sirini özündə hökmən hiss edir. Məhz belə namaz haqqında buyurulur: “Doğrudan da namaz insanı pis və çirkin işlərdən uzaqlaşdırır”.(۱) Amma



---

.Ənkəbut” surəsi, ayə: ۴۵“ [۱۳۶] -۱

buna baxmayaraq, bir çoxları məsciddən çıxan kimi günah ardınca qaçır. Bəli, ruhsuz namaz insanı haramdan çəkindirmək iqtidarında deyil. Həqiqi namazqılan şəxs qeybətdən, yalandan, böhtandan və bir sıra başqa çirkin sifətlərdən uzaqdır. İslam Peyğəmbəri (s) buyurur: "Beş vaxt namaz qılan kəs evinin qarşısında axan çayda gündə beş dəfə yuyunan adam kimidir. Onda bir çirkinlik qalarmı?"(١) Amma biz beş vaxt namaz qılsaq da çirkin sifətlərdən uzaqlaşa bilmirik. Çünki bizim qıldığımız namaz !əsl namaz deyil

## HƏQİQİ NAMAZA DOĞRU İLK ADDIM

Həqiqi namaza nail olmaq üçün atılan ilk addım namaz zamanı diqqətli olmaqdır. İnsan bə`zən namaz zamanı "həmddən" "surəyə" necə keçdiyini hiss etmir. Hətta belə də olur ki, insan yalnız namazın son cümləsini deyərkən namaz qıldığını xatırlayır. Belə bir hal namazda diqqətsiz olmaqdan xəbər verir. Əlbəttə ki, namaz qılan bütün namazlarda zəif də olsa müəyyən qədər diqqətli olur. Amma zəif diqqət namazın ruhunu dirildə bilmir. İnsan təkbirətül–ehram deməzdən qabaq kimin hüzurunda dayandığı barədə düşünməlidir. Müəyyən bir mətni kimin üçünsə oxuyan şəxs başa düşüləcək şəkildə oxumağa çalışır. Namaz qılan şəxs namazın sözlərini ən azı yuxarıda deyilən qaydada oxumalıdır. Yalnız aram və aydın qiraət zamanı namazda diqqəti .cəmləmək mümkündür

## İKİNCİ ADDIM

İnsan namazda dediyi hər bir cümlənin mə`nasına diqqət yetirməlidir. Bunu, tədricən də olsa, yaratmaq lazımdır. Hər cümləni deməzdən əvvəl, bu cümlənin mə`nasını ,düşünüb sonra demək daha yaxşıdır. Məsələn



---

.Biharul-ənvar" ٨٢–ci cild" [١٣٧] -١

Əllahu əkbər” deməzdən qabaq Allahın əzəməti barədə düşünmək lazımdır. İnsan bu“ istiqamətdə çalışarsa, bir müddət sonra namazın sözlərinin mə`nasını düşünmək .xasiyyət formasını alır

Amma nəzərinizə çatdırdığımız iki addımı atmaqla həqiqi ibadətə nail ola bilmərik. Həqiqi namaza çatmaq üçün ən azı daha bir addım atmaq lazımdır. Məsələn, bir ateist Qur`anı çox diqqətlə oxuyub, onun hər kəlməsini başa düşürsə, bu işi ibadət hesab .etmək olarmı? Yəqin özünüz də hiss etdiniz ki, üçüncü addıma ehtiyac var

**ÜÇÜNCÜ ADDIM**

Bu yolda üçüncü addım insanın dili ilə dediklərinə qəlbən inanmasıdır. “Yalnız Sənə ibadət edir və Səndən kömək istəyirik” deyən insan Allahdan başqa heç kimsədən kömək intizarında olmamalıdır. “Əllahu əkbər” deyən şəxs üçün Allahdan böyük varlıq olmamalıdır. Doğrudanmı, hər bir namaz qılan öz dediklərinə qəlbən inanır? Doğrudanmı, inam və əməlimiz sözümüzlə uyğun gəlir? Əgər əməllərimizə nəzər salsaq görərik ki, bə`zən Allaha heç bir uşaq qədər də məhəl qoymuruq. Daim Allahın hüzurunda olduğu-muz halda, müəyyən məqamlarda bizə baxan uşaqdan çəkinirik, amma Allahı yada salmırıq. Uşağın yanında söyüş söyməkdən çəkinib, uşaq olmayan yerdə söyüş söyən şəxs Allahı böyük bilir, yoxsa uşağı? Demək, bə`zən Allahı uşaq !qədər də saymırıq

İnsanın sözünə uyğun gələn halının da müxtəlif mərtəbələri var. Müəyyən mərtəbələrə sə`y göstərməklə çatmaq olur. Bə`zi mərtəbələrə isə yalnız ali mə`rifətə malik övliyalar müyəssər olur. Mə`sum İmamlarda (ə) isə namaz zamanı olduqca yüksək bir ruhiyyə müşahidə edilir. Onlar namaz qılarkən bütün diqqətləri Allaha yönəlir. Nəql olunur ki, Həzrət Əlinin (ə) ayağına döyüş zamanı bir ox batmışdı. Heç vəchlə bu oxu çıxarmaq səh:٢٠٠

mümkün olmurdu. Bir gün Həzrət (ə) namaz qıldığı vaxt oxu onun ayağından çəkib çıxardılar. Bəli, adi vaxtda mümkün olmayan bir iş namaz vaxtı mümkün oldu və Həzrət Əli (ə) bu ağrını hiss etmədi.(١) Buna oxşar hadisələr Əhli–beyt (ə) məktəbi .davamçılarının həyatında çox müşahidə edilir

## MƏRHUM AYƏTULLAH XANSARİ HAQQINDA BİR HEKAYƏ

Nəql edirlər ki, mərhum alimin mə`dəsində cərrahiyyə əməliyyatı aparılmalı imiş. Bu əməliyyat üçün xəstəyə narkoz vermək zəruridir. Amma mərhum Ayətullah heç vəchlə razı olmur ki, onu bihuş etsinlər. Həkimlər onun mə`dəsini narkozsuz yarmağa məcbur olurlar. Alimin qarını yarılır, mə`dəsinin bir hissəsi götürülür. Bütün əməliyyat gedişində mərhum Xansari azca da olsa narahatlığını biruzə vermir. Həkimlər xəstənin .dözümündən heyrətə gəlirlər

Belə bir dözüm necə əldə edilə bilər? Sözsüz ki, yalnız bütün diqqəti Allaha yönəldib, özünü unudan insan bu ağrılara tab gətirə bilər. Cərrahi əməliyyat zamanı özündə bu halı yaradan insan, şəksiz ki, namazda da bu hala nail ola bilər. Allah–təala bu ali .məqamı hər birimizə nəsib etsin

## QƏLB NAMAZI

Namazdan bəhrələnmək istəyən hər bir şəxs həqiqi namaz qılmağa çalışmalıdır. Göstərilən proqramla hərəkət edən şəxs tədricən həqiqi namaza yol tapa bilər. Əvvəlcə namazın sözləri və hərəkətlərinə diqqət yetirmək lazımdır. Sonra deyilən sözlərin mə`nasını düşünmək zəruridir. Nəhayət, söz və hərəkətlərə uyğun qəlb haləti .əldə edilməlidir



---

.İrşadul–qulub”, ٢–ci cild, səh.٢١٧“ [١٣٨] -١

Əxlaq alimləri tövsiyə edirlər ki, hər bir namaz qılan dediyi sözləri qəlbinə daxil etsin. Diqqət edin, söhbət zehn yox, qəlbdən gedir. Yə`ni kafir də zehnini işə sala bilər. Məsələ deyilənləri zehindən keçirib anlamaqda yox, qəlbən qəbul etməkdədir. Mö`mini mö`min edən zehni təsəvvür yox, qəlbi razılıqdır. "Hucərat" surəsinin ۱۴–cü ayəsində oxuyuruq: "Ərəblər dedilər ki, iman gətirdik. De ki, iman gətirməyibsiniz, "İsla-mı qəbul etdik" deyin. İman hələ sizin qəlblərinizə daxil olmamışdır". Çoxları elə hesab edirdilər ki, şəhadət kələmələrini deyən hər bir kəs iman gətirmiş olur. Yuxarıdakı ayədən belə nəticə çıxır ki, şəhadət kələmələri-ni deməklə yalnız zahirən müsəlman olmaq mümkündür. Həqiqi iman insanın sözü yox əməli ilə sübuta yetir. Çalışmalıyıq ki, namazda dediklərimizi qəlbimizə daxil edib, əməldə sübuta yetirək. "Əllahu əkbər"deyən şəxs Allahdan başqasına ümid etməməlidir. Əgər zahirdə Allaha .səcdə ediriksə, bu səcdəni qəlbən təslim olmaqla gerçəkləşdirməliyik

## ?ƏFSANƏ, YOXSA HƏQİQƏT

Bə`zən həqiqi namaz haqqında deyilənlər bizə əfsanə kimi görünür. Çox təəssüf! Elə düşünürük ki, bu sözlər kimlərinsə şairlik təbindən qaynaqlanır. Hansı ki, bütün bu fikirlər ayə və hədislərə əsaslanır. Qur`ani-kərim mö`minlərin vəsfində belə buyurur: "Onlara Qur`an oxunan zaman üzü üstə səcdəyə düşüb deyirlər: "Allahımız hər bir nöqsandan pakdır və Onun və`dəsi hökmən yerinə yetəcəkdir." Onlar üzü üstə düşüb ağlarlar və qorxuları artar".(۱) Bəli, həqiqi mö`minlər Qur`an oxunarkən qorxuya bürünərlər. Onları bu işə də`vət edən olmasa da, fitri istək üzündən belə hərəkət edərlər. Qur`an dinləyərkən ağlayan insanlarla rastlaşsaq da, üzü üstə səcdəyə qapananlara



---

.İsra" surəsi, ayə: ۱۰۷-۱۰۸" [۱۳۹] -۱

təsadüf etməmişik. Bu, biz müsəlmanların Qur`an ideallarından nə qədər uzaq olduğunu göstərir. Əgər qədim zamanlarda bu hadisə çox baş vermişsə də, dövrümüzün baş gicəlləndirən mühiti insanları Qur`ani-kərim-dən çox uzaq salmışdır. İş o yerə çatıb ki, Qur`an dinləyərkən, namaz qılarkən ağlayan insanlara istehza edilir. Görən, Qur`ani kərimin vəsf etdiyi bir halı bid`ət saymaq olarmı? Bəs din, dindar hansı yolla tanınmalıdır? "Hədid" surəsinin ۱۶-cı ayəsində buyurulur: "İman gətirənlərin qəlblərinin Allahın zikri və haqqdan nazil olan (Qur'an) üçün yumşalması vaxtı gəlib çatmadımı?! Onlar özlərindən əvvəl kitab verilən kimsələr kimi olmasınlar ki, onlarla (öz peyğəmbərləri arasında) uzun bir müddət keçmiş və qəlbləri sərtləşmiş-dir". Bəli, Qur`an ayələrinin tə`siri altında qəlbinin buzu əriyənlər az deyil. Nə üçün biz belə olmayaq? Donmuş vəziyyətdən qurtarmağın zamanı gəlib çatmayıbmı?!

Məşhur bir hadisəni bir daha xatırlayaq: Fuzeyl tanınmış və zalım bir quldur olmuşdur. Bir dəfə o, gecə yarı mö`min bir şəxsin evinə soxulmaq istərkən ev sahibinin Qur`an oxuduğunu eşidir. "Qəlblərin yumşalma vaxtı çatmayıbmı" ayəsi Fuzeylin qəlbini silkələyir. Ayədən tə`sirlənmiş quldur öz-özünə pıçıldayır: "Nə üçün çatmayıb, çatıb!" Bir ayənin tə`siri ilə dövrün tanınmış qulduru həqiqi tövbə edib, tezliklə övliyalar cərgəsinə qoşulur!

Bəs bizim qəlblərimiz nə vaxt yumşalacaq? Bəs biz nə vaxt dediyimiz sözlərə qəlbən bağlanacağıq? Nə vaxtsa qəlbimiz namazda iştirak edəcək, yoxsa yox? Pərvərdigara, bu işdə bizə yardımçı ol!

## :İyİrmİ səkkİzİncİ dərs

### (Namaz ruhiyyəsi axtarışında (۲

### ÖTƏN MÖVZULARA BAXIŞ

Qeyd etdik ki, namaz zahirən düzgün olmaqla yanaşı ruha da malik olmalıdır və namazın həqiqi dəyəri onun ruhundadır. Namazdan götürü-ləcək fayda onun ruhundan asılıdır. Əlbəttə ki, namaz haqqında fiqhi hökmlərə riayət etmək zəruridir. Amma ruhsuz namaz insanı yalnız cəzadan qurtara bilər. Amma bilməliyik ki, namaz vasitəsi ilə insan me`rac edib, "Allahın görüşünə" nail ola bilər. Bu ali məqama çatmaq üçün mühüm şərtlərdən biri namazda qəlbin iştirakıdır. Əlbəttə ki, namazda niyyətin .də böyük tə`siri var

Problem bundadır ki, namaz haqqında bildiklərimizi həyata keçirə bilmirik. Olsa–olsa, namazı əvvəl vaxtında qılmaqla kifayətləni-rik. Amma namazın ruhu tamam başqa şeydədir. Əgər insan namaz vaxtı dünya işləri, hətta günah haqqında düşünərsə, bu namazda ruhdan əsər-əlamət yoxdur. Unutmaq olmaz ki, namazın söz və hərəkət-.lərini ilk əvvəl qəlb yaşamalıdır

### NAMAZLAR ARASINDA FƏRQ

Namazın ruhunu dirçəltmək üçün ən tə`sirli vasitələrdən biri diqqətli olmağın faydaları barədə düşünməkdir. Əgər insan bir işin faydalı olduğuna inansa, bu işi yerinə yetirməyə çalışar. Bir daha qeyd

edək ki, söhbət bilmək yox inanmaqdan gedir. Əgər inam yoxdursa insan öz elmindən bəhrələnə bilməz. Yaxşı olar ki, insan namazdan qabaq namazın ruhu barədə düşünsün. İnsan diqqətlə qılınmış namazla diqqətsiz qılınmış namaz arasındakı fərqlərdən agah olmalıdır. Bu fərq əlli ilə yüz rəqəmələri arasındakı fərqə oxşamır. Bu fərq ölçüyə gəlmir. İnsan bu günkü namazının vəziyyətini müəyyənləş-dirib nələr .itirdiyini anlamalıdır

Təsəvvür edin ki, bir tacir müəyyən bir sərmayə ilə iki işdən birini görə bilər. Tacir bir alverdən milyon manat, digərindən milyard manat qazanc gələcəyini ehtimal verir. Əgər o birinci alveri seçsə doğru addım atmış olarmı? Əgər bu iki alverin qazancı arasındakı fərq ölçüyə gəlirsə, diqqətli namazla diqqətsiz namaz arasın-dakı fərq sonsuzdur. Bəs necə ola bilər ki, bu fərqə inanan insan namazını diqqətsiz qılsın?! Necə ola bilər ki, qıldığı namazda diqqətə görə, məsələn, həm qiymətli brilyant, həm də dəyərsiz bir şüşə parçası almaq imkanında olan insan şüşə parçasını seçə?! Namaza durmuş insan ilk əvvəl bu mövzuda düşünməlidir. Əgər insan həqiqi namazın dəyərinə inansa, namaz boyu diqqəti əldən verməz. Əlbəttə ki, bu məqsədə birdən-birə yox, tədricən nail olmaq mümkündür. Hər namazda itirdiyimizi bu gün anlamasaq da, nə zamansa peşman olacağıq. Qur`ani-kərimdə həmin gün “həsrət günü” adlandırılmışdır. “Məryəm” surə-sinin ٣٩-cu ayəsində buyurulur: “Onları həsrət günü ilə qorxud”. Demək, namazda qəlbin iştira-kına nail olmaq üçün namazdan əvvəl bir neçə .dəqiqə, namazda diqqət haqqında düşünmək faydalı-dır

## ƏN SON NAMAZ

Rəvayətlərə əsasən namazda qəlbin iştirakına nail olmaq üçün tə`sirli amillərdən biri qıldığı namazı ömrünün son namazı hesab etməkdir. Həzrət

Peyğəmbər (s) Əbu Əyyub Xalid ibn Zeyd adlı səhabəsinə belə buyurur: “Namazı elə qıl (ki, sanki son namazını qılırsan və bu sənin vida namazındır”.(١)

Əslində kimsə əmin deyil ki, qıldığı namazdan sonra ölüm onu haqlamayacaq. Hətta qıldığımız namazı sona çatdıra biləcəyimizə əmin deyilik. Əgər insan ehtimal versə ki, qısa bir müddətdən sonra Allah hüzurunda sorğuya çəkiləcək, namazı-nı tamam başqa ruhiyyə ilə qılar. Əgər ölümlə aramızdakı məsafədən xəbərsiziksə, gəlin, hər .namazımızı son namaz kimi tövbə və dua halında yerinə yetirək

Əgər insan bir neçə dəqiqə namazdan qabaq düşünsə ki, son namazını qılır namazda daha diqqətli olar. Qorxulu səfərə çıxan insan öz əzizlərindən çox çətinliklə ayrılır. O, anlayır ki, bu səfərdən qayıtmaya da bilər. Ümumiyyətlə, müharibəyə gedənlərin görüşü başqa görüşlərdən çox fərqlənir. Çünki bu görüşün sonuncu görüş olması ehtimalı var. Əcəl də gələndə kimsəyə xəbərdarlıq etmir. Demək, onu hər an gözləmək lazımdır. Allah qarşısında son dəfə səcdə etdiyini düşünən insanın, təbii ki, qəlbi döyünəcək və gözlərindən yaş axacaqdır. Müharibə zamanı təhlükəli əməliyyata gedən mö`minlərin qıldığı namaz, adətən, həqiqi namaz olur. Çünki bu namaz sonuncu .da ola bilər

## ƏN BÖYÜK VARLIQLA GÖRÜŞ

İnsanı namazda diqqətli edən digər bir amil budur ki, namaz qılan şəxs kimin qarşısında durduğunu unutmasın. İnsan namaz zamanı onun düşüncə və əməllərindən xəbərdar olan ən böyük varlığın hüzurunu hiss etməlidir. Bu hiss diqqəti, qorxunu, təvazönü gücləndirir. Allahın böyüklüyünü düşünərək “Allahu əkbər” deyən .şəxsin dünya işləri yadına düşmür



---

.Biharul-ənvar” ٧٣–cü cild“ [١۴٠] -١

Düşüncə və qəlbinə Allahın nəzarətinə inanan insan diqqətsizliyə cür`ət etmir. Əlbəttə .bu sahədə əsaslı çalışmalara ehtiyac var

İnsan inanmalıdır ki, Allah daim və hər yeri görür. Bütün varlıq aləmində ondan gizli iş yoxdur. İnsan özündə bu inamı yaratmaq üçün videokameradan istifadə edə bilər. Kamera işə salınan kimi insan öz hərəkətlərinə nəzarət etməyə başlayır. Görün, cansız !bir kameranın nəzarəti insanı nə qədər dəyişir

Namazda da bu ruhiyyəni yaratmaq lazımdır. Əgər namaz əsnasında qismən də olsa Allahın bizim üzərimizdə olan nəzərini hiss etsək halımızda dəyişiklik baş verər. Əsl namazda isə insan Allahın hüzurunu lazımı həddə və olduğu kimi hiss edir. Allahı, heç olmasa, adi bir insanca saymırıqsa namazda hansı ruhiyyədə ola bilərik? İnsan inanarsa ki, Allah onu eşidir, qəlbindən və zehnindən keçənləri bilir, hökmən, diqqətini .artırar

### "!SANKİ ONU GÖRÜRSƏN"

Rəvayətə görə Əbuzər Həzrət Peyğəmbərdən (s) ehsan haqqında soruşur. Həzrət (s) buyurur: "Ehsan odur ki, Allaha Onu görürmüş kimi ibadət edəsən. Əgər sən Onu görmürsənsə, bil ki, O, səni görür".(١) İnsan namazda müraciət halında olmalı, qiyabi də olsa, kiminləsə söhbət etdiyini təsəvvüründə canlandırmalıdır. Allahın hüzuru bütün vücudla dərk edilməlidir. "Biz yalnız Sənə ibadət edir və yalnız Səndən kömək istəyirik" deyərkən insan Allahın qarşısında durduğunu unutmamalıdır. İslam Peyğəmbəri (s) Əbuzərin nəzərinə çatdırır ki, əgər Allahı görürmüş kimi ibadət edə bilmirsənsə, heç olmasa, Onun səni gördüyünü təsəvvür et. Sözsüz ki, Həzrət Peyğəmbər (s) və



---

١- [١٤١] "Biharul-ənvar", ٧٠-ci cild.

."Mə`sum İmamlar (ə) "sanki" tə`birindən daha yüksək halda Allahı "görə bilmişlər

Bir rəvayətdə nəql olunur ki, İmam Sadiq (ə) müstəhəb namaz qılarkən bir ayəni təkrar–təkrar dedi və haldan çıxdı. Ondan soruşulanda ki, bu hala düşməyinizin səbəbi nədir, Həzrət (ə) buyurdu: "Bu ayəni o qədər təkrar etdim ki, sanki onu nazil edənin dilindən eşitdim".(۱) Əhli–beyt məktəbinin həqiqi davamçıları buna oxşar hala nail ola bilərlər. Mə`sumların yolunu davam etdirənlər arasında həmin halı yaşayanlar az .olmayıb

Əlbəttə, adi insanlar ilk addımda namaz zamanı Allahın nəzərlərini hiss etməyə çalışmalıdır-lar. İnsanın "sanki Allahı görürmüş kimi ibadət" məqamına çatması çox çətindir. Həzrət Peyğəmbər (s) Əbuzərə tövsiyəsində məhz bu incə nöqtəyə işarə edir. Ali mərtəbəyə çatmaq üçün bir çox hazırlıq mərhələlərindən keçmək lazımdır və təkcə istəməklə bu məqama çatmaq olmaz. Bu hazırlıqlardan biri namazdan bir neçə dəqiqə qabaq uyğun mövzular barədə düşünməkdir. İnsan öz nəfsinin cilovunu əlinə almaq üçün çox çalışmalıdır. Unutmaq olmaz ki, Allahın hüzurundayıq və O, bizim bütün istəklərimizdən xəbərdardır. "Bəqərə" surəsinin ۱۱۵-ci ayəsini xatırlayaq: "Hara dönsəniz üzünüz Allaha tərəfdir". Əsas məsələ qəlbimizi Allaha yönəlt-məkdir. Kiminləsə danışarkən ona arxa çevirmək olarmı? Dil Allahla danışarkən qəlbin dünyaya meyl etməsi həmsöhbətə arxa çevirmək kimidir. Bu olduqca çirkin və ədəbsiz bir işdir. Namaz zamanı Allahı unudub dünya haqqında düşünən kəs insan surətindən çıxarılmağa layiqdir. Həmsöhbətə arxa çevirmək heyvana məxsus xüsusiyyətdir. .Yalnız heyvan eşitdiyi sözlərə məhəl qoymayıb, axura boylanır



---

.Miftahul–fəlah" səh.۳۷۲" [۱۴۲] -۱

Əgər bütün deyilənlər haqqında ətraflı düşünə bilsək, dilimizlə qəlbimiz arasında .yaxınlıq yaranar. Bu işdə Allahdan yardım istəyək

## :İYİRMİ DOQQUZUNCU DƏRS

## İTAƏTKARLARIN NAMAZI

### İTAƏTKARLIQ (XÜŞU) HƏQİQİ NAMAZA APARAN YOLDUR

Qeyd etdik ki, bizim qıldığımız namaz İslam dinində tələb olunan namazdan çox fərqlənir. Qıldığımız namazların əsas nöqsanı namazda qəlbimizin iştirak

etməməsidir. Tələb olunan sözləri zikr edib, hərəkətləri yerinə yetirsək də, fikrimiz .tamam başqa yerdə olur

Namazda qəlbin iştirakına nail olmaq üçün Qur`ani–kərim ayələrindən, rəvayətlərdən və əxlaq alimlərinin buyuruqlarından faydalanmaq lazım gəlir. Bu göstərişlərdən .istifadə edənlər namaz-dakı ruhiyyələrini dəyişib, övliyalara oxşaya bilərlər

Namazın ruhunu dirçəltmək üçün Qur`ani-kərimin tə`kid etdiyi "xüşu" adlı xüsusiyyətinə yiyələnməliyik. "Mu`minun" surəsinin ١-٢-ci ayələrində buyurulur: "Doğrudan da, mö`minlər nicat tapdılar. O mö`minlər ki, namazlarını xüşu ilə qılarlar." "Bəqərə" surəsinin ۴۵-ci ayəsində oxuyuruq: "Səbr və namazdan kömək alın. Doğrudan .”da, bu iş xüşu əhli istisna olmaqla hamıya ağır gəlir

**?XÜŞU" NƏDİR"**

Xüşu" sözünü tam mə`nasında tərcümə etmək çətindir. Bu söz "özünü sındırma"," ."təvazö", bir sözlə, "itaətkarlıq" mə`nasını bildirir

Taha" surəsinin ١٠٨-ci ayəsində buyurulur: "Bütün səs-sədalar Rəhman (Allah)" qarşısında xüşu halını alar, pıçıltıdan başqa bir səs eşitməssən." Əksər tərcümələrdə bu söz "kəsilər" kimi göstərilir. Əlbəttə ki, burada daha dərin mə`na var. Qiyamət günü heybət və əzəməti zühur etmiş Allah qarşısında səslərdə ucalmaq gücü olmaz. Bir növ .səs itaətkar hala düşər

Ğaşiyə" surəsinin ٢-ci ayəsində oxuyuruq: "O gün bir çox üzlər xüşu halını alar"." Əlbəttə ki, qiyamət günü üzlər də əvvəlki halında qalmayacaq. Bə`zi tərcümələrdə ."üzlər zəlil görkəm alacaq" buyurulur

Əgər "xüşu" sözünün hansı halı ifadə etdiyini bilmək istəsək nəzərə almalıyıq ki, bu hal sün`i bir hal deyil əgər insan öz çöhrəsinə və səsinə itaətkar görkəm vermək istəsə, bu halı həqiqi xüşu hesab etmək olmaz. Həqiqi xüşu qəlbdən gəlir. Əvvəlcə qəlb itaətə ,gəlməli

sonra bu hal ə`zalarda görünməlidir. “Hədid” surəsinin ۱۶-cı ayəsini yada salaq: “İman gətirənlər üçün o an yetmədimi ki, Allahı və həqiqəti xatırlamaq-la qəlbləri xüşu halını ”?alsın

### XÜŞU EQOİZMİN ZİDDİDİR

Qəlbin sınması” nə deməkdir? Maddi olmayan qəlb necə sına bilər? Qəlb sındıqda“ ?hansı dəyişikliklər baş verir

Bu hal o zaman baş verir ki, insan böyük çətinliyə düşdüyü zaman hər yerdən əli üzülsün. Amma bu hal xüşu deyil. Xüşu insan xarakterində eqoizmin, mənəm– .mənəmliyin öldüyü andır

Hər bir insan öz daxilində özünün şəxsiyyət ruhunu hiss edir. Söhbət mə`nəvi dəyərlərə söykənmiş insani şəxsiyyətdən yox, yalnız öz mə`nafelərini qoruyan “mən”dən gedir. İslam dini insanın təkamülə çatmasında “mən” məfhumunu böyük maneə bilir. Bu elə bir hissdir ki, insanı hətta Allah qarşısında boyun əyməkdən çəkindi-rir. Bu xüsusiyyət insanı Allah və cəmiyyət qarşısında azğınlıqlara, cinayətlərə (sürükləyir. Eqoizmin son həddi ilə isə fir`onsayağı “mən Allaham” deməkdir.(۱

Bütün günahlar hansı dərəcədəsə özünəpərəs-tişdən qaynaqlanır. “Casiyə” surəsinin ۲۳-cü ayəsini xatırlayaq: “Həva-həvəsini özünə tanrı edəni gördünmü?” Nəfsini özünə tanrı edən insanın ağıl qüvvələri düzgün fəaliyyət göstərmir. Onun gözləri və qulaqları tutulur, qəlbi kor olur. Allah belə insanların azğınlığını artırır və bütün qurtuluş yolları onun üzünə bağlanır. Yuxarıda qeyd edilmiş ayədə oxuyuruq: “Onu Allahdan başqa kim hidayət edər?” Bəli, bütün korluqların kökü insanın Allahı yox, öz nəfsini tanrı bilməsindədir. Nəfsin istəklərinə tabe olan kəs heç



---

.Naziat” surəsi, ayə: ۲۴“ [۱۴۳] -۱

vəchlə Allahı görə bilməz. O, hara baxırsa özünü və istəklərini görür. Belə adamdan əməllərinin səbəbini soruşduqda cavab verir ki, könlüm belə istəyir. Allaha həqiqi mə`nada inanan insan isə anlayır ki, çarəsiz quldan başqa bir şey deyil. O, yalnız Allahın razılığı üçün danışır, susur, hərəkət edir, dayanır. İnsan öz qəlbini dinləməli və kimin istəyi ilə hərəkət etdiyini müəyyənləşdir-məlidir. Əgər qəlbimizdə başqalarına hakim olmaq, bütün nəfs istəklərinə çatmaq həvəsi tüğyan edirsə, demək, fir`onluğa doğru gedirik. Fir`on isə yalnız özünə yox, həm də başqalarına Allah olmaq iddiasında .idi

Namazın həqiqi mə`nasını anlayıb, onu qəlbin iştirakı ilə yerinə yetirənlər özünəpərəs-tlikdən, xudpəsəndlikdən uzaq olurlar. Həqiqi namaz Allaha təslim olub nəfsani istəklərindən keçməklə əldə edilir. Allahın razılığını qazanmaq üçün xüsusi ilə cavanlar çox çalışmalıdırlar. Onlar hər kiçik əməldə ilahi razılıq barədə düşünməlidirlər. Onlar əmr verməkdənsə xidmət göstərməyi üstün tutmalı-dırlar. Əgər hər bir gənc Allahın razılığına və xidmət göstərməyə çalışarsa, tədricən özünə-pərəstişdən uzaqlaşar. .İnsan heç zaman bəndəlik vəzifələrini unutmamalıdır

### ZAHİRİ VƏ HƏQİQİ XÜŞU

Özünü hələ ki ilahi buyuruqlar əsasında tərbiyələndirməmiş şəxsdə özünəpərəstiş halları mövcuddur. İnsan tədricən bu xüsusiy-yətdən yaxa qurtarmağa çalışmalıdır. Əgər bu istiqamətdə sə`y göstərilməzsə, özünəpərəstiş insanın xasiyyətində elə möhkəmlənə bilər ki, onu aradan aparmaq mümkün olmaz. “Hədid” surəsinin ۱۶-cı ayəsində oxuyuruq: “Özlərindən əvvəlki kitab verilən kimsələr kimi olmasınlar. Onlarla (öz peyğəmbərləri arasında) uzun bir müddət keçmiş və qəlbləri sərtləşmişdir”. Bəli, bə`zi insanların qəlbi Qur`an tə`birincə, “daşdan

da bərk” ola bilir. Bəni-İsrailin daş qəlbi haqqında buyurulur: “Ondan sonra sizin qəlbiniz daş kimi, hətta daşdan da bərk oldu”.(۱) Bə`zən qəlb o qədər daşlaşır ki, insan ağlamaq hissini itirir. Amma əksinə, bə`zi insanlarda özünəpərəstişin bünövrəsi və divarları çox zəif olur və kiçik bir tə`sirlə dağılır. Xüşu bu divarların uçduğu, qəlbin sındığı bir məqamda-dır. Belə insanda səsin, çöhrənin itaətkarlığı qəlbdən gəlir və təbiidir. İnsan namazını bu halda qıla bilərsə, qurtuluş yolunu tapar: “O mö`minlər nicat tapdılar ki, namazlarını xüşu ilə qılarlar”.(۲) Yalnız zahirdə müşahidə edilən .itaətkarlıq xüşu deyil. Həqiqi xüşu “mən” bütünün uçduğu an özünü biruzə verir

Allahla bağlılığı olmayanlar xüşu halında olan itaətkar mö`minə zəif şəxsiyyət kimi baxırlar. Onların fikirincə, yalnız psixoloji cəhətdən zəif olan insanlar itaətkarlıqla ağlaya bilərlər. Amma Allaha həqiqi iman gətirənlər belə hesab edirlər ki, bu halın olmaması böyük nöqsandır. Psixi cəhətdən zəif insan dünya çətinlikləri qarşısında tab .gətirmir. Mö`min isə yalnız və yalnız Allah qarşısında müt`i olur

### XÜŞUNUN MAHİYYƏTİ

Zumər” surəsinin ۲۳-cü ayəsində buyurulur: “Allah sözün ən gözəlini, bir-birinə“ bənzəyən və bir–birini açıqlayan ayələri kitab şək-lində nazil etdi. Rəbbindən qorxanların tükləri bundan biz-biz olar”. Bəli, pak fitrətə malik olanlar Qur`an ayələrinin tə`sirindən riqqətə gəlirlər. Sözsüz ki, bu ani haldır. Qəfil səs eşidən insan ixtiyarsız olaraq yerindən qalxır. Bir çox hisslər də bu sayaq qeyri-insani-ixtiyari .oyanır. Qur`ani–kərimdə buyurulur ki, ilahi ayələr imanlı insanları belə tərpədir



---

.Bəqərə” surəsi, ayə: ۷۴“ [۱۴۴] -۱

.Mu`minun” surəsi, ayə: ۱-۲“ [۱۴۵] -۲

Təsəvvür edin ki, otaqda kimsənin olmadığını güman edən şəxs otağa daxil olub paltarını dəyişir, rahatlanır. Birdən otaqdan səs eşidir. O, təbii olaraq yerindən atılıb, ani qorxu hissi keçirir. Axı o arxayın idi ki, otaqda kimsə yoxdur. Birdən otaqda kimsə görünür. İnsanın həyacanı o zaman sakitləşir ki, bu adam onun öz ailə üzvü olsun. .Burada qorxu və həyəcan tamamilə təbii haldır

Qur`ani-kərimdə buyurulur ki, fitrətən pak insanlar Qur`an ayələrini eşidərkən riqqətə gəlirlər. Amma bu ani haldır. Riqqətə gəlmiş insan qulağına dəyən səslərin Qur`an ayələri olduğunu qavrayan kimi sakitləşir, təbii halına qayıdır. Amma biganə .insanlar ilahi ayələri eşitdikdə qətiyyən həyəcanlanmır, təbii haldan çıxmırlar

Belə bir səhnə təsəvvür edin: Əskər aranı xəlvət görüb, çəkmələrini çıxarır, çəmənlikdə uzanır. Bir də onda ayılır ki, komandir başı üstə dayanıb ona baxır. Bu əskər hansı hissləri keçirir? Əlbəttə ki, o, bir anlıq özünü itirir, xəcalət çəkir, qorxur. O, həm komandirin qəzəbin-dən qorxur, həm də öz hərəkətinə görə utanır. Nəzərlərini sənə dikmiş şəxs nə qədər əzəmətli olarsa, onun hüzurundan doğan həyəcan da bir o qədər şiddətli olar. Bəli, hər bir mö`min Allah qarşısında oxşar hisslər keçirir. Hər bir insanın Allah hüzurunda keçirdiyi həyacanın səviyyəsi onun iman və mə`rifətindən .asılıdır. Haqqında danışdığımız hal xüşu halına oxşar bir haldır

Xüşu bir növ özünü itirməkdir. Bir misal çəkək: tutaq ki, bir insan elmdə doktorluq səviyyəsinə qalxmışdır. Daha doğrusu, cəmiyyətdə doktor kimi tanınmışdır. Amma qəfildən ətrafdakılara mə`lum olur ki, bu şəxsin elmi səviyyəsi həqiqətdə çox aşağıdır. Əsl elmi səviyyəsi ortaya çıxmış şəxs dərin iztirab keçirir, hətta gözlərindən yaş da gəlir. Bəli, insan təkcə qorxudan

.ağlamır. Şəxsiyyətini itirmiş insan daha dərin iztirab keçirir

Allah qarşısında sınmaqla cəmiyyət qarşısın-da sınmaq arasında bir fərq var. İnsan qarşısın-da sınmaq ağrılıdırsa, Allah qarşısında sınmaq ləzzətlidir. Allah qarşısında sınıb, göz yaşlarını axıdan insan misilsiz bir ləzzət duyur. O, daim bu halda qalmaq .istəyir. Bir an bu halı duymaq müqabilində bütün dünyanı verməyə hazır olanlar var

Əsl məqsədə - insanı me`raca yüksəldən namaza nail olmaq üçün özünü sındırmaqdan başqa yol yoxdur.(١) Allahın yardımı ilə özünü sındırmış, özünəpərəstiş kimi cılız hisslərdən qurtulmuş insan əsl məqsədə çata bilər. "Mən" bütü hökmən dağıdılmalıdır. İnsan öz xudbinlik hissini Allah qarşısında mum tək əritməlidir. İnsanın elm və biliyi, qüvvə və iste`dadı Allahın sonsuz qüdrətindən qaynaqlanır. Bu həqiqətləri anlayan insanın Allah qarşısında sınmaqla ucalması labüddür. Allah-taala !özünü aşağı tutunları ucaldır

### XÜŞUNUN ƏMƏLƏ GƏLMƏ SƏBƏBLƏRİ

Xüşu halı əldə etmək üçün ən yaxşı yol Qur`an ayələri üzərində düşünməkdir. "Məryəm" surəsi-nin ٥٨-ci ayəsində buyurulur: "...Allahın ayələri oxunduğu zaman !ağlayaraq səcdəyə düşərlər". Bəli, Qur`an ayələrində belə bir tə`sir gücü var

Qeyd etdik ki, xüşunun mərtəbələri var. Şüşə qab müxtəlif cür sına bilər: iki, üç, dörd və daha çox hissələrə parçalanar, ya da ki, ovulub çilik–çilik olar. Qəlb də belədir. İnsan elə sına bilər ki, özünü unudar. Ən ali mərtəbə isə özündə me`rac qüvvəsi daşıyan olan namaz vasitəsilə əldə edilir. Digər tərəfdən, namazın me`rac qüdrətinə malik olması üçün

xüşu başlıca şərtdir. Uyğun hala nail olmaq üçün bə`zi səh:٢١٥

---

.Mu`minun" surəsi, ayə: ١-٢" [١۴۶] -١

müqəddimələrə, hazırlıqlara ehtiyac var. Bu müqəddimələrdən biri Allahın əzəməti haqqında düşünməkdir. Öz vücudunu Allahın əzəməti ilə müqayisə edən insan istər–istəməz ilahi əzəmət qarşısında müt`i olur. Ümumiyyətlə, insan özündən elmli, güclü, iste`dadlı insan qarşısında təslim olmaq xüsusiyyətinə malikdir. Bu xüsusiyyət insanı Allah qarşısında tə`zimə gətirir. Əlbəttə ki, bu halı keçirmək üçün Allaha iman gətirib, Onu tanımaq zəruridir. Allahın əzəmətini daha dərindən dərk edən insanın xüşusu da güclü olur. Amma bu düşüncə elm öyrənməklə hasil olmur. Fəlsəfə, kəlam, irfandan Allahın əzəməti haqqında nə qədər oxusaq da, bu biliklər qəlbə bir o qədər də tə`sir etmir. Allahın əzəmətinə kifayət qədər dəlilləri olan alimdə xüşu olmaya da bilər. Elm bu işdə yalnız yardımçı rol oynayır. Bəs həqiqi xüşuya çatmaq üçün zəruri olan ?mə`rifət necə əldə olunur? Allahın əzəmətini qəlbən dərk etmək üçün nə etməliyik

## :OTUZUNCU DƏRS

### (NAMAZDA XÜŞU ƏLDƏ ETMƏYİN YOLU (۱

### "XÜŞU", "XOF", "XƏŞİYYƏT"

Xüşu"nun nə demək olduğu aydınlaşdırıldı. "Xof" və "xəşiyyət" isə "qorxu" kimi" tərcümə olunur. Qeyd edildi ki, yalnız xüşu, yə`ni müt`iliklə qılınan namaz həqiqi namazdır.(۱) Ayə və rəvayətlərdə əsasən xüşu "xof" və "xəşiyyət", yə`ni qorxu ilə .müşayiət olunur. Ona görə də qorxu haqqında bir qədər geniş danışmaq lazım gəlir

Həşr" surəsinin ۲۱-ci ayəsində buyurulur: "Əgər Qur`an bir dağa nazil edilsəydi, onun" Allah qorxusundan xüşu edib, parça–parça olduğunu görərdin". Göründüyü kimi, bu ayədə qorxu və xüşu kələmələri yanaşı işlədilmişdir. "Xəşiyyət" kəlməsinin mə`nası bir qədər genişdir. Adətən, bu söz "qorxu" kimi tərcümə olunsa da, "heybət" kimi mə`naları da ifadə edir. "Heybət" əzəmət qarşısında yaranmış bir haldır. Dəqiq vəsfə gəlməyən bu halı insan özü dərk etməlidir. Bə`zən fikrimizi belə ifadə edirik: "Filankəsin heybətindən dilim tutuldu". Əslində "heybət" həmin şəxsin xüsusiyyəti yox, .bizim keçirdiyimiz haldır

Bə`zən insan hər hansı bir şəxslə zidd gedir və sonradan anlayır ki, həmin şəxs çox əzəmətli insan imiş. Əzəmət qarşısında yaranmış heybətin ardınca xüşu, yə`ni müt`ilik, sınıqlıq gəlir. Əgər insan əmin olsa ki, göstərdiyi müxalifətçiliyə görə onu şiddətli əzab gözləyir, heybət və xüşudan sonra qorxu hissi keçirməyə başlayır. Xəşiyyət və xüşu əzab qorxusundan yaranmır. Bu hisslər əzəmətin dərkindən doğur. Zikr olunmuş ayəyə bir daha nəzər salsaq, görərik ki, xəşiyyət və xüşu əzab qorxusundan qaynaq-lanmır. Dağ



---

.Mu`minun" surəsi, ayə: ۱-۲" [۱۴۷] -۱

günah etmir ki, əzabdan da qorxa və xüşu halına gələ. Dağı xüşu halına salan yalnız və yalnız əzəmətdir. Dağ yalnız əzəmətin tə`sirindən parçalanır. Əlbəttə ki, dağın hansı yolla ilahi əzəməti dərk etməsi bizim üçün aydın deyil. İnsan düşüncəsi bə`zi məsələləri dərk etməkdə acizdir. Məsələn, "Bəqərə" surəsinin ۸۴-cü ayəsinə əsasən bə`zi daşlar Allah qorxusundan yuvarlanırlar. Daşda xəşiyyət halının yaranması insan düşüncəsi üçün qaranlıqdır. Mümkündür ki, bu ifadələr mə`cazi mə`nada işlənmişdir. "İsra" surəsinin ۴۴-cü ayəsində oxuyuruq: "Allahı təqdis edib ona həmd oxumayan bir varlıq yoxdur. Lakin siz onların təqdis və təsbihini anlamazsınız". Ayədən göründüyü kimi bütün varlıq aləmi Allaha elə bir halda sitayişdədir ki, adi hiss üzvləri bunu dərk etmir. "Nur" surəsinin ۴۱-ci ayəsində buyurulur: "Bilmirsənmi ki, göylərdə və yerdə olanlar, qanadlarını açıb duran quşlar Allaha təsbih deyirlər?! Hər biri öz dua və təsbihini bilir..." Aydın olur ki, hər bir mövcudun Allah qarşısında özünəməxsus ibadət .forması vardır

Dənizin torpağın gülün dilini

.Eşidir hal əhli, bilir hal əhli

,Deyirlər, dilimiz, gözlərimiz var

.De gəl, bunu duymaz qilü-qal əhli

.Bəli, belə bir hal mövcuddur və bütün varlıq aləmi ilahi əzəmət qarşısında təslimdir

Bir daha qeyd edək ki, xəşiyyət qorxudan fərqlənir. Bizə heç bir zərər toxundurmayacağına əmin olduğumuz əzəmət qarşısındakı özünüitirmə qorxu yox, xəşiyyətdir. Qorxu hissi o zaman yaranır ki, insan günaha yol verir və bu günah müqabilində cəzadan qorxur. Rəvayətə görə İmam Həsən (ə) dəstəmaz alarkən bədəni titrəyərdi. Həzrət Fatimə (s) namaz zamanı yarpaq tək əsərmiş. Allah-taala bu səhnələrə

işarə ilə mələklərə buyurmuşdur: “Ey mənim yaxın mələklərim! Baxın mənim xəşiyyətimdən titrəyən bədənlərimə! Şahid olun ki, onların dostlarına şəfaət verəcəyəm!”(١) Bir sözlə xəşiyyət qorxudan fərqlənir. Xəşiyyət əzabdan doğan qorxu ilə ilahi əzəmətin dərk olunmasından doğan qorxunun cəmidir. Bə`zi istisnalar da var “Rə`d” surəsinin ١٣-cü ayəsində oxuyuruq: “Şimşəklər Ona həmd edər, mələklər Onun qorxusundan təsbih deyərlər”. Nəzərə alsaq ki, mələklər günah etmir, bu qənaətə gələ .bilərik ki, günah olmayan yerdə də qorxu ola bilər

Deyilənlərdən mə`lum oldu ki, xüşunun müxtəlif səbəbləri ola bilər: ilahi əzəmətin dərki, günahlara görə duyulan xəcalət, əzab qorxusu və s. Cinayətləri açılmış və .e`dam ediləcəyinə heç bir şübhəsi olmayan insanın daxilən sınması təbiidir

### ALLAHIN BÖYÜKLÜYÜNƏ DİQQƏT

Namazda xüşu halına nail olmaq üçün Allahın əzəməti və bu əzəmət qarşısında insanın kiçikliyi barədə düşünmək lazımdır. Namaz özü məhz bu məsələyə işarə ilə başlayır. Namaza duran insan “Allahu əkbər” deməklə ilk əvvəl Allahın böyüklüyünü e`tiraf edir. Bu zikr namaz boyu, hətta namazdan sonra namazın tə`qibatında dəfələrlə təkrar olunur. İnsanı xəlq edib ona namazı vacib edən kəs hamıdan yaxşı bilir ki, insanı necə .tərbiyə etmək lazımdır

Bəli, ilahi əzəmətin dərki insanda xüşu yara-dır. Bəs belə bir dərketməyə necə nail ?olaq

### İLAHİ ƏZƏMƏTİN MƏ`NASI

Zehnimizdə bu mövzuya uyğun hansı təsəvvürlər var? “Huvəl-əliyyul-əzim” deyərkən təsəvvürümüzdə nə səh:٢١٩

---

.Biharul-ənvar”, ٢٨–ci cild“ [١٤٨] -١

canlanır. İnsan maddi varlıq olduğundan belə mə`naları çətin dərk edir. Ona görə də .öz mə`rifətimizi gücləndirməliyik

Hər halda, ilahi əzəmət haqqında təhlilə maddi məfhumlardan başlamalıyıq. Bizim nəzərimizdə böyüklük kəmiyyət göstəricisidir və o şeyi böyük hesab edirik ki, onun həcmi böyük olsun. Amma elə şeylər də var ki, cism olmasa da, onu böyük sayırıq. Məsələn, deyirik ki, filankəsin ruhu çox böyükdür. Özümüz də gözəl bilirik ki, ruh cism deyil. Amma ruhun əhəmiyyətini göstərmək üçün, başqa söz tapa bilmirik. Ona görə də Allah haqqında danışarkən də uyğun ifadələrdən istifadə edirik. Bir növ, hər varlıq aləminə "öz pəncərəsindən" baxır. Fil öz xortumunu, zürafə öz boyunu, maral öz buynuzlarını daha dəyərli keyfiyyət hesab edir. Allahın ucalığı haqqında düşünərkən insan ani olaraq səmaya nəzər salır. Çünki onun fikirincə, ucalan yalnız səmaya ucala bilər. Amma çalışmalıyıq ki, maddi keyfiyyət-lərdən daha üstün olan mə`nəvi keyfiyyətləri təsəvvürümüzdə canlandıraq. Mə`rifətimiz art-dıqca təsəvvürlərimiz maddi ünsürlərdən təmizlənməlidir. Deməki, Allah haqqında düşünər-kən ilk addımda maddi təsəvvürlərdən istifadə edib, pillə-pillə mə`nəvi təsəvvürlərə nail olmalıyıq. Allahın əzəmətini dərk etmək üçün də bu yoldan istifadə etmək olar. Əgər Həzrət Əli ?(ə) kimi Allahı qəlb gözü ilə görə bilmiriksə, bəs nə edək

## PEYĞƏMBƏR (S) İLAHİ ƏZƏMƏTİ ƏTTAR ZEYNƏBƏ NECƏ ANLADIRDI

Haqqında danışacağımız hədis "Kafi" kitabında nəql olunmuşdur. Hədisə görə Mədinə-də Zeynəb adlı bir ətir satan (əttarə) qadın var idi. Bu qadın tez–tez Peyğəmbərin (s) evinə gələr, Peyğəmbər (s) və onun arvadları Zeynəbdən ətir alardılar. Bir gün Peyğəmbər (s) otağa daxil olarkən güclü ətir qoxusu duydu. Anladı

ki, Zeynəb onlara qonaqdır. Zeynəb Həzrəti Peyğəmbəri (s) görüb salamlaşdıqdan sonra belə ərz etdi: “Ey Allahın Rəsulu bu gün ətir satmağa yox sual verməyə gəlmişəm. Allahın əzəmətini necə dərk edim?” Həzrət Peyğəmbər (s) buyurdu: “Allahın .”əzəmətini dərk etmək üçün Onun yaratdıqlarının əzəməti barədə düşün

Bəli, hədisdən göründüyü kimi İslam Peyğəmbəri (s) mə`nəvi keyfiyyətin dərki üçün maddi məfhumlardan istifadə etməyə çağırır. Zeynəb mə`rifət yolunda ilk addımlarını atır və hələ ki, qəlb gözü ilə görməkdə acizdir. Bu qadını zehnində yalnız maddi məfhumlar mövcuddur. Ona görə də bu qəbildən olan insanlar yalnız maddi məfhumlardan istifadə etməklə ilahi əzəməti təsəvvür edə bilərlər. Bə`zilərimiz hətta maddi əzəməti də lazımınca dərk edə bilmirik məsələn, bir dağın böyüklüyünü təsəvvür etmək üçün təyyarədən baxmaq lazım gəlir. Bu baxışda da nöqsan var. Çünki bir şeydən uzaqlaşdıqca həmin şey insanın nəzərində kiçilir. Ümumiyyətlə hər hansı bir şeyi həqiqi ölçüsündə görmək mümkün deyil. İnsan bir şeyi tam görmək üçün kənara .çəkilir. Kənara çəkildikdə isə ölçülər kiçilir

Hiss və xəyal yolu ilə dərketmədən sonra növbə əql yolu ilə dərketməyə çatır. Hiss və xəyala sığmayan böyük şeylər əqlin ixtiyarında qalır. Məhz bu məqamda meydan müqayisəyə verilir. Məsələn, təsəvvürə sığmayan bir şeyi bəyan etmək üçün onu təsəvvürümüzdəki məfhumla müqayisə edir və deyirik: “Filan şey filan şeydən min dəfə böyükdür”. Amma bu yol da məsələni tam həll etmir. Çünki müqayisə zamanı elə bir rəqəm alına bilər ki, bu rəqəm təsəvvürümüzə sığmaz. Demək, insan hətta maddi əzəmətləri olduğu kimi dərk edə bilmir. Bununla belə, mə`nəvi əzəmətləri dərk etmək üçün maddi məfhumlardan istifadə etməkdən başqa çıxış yolu yoxdur. Elə buna görə də İslam Peyğəmbəri (s) Zeynəbin diqqətini Allahın yaratdıqlarına yönəldir. Əgər sizdən soruşsalar ki, bir

damala su ilə okean arasında nə qədər fərq var, əlbəttə ki, dəqiq cavab verə bilməzsiniz. Amma deyə bilərsiniz ki, okean damladan çox–çox böyükdür. Həzrət Peyğəmbər (s) ilahi əzəməti Zeynəbə anlatmaq üçün belə buyurur: "Bu yer kürəsi nə qədər böyük olsa da, onu əhatə edən aləmlə müqayisə də səhraya düşmüş üzük qədər kiçikdir". Sonra Həzrət (s) belə buyurur: "Yer kürəsi onu əhatə edən aləmlə birlikdə birinci səmadan, birinci səma ikinci səmadan, bu qayda ilə altıncı səma yeddinci səmadan eyni qədər (səhrada itmiş üzük qədər) kiçikdir".

### SONSUZ BÖYÜKLÜK

Qədim dövrlərdə insanlara ilahi əzəməti elmi yolla anlatmaq çətin məsələ idi. Amma hal–hazırda astronomiyanın kainat haqqında əldə etdiyi rəqəmlərdən adi insanlar da xəbərdardır. İndi əksər insan yerin günəşdən çox–çox kiçik olduğunu bilir. Hamı bilir ki, günəşlə yer arasındakı fərq portağalla onun üzərindəki nöqtənin fərqindən daha böyükdür. Eləcə də günəş sistemi kəhkaşanla müqayisədə olduqca cılızdır. İşıq hər saniyədə ۳۰۰ min km yol gedir. Belə bir sür`ətlə işıq günəşdən yerə ۸ dəqiqəyə çatırsa, günəşlə yer arasındakı məsafənin böyüklüyünü özünüz təsəvvür edin. Amma bu fəzanın böyüklüyü kəhkəşanın böyüklüyü ilə müqayisədə sıfırı xatırladır. Astronomlar bildirirlər ki, gördüyümüz "ağ yol" kəhkəşanı mövcud sonsuz kəhkəşanlardan biridir. İki kəhkəşan arasında-kı məsafə on milyard işıq ilindən çoxdur. Yə`ni saniyədə əgər üç yüz min km sür`ətlə bir kəhkəşandan o birinə doğru hərəkət etsək on milyard il yol getməliyik. İndi özünüz təsəvvür edin ki, bizim yer kürəsi kainatla müqayisədə nə qədər kiçikdir! Bu əzəməti dərk edən insan öz cılızlığını anlayıb başını dik tutmaz. Əgər Allahın yaratdığı kainat bu qədər əzəmətlidirsə Allahın əzəməti təsəvvürə sığası deyil.

Amma bu əzəməti azca da olsa dərk etmək üçün Həzrət Peyğəmbərin (s) Zeynəbə buyurduğu kimi, varlıq aləminin əzəməti haqqında düşünməliyik. Ümid edirik ki, müəyyən mütaliələrdən sonra bu düşüncəyə nail olacağıq. Bu həqiqəti dərk edən insan Allah qarşısında xüşu halına gələcək, xəcalətdən əriyib muma dönəcəkdir. İnsan bu əzəməti dərk etməklə yanaşı, günahları və intizarında olan cəzalar barədə !fikirləşərsə, xüşu halı da güclənər

### :OTUZ BİRİNCİ DƏRS

### (NAMAZDA XÜŞU ƏLDƏ ETMƏYİN YOLU (٢

### ALLAHDAN QORXU

Namaz və namazda xüşu haqqında danışdıq. İslamda namaza çox böyük əhəmiyyət verilmişdir. Namazın azan və iqaməsində namaz ən xeyirli əməl olduğu bildirilir. Namazın müqəddiməsində on iki dəfə namaza tələsmək tapşırılır. Bütün bunlar .namazın böyük dəyərindən danışır

Amma yalnız xüşu ilə qılınmış namazlar ən xeyirli əməl ola bilər.(١) Xüşunun, yə`ni Allah qarşısında sınmağın amilləri haqqında danış-dıq. Yenə də bu mövzunu davam .etdiririk

Xüşu yaradan amillərdən biri də Allah qorxusu-dur. Ayə və rəvayətlərdən görünür ki, mö`min şəxs Allahdan qorxmalıdır.(٢) "Naziat" surəsinin ۴٠-۴١-ci ayələrində buyurulur: "Allah qarşısında durarkən qorxan və



---

.Mu`minun" surəsi, ayə: ١-٢" [١۴٩] -١

.Ali-İmran" surəsi, ayə: ١٧۵" [١۵٠] -٢

nəfsini cilovlayan kəsin yeri behiştdir". Harada təqvadan söhbət gedirsə, həmin .məqamda Allah qorxusu da xatırlanır

Bu mövzu ilə bağlı Əhli–beyt rəvayətləri daha çoxdur. Mə`sum İmamların (ə) dua və münacatla-rında daim Allah qorxusu yad edilir. Hətta İmam Səccadın (ə) bir minacatı "Minacatul–xaifin", yə`ni "Qorxanların münacatı" adlanır. Peyğəmbər (s) və imamların (ə) bütün hərəkətlərində Allah qorxusu müşahidə edilir. Hətta belə mə`lumatlar da var ki, bə`zi övliyalar Allah qorxusundan huşlarını itirirmişlər. Özü kimi insanlar qarşısında qorxudan tir–tir əsən bə`zi insanların Allah qorxusunu yersiz bilməsi əslində .e`tiqadsızlıqdan doğur

## ?ALLAHDAN NƏ ÜÇÜN QORXMALIYIQ

Allahdan qorxmaq nə deməkdir? İnsan qorxduğu mövcudu sevə bilərmi? Qorxudan ?qılınan namazdan necə ləzzət almaq olar

Qeyd etdik ki, ayə və rəvayətlər Allah qorxusunu müsbət hal kimi tanıtdırırlar. Amma bu məsələyə şübhə ilə yanaşanlar da var. Bə`ziləri iddia edirlər ki, Allah mərhəmətlidir və Ondan qorxmağa dəyməz. Əslində isə Allahdan qorxan öz əməllərinə görə qorxmalıdır. Allah–təalanın varlıq aləmində hökm sürən qanunlarına görə günah cəza ilə nəticələnir. Qiyamət günü insan Allahın yox, öz günahlarının cəzasına çatır. Təsəvvür edin ki, bir şəxs öz bağına çəkdiyi dəmir hasara cərəyan buraxıb və xəbərdarlıq işarəsi qoyub. Əgər bir kəs xəbərdarlığa məhəl qoymayıb, hasara .toxunaraq ölərsə bu hadisənin səbəbkarı bağ sahibi deyil

Bu qorxu insanda xüşu halı yaradır və onu müxtəlif günahlardan çəkindirir. Amma qəlbində Allah qorxusu olmayanlar min bir cinayətə əl ataraq, nəhayətdə cəhənnəm əzabına düçar olurlar. Demək, Allah qorxusu səh:۲۲۴

.insan üçün çox faydalıdır və hər bir insan özündə bu halı yaratmağa çalışmalıdır

### ALLAH QORXUSUNUN DƏRƏCƏLƏRİ

Allah qorxusunun dərəcəsi insanın iman mərtəbəsindən asılıdır. Adi insanlarla övliya-ların qorxusu arasında çox fərq var. Övliyalar üçün dünya təhlükələri heç bir qorxu törətmir. "Yunis" surəsinin ۶۲–ci ayəsində oxuyuruq: "Bilin ki, Allahın dostları üçün heç bir qorxu yoxdur və onlar kədərlənməzlər". Övliyalar zalım rəhbərdən, qaçaq .quldurdan və digər dünyəvi təhlükələrdən yox, yalnız və yalnız Allahdan qorxarlar

Əhli–beytdən (ə) nəql olunmuş dualara nəzər salsaq faydalı qorxunu tanıya bilərik. "Kumeyl" duasında Həzrət Əli (ə) Allaha müraciətlə belə ərz edir: "Tutaq ki, əzabına səbr edə bildim, bəs səndən uzaqlığa necə dözəcəyəm?!" Bu kəlamdan aydın olur ki, övliyaların qorxusu biz düşündüyü-müz qorxu deyil. Onlar Allahın əzabını bizdən çox dərk etsələr də, bu əzabdan yox, Allahın narazılığından qorxurlar. Gəlin e`tiraf edək ki, bu hissləri anlamaq bir o qədər də asan deyil. Deyilənləri anlamaq üçün məhəbbət bağlılığına nəzər salaq. Aşiqin ən böyük ehtiyacı mə`şuqun diqqətini cəlb edib ona qovuşmaqdır. Vüsalın ziddi fəraqdır. Aşiq öz mə`şuqunun fəraqından nalə çəkir. Allahın fərağından nalə çəkənlər də var. Əgər ilahi eşqi dərk etmiriksə, bunun səbəbi mə`rifətimizin azlığıdır. İlahi eşqdə də vüsal var. Əgər Həzrət Əli (ə) şirin vüsalı dadmasaydı, acı fəraqdan qorxmazdı. Vüsalın şirinliyi məhəbbətin mərtəbəsindən asılıdır. Övliyaların duyduğu ləzzət misilsizdir və bu halla tanış olmaq üçün münacatları mütaliə etmək lazımdır. Bu mütaliələrdən sonra mə`sum İmamların (ə) ilahi .məhəbbətinə heyran qalmamaq olmur

Hər halda, ilahi məhəbbəti dadanlar üçün ikinci ləzzətli şey yoxdur. İmam Səccad (ə) “Minacatul–muhibbin” duasında Allaha belə müraciət edir: “Pərvərdigara Sənin məhəbbətinin şirinliyini dadan Səndən üz döndərərmi?!” Bu şirinliyi dadanlar üçün ən böyük qorxu vüsaldan məhrum olmaqdır. Bəli, Allah qorxusunun belə bir mərtəbəsi .var

## ALLAHIN NƏZƏRİNDƏN MƏHRUMLUQ QORXUSU

Qorxunun digər bir dərəcəsi axirət ne`mətlərindən məhrum olmaq qorxusudur. İlahi ne`mətlər isə iki qismdir: maddi ne`mətlər və mə`nəvi ne`mətlər. Kamil mə`rifət sahibləri üçün mə`nəvi ne`mətlər hər şeydən üstündür və onlar bu ne`mətləri itirməkdən qorxurlar. Qur`an ayələrin-dən mə`lum olur ki, ən böyük cəza mə`nəvi cəzadır: “Allahla bağladıqları əhdləri ucuz qiymətə satan şəxslər üçün axirətdə heç bir pay yoxdur. Allah qiyamət günü onları dindirməz, onlara baxmaz...”(١) Bəli, bə`zilərinin insanlıq şəxsiyyəti o qədər alçalar ki, Allahın nəzərindən məhrum olarlar. Məhəbbət haqqında təsəvvürü olanlar gözəl anlayırlar ki, məhbubun baxışından məhrum olmaq necə böyük dərddir. Körpə üçün ən böyük narahatlıq ananın nəzərindən məhrum olmaqdır. Mə`rifət əhli üçünsə ən böyük əzab Allahın onlardan üz döndərməsidir. Körpəsindən incimiş ana ondan üz çevirdikdə uşaq ananın ətəyindən yapışır, özünü çox narahat hiss edir. Allah kafirlərə və günahkarlara bu sayaq biganəlik göstərir. Ona görə də bir çox imanlı insanlar Allahın nəzərindən məhrum olmaqdan qorxurlar. Avam .insanlar isə elə başa düşürlər ki, Allah onları sevir və onlardan razıdır



---

.Ali–İmran” surəsi, ayə: ٧٧“ [١۵١] -١

Mə`rifət əhli üçün ən dəyərli ne`mət Allahın diqqətidir. Onlar öz “ya Allah” çağırışlarına Allahdan cavab gözləyir və bə`zən də buna nail olurlar. Mə`sum İmamların (ə) münacatlarında Allahdan cavab eşitmək arzusu önəmli yer tutur. “Biharul-ənvar”ın ۹۰-cı cildində belə bir münacat bəyan olunur: “Pərvərdigara! Səni çağırdığım zaman səsimi eşit, dua edərkən məndən üz çevirmə!” “Bəqərə” surəsinin ۱۱۵-ci ayə-sini xatırlayaq: “Üzünüzü hara tutsanız, Allaha tərəfsiniz”. Deməк, Allahın insandan üz çevirməsi daha dərin mə`naya malikdir. Əgər Allah hər şeyi eşidəndirsə, necə ola bilər ki, kiminsə .çağırışını eşitməsin? Demək, “nəzər salmaq”, “eşitmək” tamam başqa mə`nadadır

İnsan bə`zən belə sözlər işlədir: “Filankəs, mənə baxmırsan”, “filankəs məni eşitmədi”. Bu cümlələr sözün həqiqi mə`nasında işlədilməmiş-dir. Əgər bir rəhbər haqqında deyilərsə ki, “bu rəhbər xalqını eşitmir” və ya “bu rəhbər xalqına baxmır”, aydın məsələdir ki, söhbət adi eşitmək-dən, baxmaqdan getmir. Sadəcə, qulaqla eşitmək, gözlə baxmaq ayrı, məhəbbət və mərhəmətlə baxıb-eşitməksə ayrıdır. Mə`sum .İmamlar (ə) Allahdan mərhəmət dolu baxış və sevgi dolu dinləmə arzulamışlar

Demək, e’tinasız münasibət mö`minlərdə qorxu yaradır. Onlar bu münasibəti .cəhənnəm əzabından da ağır bilirlər

,Cəhənnəm odunda yanmağa nə var

!Dərd odur qəhr etsin sevgili nigar

### GÜNAH QORXUSU

Adi insanlar, adətən, günahlarına görə qorxurlar. Təbii ki, hər bir günah xoşagəlməz sonluqla nəticələnə bilər. Əgər insan günahla-rından qorxmaqla Allaha yaxınlaşa

bilirsə, bu müsbət bir haldır. Təəssüf ki, mə`rifət və imanı zəif insan nə qədər günah etsə də narahat olmur. Qur`ani–kərimdə yüzlərlə ayə cəhənnəm əzabından danışır. Göstərilir ki, bu əzabın çox böyük və dözülməz olması qeyd olunur. Oxuduğumuz bu ayələr bizə tə`sir edirmi? Bir şəxs bu ayələri gözəl səslə oxuduğu zaman deyilən sözlərdən xoflanmaq əvəzinə, səsin gözəlliyindən ləzzət alırıq. Hansı ki, cəhənnəm .ayələrini eşidən insan divanəlik həddinə çatmalıdır

Günahın cəzasından əlavə onun çirkinliyinə, Allaha qarşı qiyam olmasına diqqət yetirmək lazımdır. Necə ola bilər ki, Allahın verdiyi ne`mətlər müqabilində Ona ?təşəkkür etmək əvəzində günaha yol verək

Allah-təala buyurur ki, mənim göstərişlərimdən çıxan insan özünün və mənim düşmənimi şad edər. Amma biz bilə-bilə Allahın düşmənini sevindiririk. Allahla müxalifət etmək şeytana itaət deməkdir. “Yusuf” surəsinin ۵-ci ayəsində oxuyuruq: “Həqiqətən şeytan insanın açıq–aşkar düşmənidir”. Yaxın dostunun düşməni ilə əməkdaşlıq etmək dosta xəyanət etmək deyilmi?! Halbuki, Allah insanı xəlq etmiş, onu bolluca ne`mətlərlə faydalandırmış və onun aqibətini də Özü tə`yin edəcəkdir. Allahı !?özünə bir dost saymayan insanı imanlı hesab etmək olarmı

Hər bir günah şeytana itaətdir. Allah insanı bəlalardan qurtarmaq üçün ona yol göstərir. İnsan isə Allahın məhəbbətini rədd edib, onun düşməni qarşısında əyilir. Necə də çirkin hərəkət! Əslində bircə dəfə günah edən insan Allahın mərhəmətindən məhrum edilməlidir. Allahın haqqı var ki, bir dəfə naməhrəmə baxan gözü kor etsin. .Çünki bu göz günah yox, savab üçün xəlq edilmişdir

İmam Səccad (ə) belə dua edir: “Pərvərdigara əgər kirpiklərim tökülənədək ağlasam da, xəcalətdən daim səh:۲۲۸

başıaşağı qalsam da bir günahı belə yuya bilmərəm”.(١) Mə`sum İmam (ə) belə .narahat olduğu halda, biz günahkarlar rahatca oturmuşuq

Əgər yaxşılıq etdiyiniz adam sizə qarşı çıxsa ona yenədə yaxşılıq edərsinizmi? Sözsüz ki, qəzəblənib, həmin şəxsdən üz döndərərsiniz. Bəs nə üçün insan Allahı qəzəbləndirməkdən qorxmur? Mə`sumlar isə Allaha belə yalvarır: “Pərvər-digara Səni qəzəbləndirməkdən qorxur, Sənə sığınıram”. İnsan yol verdiyi günahların mahiyyətini anlaya bilsə qorxudan tir–tir əsər. O, etdiyi günahların müqabilində qucaq açmış .əzablardan xəbərdar olsa, mum tək əriyər

Qarşısında günah etdiyin şəxs nə qədər böyükdürsə, günahın çirkinliyi və cəzası da bir o qədər böyükdür. İslam dinində istənilən bir günahı kiçik saymaq böyük günahdır. .Günahı kiçik saymaq Allahı saymamaqdır

Bütün deyilənlərin yaxşıca götür–qoy edən insan Allah qarşısında xaşe, müt`i olur. İnsanı çirkin işlərdən uzaqlaşdıran da məhz xüşulu namazdır. Rəvayətlərdə buyurulur ki, Allah qorxusundan ağlayan gözə əzab yoxdur. Demək, Allah qorxusu insanın xoşbəxtliyində mühüm əhəmiyyət kəsb edir. Allah qarşısında qorxu, müt`ilik, göz yaşı zəiflik, eqoizm üzərində çalınmış qələbə-dir. Zəiflik insanın özü kimi insan qarşısında .əyilməsidir. Allah qarşısında əyilənlərsə insan qarşısında əyilməz

Allaha əyilməyi, Allahdan qorxmağı qəbahət sayanlar isə, çox güman ki, Allaha e`tiqadsız olanlardır. Həzrət Əli (ə) kimi əzəmətli bir şəxsiyyət görün necə sızıldayır: “Aman azuqənin azlığı və səfərin uzaqlığından”. Əgər mə`sum İmam (ə) narahatdırsa, biz günahkarlar necə narahat ola bilərik?! Gəlin, çox incəliklər anlamadığımızı e`tiraf .edib, anlamağa çalışaq



---

.Səhifeyi–səccadiyyə”, ١۶-cı dua“ [١۵٢]-١

Bəli, namazda xüşulu olmaq üçün günahlarımı-zın nəticəsi barədə düşünməliyik. Bu işdə imamların (ə) dualarından istifadə etmək faydalıdır. Əgər günahlar barədə düşünməyə vərdiş versək çox çətinliklər aradan qalxar. Bu xüsusiyyətə malik olanlar .namaza durduqda, məsci-də qədəm qoyduqda halları dəyişir

!Pərvərdigara Əhli-beyt (ə) dərslərindən fayda-lanmaqda bizə kömək ol

## :OTUZ İKİNCİ DƏRS

### (NAMAZDA XÜŞU ƏLDƏ ETMƏYİN YOLU (٣

### ÖTƏN MÖVZULARA BİR BAXIŞ

Namazda qəlbin iştirakı, xüşu haqqında danışdıq. İnsanın nicat tapmasından ötrü mühüm şərt olan xüşu insan qəlbində Allaha qarşı yaranmış müt`i olma halıdır. Bu hal Allahın sifətlərinə diqqətyetirmə və bu barədə təfəkkür nəticəsində yaranır. Əlbəttə ki, Allaha qarşı insanların mə`rifət dərəcələri müxtəlif-dir. Buna görə də insanlarda olan məhəbbət və diqqət də fərqlidir. Mə`rifəti çox olanın məhəbbəti də böyükdür. Lakin günahkar insanların qəlbi dünya istəkləri ilə dolduğundan onlar ilahi mə`rifətdən məhrum olarlar. Qur`an belə insanların qəlbini daşa bənzədir.(١) Belələrinə moizə və .nəsihətin heç bir tə`siri yoxdur

Namazda xüşu əldə etmək olmaq üçün qəlbi yumşaltmaq yolları mövcuddur. Əvvəla, insan Allahın əzəmətinə və öz kiçikliyinə diqqət yetirməlidir. İkincisi, Allahın paklığı qarşısında insan öz çirkin işlərindən xəcalət çəkməlidir. Üçüncüsü, insan unutmamalıdır ki, o, öz yaradanı, ona ne`mət verən varlıq qarşısında günah edir. Təşəkkür əvəzində günah etmək rəvadırmı? Öz Rəbbinin düşmənini sevindirmək ?xəyanət deyilmi

### XÜŞUNUN DÖRDÜNCÜ AMİLİ

Dördüncü tə`sirli amil Allahın "camal sifətlərinə" diqqət yetirməkdir. Bu eşq və məhəbbət yoludur. Allahın camal sifətləri haqqında düşünən insan Onun qarşısında itaətkarlığı özünə borc bilir. İnsan anlayır ki, yalnız Allah həqiqi məhəbbətə layiqdir və Ona yaxınlaşmaq üçün sə`y göstərir. İlahi məhəbbəti qazanmaq Allahın camal sifətlərini dərk etmədən mümkün deyil. Bu məhəbbəti dadan insan vüsala can atır və namaza öz məhbubu ilə görüş kimi baxır. Bu



---

١- [١٥٣] "Bəqərə" surəsi, ayə: ٧۴.

görüşə həvəs Allaha məhəbbətin dərəcəsindən asılıdır. Məhəbbət isə öz növbəsində camal sifətlərini tanıma dərəcəsindən asılıdır. İnsan namazda öz məhbubunu zahir .gözü ilə görməsə də, bütün vücudunu eşq alovu bürüyür

Məhəbbət və onun mə`rifətdən asılılığı çox geniş mövzudur. Biz bir neçə nöqtəyə .toxunmaqla kifayətlənirik

## MƏHƏBBƏTLƏ XÜŞUNUN ƏLAQƏSİ

Məhbubundan uzaq düşmüş insan daim nigarandır. Bu nigarançılıq o zaman zirvə həddinə çatır ki, məhbubunu görə bilməyən insan bu məhbubun onu gördüyünü hiss edir. Buna oxşar halla "Nüdbə" duasında rastlaşa bilərik. Orada İmam Zamana (ə) müraciətlə belə deyilir: "Hamını görüb, Səni görə bilməməyim mənə çətin gəlir". İmam Zaman (ə) elə məhbubdur ki, aşiqləri onu görə bilməsə də, o Həzrət (ə) öz aşiqlərini daim görür və eşidir. Bütün həftəni dünya işlərinə məşğul olub, yalnız cümə günü səhər çağı "Nüdbə" duası ilə İmam Zamana (ə) müraciət edən kəs öz həmsöhbətinə qarşı böyük sevgi duyur. "Ərəfə" duasında Həzrət Hüseyn (ə) öz Allahına belə ərz edir: "!"Kor olsun o gözlər ki, Səni qarşısında görmür

İnsanın namazda Allaha diqqət yetirmək olmaq imkanı var. İnsan ən üstün, ən gözəl .dost qarşısında durduğunu unutmamalıdır

Biz İmam Zamanı (ə) nə üçün sevirik? Cavab sadədir: çünki Həzrət (ə) əsl bəndə, əsl kamil insandır. İstər İmam Zaman (ə), istərsə də digər övliyalar, hər biri Allahın müqəddəs zatının camalından bir cilvədir. Onların hər biri o qədər sevimlidir ki, insan bir an görüş üçün canını belə fəda etməyə hazırdır. Əgər övliyalar bu qədər sevimlidirlərsə, görün onların yaradanı necə olar?! Əgər övliyaların məhəbbəti insanı bir belə

!?təlatümə gətirirsə, görün yaradanın məhəbbətində hansı tə`sirlər var

Əvvəlcə, Allahı yaxşı tanıyıb, Ona münasibət-də mə`rifətimizi artırmalıyıq. Allahı daha yax-şı tanıdıqca Ona olan məhəbbət də güclənəsidir. Qəlbində ilahi məhəbbət möhkəmlənmiş insan Onunla görüşə can atır. Belə mö`minlər namaza durduqda ?qəlbləri xaşe, müt`i olur. Bəs bu halı necə əldə edək

## İLAHİ MƏHƏBBƏTƏ NAİL OLMAQ YOLU

Allah-taala adi insanlara ilahi məhəbbətin yolunu özü göstərir. "Hədisi-qüdsi"də Allah Həzrət Musaya (ə) belə buyurur: "Ya Musa, Məni yaratdıqlarıma sevdir, yaratdıqlarımı Mənə məhbub et". Musa (ə) soruşur ki, pərvərdigara bu işi necə görüm? Allaha təala ."buyurur: "Məni sevmələri onlara olan ne`mətlərini onlara xatırlat

İnsanda belə bir fitri xüsusiyyət var ki, ona yaxşılıq edənə qəlbində sevgi yaranar. Əgər insan Allahın etdiyi yaxşılıqları dərk etsə, Onu sevməyə bilməz. İlahi ne`mətlər gözləri qarşısında cərgələnən insanın qəlbində öz Rəbbinə qarşı mütləq məhəbbət .oyanacaqdır

## NE`MƏTLƏR AĞUŞUNDA QƏFLƏT

İlahi məhəbbətə aparan ən sadə yol göstərildi. Sözsüz ki, övliyaların getdiyi yol daha incə və daha mürəkkəbdir. Adi insanlar üçünsə ən sadə yol Allahın ne`mətlərini .tanıyıb, bu ne`mətlər haqqında düşünməkdir

Allah-taala öz bəndələrini saysız-hesabsız ne`mətlər içində qərq etmişdir. Çox olur ki, çətinliyə düşmüş insan üçün bütün qapılar üzünə bağlandığı vaxt qəfildən Allahın lütfü nazil olur və çətinlik ağıla gəlməyən bir yolla aradan qalxır. Bu zaman insan ixtiyarsız olaraq

Allah qarşısında xəcalət çəkir və pıçıldayır: “Pərvərdigara, axı mən bu yaxşılığa layiq .”deyildim

Müt`ilik, xüşu təkcə əzab qorxusundan yaranmır. Bə`zən bu hal şövqdən də qaynaqlana bilər. “Maidə” surəsinin ۸۳-cü ayəsində buyurulur: “(Bə`zi nəsranilər) Peyğəmbərə nazil olanı eşitdik-ləri zaman haqqı tanıdıqları üçün onların gözlərinin .”dolduğunu görərsən

Gözlənilməyən ne`mət insanın qəlbini riqqətə gətirir, onda şövq yaradır. İnsan sonralar da bu lütfü xatırladıqda eyni şövqü duyur. Hər dəfə belə lütflər xatırlandıqda .Allaha məhəbbət daha da artır. Hətta bu duyğu xasiyyətə də çevrilə bilər

İlahi ne`mətlər təkcə gözümüz qarşısında olan ne`mətlərlə məhdudlaşmır. Varlıq aləmi bütövlükdə bir ne`mətdir. İmam Hüseyn (ə) ərəfə günü günəşin yandırıcı istisi altında durub, gözlərindən yağış yağırmış kimi ağlayar və bu əziyyətli şəraitdə Allahın ne`mətlərini sadalayardı: “Hansı ne`mətlərini sayım, hansı ne`mətlərini xatırlayım? Hansı ne`mətinə görə təşəkkür edim? Bu ne`mətlər saya biləcəyimizdən daha çoxdur. Ey mənim mə`budum, şahidəm həqiqi imanımla, gözümün nuruyla, alnımın qırışları ilə, dövr etməkdə olan qanımla, burnumun yuxa pərləri ilə, qulağımın pərdələri ilə, toxunan dodaqlarımla, dilimin söz yaradan hərəkətləri ilə...” İmam Hüseyn (ə) yandırıcı günəş şüaları altında hələ də sadalayır! Bütün bu ne`mətlər bizə əta olunmasaydı çətinlik çəkməzdikmi?! Gəlin, mə`nəvi ne`mətləri də unutmayaq. İmam Səccad (ə) belə dua edir: “Pərvərdigara, Sənin zikrin, Səni çağırmaq üçün verdiyin icazə ən böyük ne`mətlərindəndir”. Bəli, öz kiçik vücudumuzla əzəmətli Allah qarşısında dayanıb, söz deyə biliriksə, bu özü böyük ne`mətdir. Əlbəttə ki, Allah qarşısında hamının danışmaq ləyaqəti yoxdur. Allah-taala yalnız öz lütfü ilə bu işə .icazə vermişdir

Aşiqindən çox–çox üstün olan mə`şuqu nəzərinizdə canlandırın. Əgər onlar arasındakı fərq sultanla qul arasındakı fərq qədər olarsa aşiq mə`şuqun görüşünə həsrət qalacaqdır. Miskinlik içində ümidi üzülmüş aşiqi mə`şuq qəfildən görüşə çağırsa, aşiq sevincindən ağlayar. Diqqət edin! Əzəmətli Allah öz ləyaqətsiz bəndəsini görüşə—namaza çağırır! Bəli, bütün günahlarımıza baxmayaraq, Allah bizə mərhəmət göstərir.

## MƏ`NƏVİ NE`MƏTLƏRİN MADDİ NE`MƏTLƏRDƏN ÜSTÜNLÜYÜ

İnsan Allaha olan məhəbbətini artırmaq üçün Onun verdiyi ne`mətlər barədə düşünməlidir. Çoxları darda olduğu zaman Allahın gözlənilməz yardımından faydalanmışlar. Bu yardımlarla bərabər, hər birinin öz yeri olan digər ne`mətləri də unutmaq olmaz. Bədənin hər bir üzvü insan üçün böyük ne`mətdir. Biz bunu yalnız xəstələndiyimiz zaman anlayırıq.

Maddi ne`mətlərlə yanaşı mə`nəvi ne`mətləri də xatırlamalıyıq. Məsələn, qonaq getdiyimiz evdə xoş münasibət gözəl zövqlə bəzədilmiş süfrədən daha qiymətlidir. Mə`rifətli insanlar üçün mə`nəvi ne`mətlər maddi ne`mətlərdə qat–qat üstündür. Allaha yaxın insanlar mə`nəvi ne`mət-lərdən daha çox ləzzət alırlar.

Bəli, Allah-taala öz bəndələrinə mehribandır və onlarla mərhəmətlə rəftar edir. O, öz bəndələrinə peyğəmbərlər vasitəsi ilə hətta Allahla necə danışmağı da öyrədir. Namazda xəyalımız kənara uçarkən bu xəyalı geri qaytaran da Odur.

Qəflətdən qurtulub, Allaha qarşı diqqətli olmaq üçün müxtəlif yollar var. Amma bütün bu yollar mə`rifətə, həqiqətin kəşfinə aparır. Namazda müt`i olmaq istəyiriksə, yenə də ilahi mə`rifətdən faydalanmalıyıq.

Pərvərdigara, sonsuz lütfünə sığınıb, bizi qəflətdən oyatmağını istəyirik! Qəlbimizi özünə qarşı müt`i

!buyur! Namazlarımızı “Sənə xüşu ilə ibadət edənlərin namazlarından qərar ver! Amin

## QƏRBDƏ İQTİSADİ İNKİŞAFIN SƏBƏBİ

Dini iqtisadi inkişafa əngəl bilənlərin nəzərinə digər bir mühüm nöqtəni çatdırmaq lazım gəlir. Bir çox qərb alimləri Avropanın XVI-XVII əsrlərindən başlayaraq iqtisadi dir-çəlişinin səbəbini protestanlıq əxlaqından görürlər. Protestanlıq üç məsihi məzhəbindən biridir. Bünövrəsi XVI əsrdə qoyulmuş bu məzhəb öz ardıcıllarını pərhizkarlığa və dünyaya bağlanmamağa çağırır. Məşhur alman alimi Maks Veber «Protestant əxlaqı və kapitalizm ruhu» kitabında iddia edir ki, qərb cəmiyyətindəki iqtisadi inkişaf protestanlıq məzhəbindən doğmuşdur. O, yalnız protestant məzhəbli Avropa ölkələrinin əsaslı inkişafını öz müddəasına sübut gətirir. Onun nəzərincə, insanları dünyapərəstlik və israfçılıqdan çəkindirən bu məzhəb həqiqi inkişaf üçün şərait yaratmışdır. Bu məzhəbin ardıcılları qənaətcil olur və kapital toplamağa çalışırlar. Bu kiçik kapitallar, hansısa mərhələdə, bankların və böyük müəssisələrin .yaranmasına səbəb olur

Biz Maks Veberin dedikləri ilə tam şərik olmasaq da, onun haqqında danışmaqla nəzərinizə çatdırmaq istəyirik ki, hətta dini e’tiqadı olmayanlar da qənaəti iqtisadi inkişaf üçün amil bilirlər. Deməк, qənaət etməyi bacaran millətlə-rin iqtisadi qüdrətə çatmasında təəccüblü bir şey yoxdur. Digər bir tərəfdən, fikri-zikri dünya ləzzətləri dalınca qaçmaq olan insanlar öz israfçılıqları ilə bütün cəmiyyət üçün problem yaradırlar. Əyyaşların tə’birincə, «yaxşı kef etmək üçün» böyük pullara ehtiyac var. Böyük pullar isə, adətən, oğurluq, rüşvət, sələmçilik, bir sözlə, cinayət yolu ilə ələ gəlir. Varlı bir əyyaş il ərzində ölkənin milli gəlirinə bərabər pulu eyş-işrətə xərcləməkdən ,çəkinmir. Əgər qərbin inkişafla paralel əxlaqi inkişaf olsaydı

məsələn, SPİD və qorxulu zöhrəvi xəstəliklər həmin ölkələri bürüməzdi. Demək, əxlaqsızlığa və onun acı nəticələrinə külli miqdarda pul xərcləyən iqtisadiyyatın əxlaq .və qənaətlə heç bir əlaqəsi ola bilməz

Dini göstərişlərə əməl edən insanları dünya və axirət səadəti gözləyir. Pərhizkarlığı, qənaə-ti, zöhdü, təqvanı tənbəllik kimi başa düşmək olmaz. İnsanları kamillik zirvəsinə səsləyən bir din heç vəchlə tənbəlliyə səs verə bilməz. İslam tənbəlliyə deyil, pərhizkarlığa, qənaətə, Allaha təvəkkül etməyə çağırır. Bir-birinə zidd bu iki məsələni qatışdırmaq insanların nöqsanıdır. Bizim nöqsanlı qavrayışımız səbəbində inkişa-fa .çağıran də’vətlər geriliyə çağırış kimi yozulub

İslamın şüarı budur: «Allah kafirlərə əsla mö’minlərin əleyhinə olan bir yol qərar verməmişdir»(۱). Bu göstəriş hazırkı dövrdə elm və sənət sahələrində qüvvədədir. «Munafiqun» surəsinin ۸-ci ayəsində buyurulur: «İzzət, Allaha, Onun rəsuluna və .«mö’minlərə məxsusdur

Bu gün iqtisadi cəhətdən geri qalmış müsəlmanları izzətli hesab etmək olarmı? Yuxarıdakı iki ayədən belə nəticə çıxarmaq olar ki, müsəlmanlar gecə-gündüz çalışıb kafirlərə möhtac olmadan qurtardıqdan sonra izzətə çata bilərlər. Əgər bir şəxs bu iki ayəni həyata keçirmək üçün elm və iqtisadiyyatda bir addım irəli atarsa, bu iş həmin şəxs üçün ibadət sayılar. «Biharül-ənvar» kitabında belə bir rəvayət nəql olunur: «İbadət ondur onun doqquzu halal ruzi qazanmaqdır». İnsanları bu cür tə’limlərə çağıran dini tənbəlliyə çağırışda ittiham etmək olarmı? İslam, ailəsinin ehtiyaclarını ödəmək üçün zəhmət çəkib, tər tökən insanı alqışlayır. Əngəl dində yox, bizim qavrayışımızda və tərzi-təfəkkürümüzdədir. İslamı düzgün analayıb, onun göstərişlərinə əməl edən .insanı yalnız səadət gözləyir



---

.Nisa» surəsi, ayə: ۱۴۱» [۱۵۴] -۱

**MÜNDƏRİCAT**

## Haqqında mərkəzi

Allahın adı ilə

Rəhman və Rəhimli olan Allahın adı ilə.Və bütün həmdlər aləmlərin rəbbi olan Allaha .məxsusdur

.Varlıq aləminin Kövsəri olan Həzrəti Fatiməyi Zəhraya (a) təqdim olunur

(Bilən kimsələrlə (alimlər) bilməyənlər (cahillər) eynidirlərmi? (Zümər surəsi, ayə ۹

:Ön söz

İsfahan Qaimiyyə kompüter araşdırmalar müəssisəsi ۲۰۰۶-cı ildən Mərhum Ayətullah Seyyid Həsən Fəqih İmaminin nəzarəti altında,elmi mərkəzlərdə tanınan görkəmli tələbələrin vasitəsi ilə məzhəb,mədəniyyət və elmi sahələrdə öz fəaliyyətinə .başlamışdır

:Məramnamə

İsfahan Qaimiyyə kompüter araşdırmalar müəssisəsi təhqiqatçıların dini biliklərə rahət və tez bir zamanda yiyələnmələri üçün hər bir xidməti onların ixtiyarında qərar vermişdir.Və bu sahədə təəssübkeşlikdən,ictimai,siyasi,fərdi cəryanlardan uzaq duraraq yalnız və yalnız elmi sahədə ixlasla öz xidmətini həyata keçirməkdədir.Bu səbəbdən adı çəkilən müəssisə layihəsini həyata keçirmiş.Və tədqiqat üçün nəzərdə tutulmuş kitabları,məqalələri mütəxəssislər və müxtəlif təbəqələrdən olan insanlar üçün,bir neçə dillərdə və formalarda hazırlayaraq,heç bir məbləğ tələb etmədən sosial .medyada istifadəçilərin ixtiyarında qoymuşdur

:Hədəflər

Quran və Əhli beyt mədəniyyətini və maarifini yaymaq.۱

İnsanları,xüsusən gəncləri tam dəqiq şəkildə dini məsələləri araşdırmağa.۲ sövqləndirmək

Telefon,tablet və kompüterlərdə olan faydasız,yararsız mövzuların yerini .۳ faydalı,mənəviyyatlı mövzularla doldurmaq

.Təhqiqatla məşğul olan tələbələrə xidmət etmək.۴

.Kitab və elmi əsərlər oxumaq mədəniyyətini yaymaq.۵

.Müəlliflərin öz elmi əsərlərini digital formada yaymaq üçün onlara şərait yaratmaq.۶

:İcraçılıq

.Qanunla icazəli olan lisenziyaya malik əsərlərin yayımı.۱

.Bu mərkəz kimi xidmət göstərən oxşar mərkəzlərlə əlaqə.۲

.(Paralel xidmətlərdən çəkinmək (başqalarının etdiklərini təkrarlamamaq.۳

.Yalnız və yalnız elmi məsələləri yaymaq.۴

.Nəşriyyatın mənbələrini qeyd etmək.۵

.Qeyd:Kitabda olanlara görə məsüliyyət o kitabı yazan müəllifin öhdəsindədir

:Müəssisənin fəaliyyəti

.Kitabların çapı və nəşri.۱

.Kitab oxumaq müsabiqələrinin təşkili.۲

.Məcazi sərgilərin istehsalı.۳

.Kompüter oyunlarının istehsalı.۴

Qaimiyyə internet saytının yaradılması:www.ghaemiyeh.com.۵

.Sərgi məhsullarının və moizələrin istehsalı.۶

.Şər'i,əxlaqi və etiqadi suallara cavab.۷

.Mühasibat,mətbuat yaratmaq və sms... sistemlərinin layihəsi.۸

.Təlim kurslarının həyata keçirilməsi.۹

Tərbiyəçi şəxslər hazırlamaq üçün təlim kurslarının təşkili.۱۰

Kompüterdə,tabletdə və telefonlarda icrası mümkün olan minlərlə proqramların.۱۱ dünyada məşhur olan səkkiz formada istehsalı

JAVA.۱

ANDROID.۲

EPUB.۳

CHM.۴

PDF.۵

HTML.۶

CHM.۷

GHB.۸

.v.Qaimiyyə kitab bazarı adına dörd market

ANDROID.۱

IOS.۲

WINDOWS PHONE.۳

WINDOWS.۴

deyilənlər müəssisənin veb saytında Fars,Ərəb,İngilis və Azərbaycan dillərində pulsuz

.istifadəyə verilmişdir

:Sonunda

Mərcəi təqlid müctəhidlərin dəftərxanalarından (ofis),müəssisələrdən,nəşriyyatçılardan,müəlliflərdən və əməyi olan bütün şəxsiyyətlərdən bizlərə hədəfə çatmaqdan ötrü yardım etdikləri üçün səmimi qəlbdən .təşəkkür edirik

:Mərkəzin ünvanı

İsfahan-Əbdurrəzzaq küçəsi-Hacı Muhəmməd Cəfər adına bazar-Şəhid Muhəmməd Həsən Təvəkküli küçəsi-blok۱۲۹/۳۴-birinci mərtəbə

veb sayt:www.ghbook.ir

mail:Info@ghbook.ir

mərkəzin ofis telefonu: ۰۰۹۸۳۱۳۴۴۹۰۱۲۵

Tehran ofisi: ۰۰۹۸۲۱۸۸۳۱۸۷۲۲

Biznes və alqı satqı: ۰۰۹۸۹۱۳۲۰۰۰۱۰۹

Mərkəzdə çalışan insanlarla əlaqə yaratmaq üçün nəzərdə tutulan nömrə: ۰۰۹۸۹۱۳۲۰۰۰۱۰۹